**AZƏRBAYCAN RESPUBLİKASI ELM VƏ TƏHSİL NAZİRLİYİ**
**AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ**
**ŞƏKİ FİLİALI**

---

VAQİF ASLAN

# EY BU QOCA DÜNYANIN QOSQOCAMAN KİŞ KƏNDİ!

*Şeirlər*

BAKI – 2022

**Redaktorlar:**

**Cavanşir Feyziyev**
*AYB üzvü, publisist, tərcüməçi, millət vəkili*

**Xəyal Rza**
*AYB Mətbuat Xidməti katibi*

**Murad Nəbibəyov**
*Nasir, publisist, "Qızıl Qələm"*
*media mükafatı laureatı*

**Vaqif Aslan. Ey bu qoca dünyanın qosqocaman Kiş kəndi!**
*(Şeirlər).* – Bakı: Mütərcim, 2022. – 552 səh.

*Bu kitaba Vaqif Aslanın, əsasən, 2010-2015-ci illərdən sonrakı yaradıcılığını əks etdirən şeirləri və böyük Səməd Vurğunun "Vaqif" pyesinin motivləri əsasında qələmə aldığı eyni adlı faciə daxil edilmişdir.*

*Vaqif Aslanın bir ömürlük yazışmaları, məktublaşmaları, deyişmələri və söyləşmələri də burada öz yerini tutur.*



A $\frac{4702060000}{026}$ 165-22

**Yaşar Qarayevin mənə hədiyyə edərkən**
**“Tarix: yaxından və uzaqdan” kitabına yazdığı dərkənar:**




**Şəki, 12 dekabr 1996-cı il**

***Şeirdə türk Vaqiflərin ən gəncinə və axıra qalmışına,***
***şirinə və aslanına Vaqif Aslana, etibarda,***
***sədaqətdə vaqiflərə və aslanlara şikar olan***
***“Xəstə Vidadi” ehtiramı və məhəbbəti ilə.***
***Yaşar Q.***



*Dr. Prof. VAQİF YUSİFLİ*

# VAQİF ASLAN, NƏ İSTƏRSƏN?

"Bu dünya ağ varaq imiş Yazıldıqca söz yeri var" – bu misralar Vaqif Aslanındır. Müasir poeziyamızda onun da özünəməxsus fərdi üslubu, deyim tərzi var və Şəkidə yaşamasına baxmayaraq şeirləri ilə yaşadığı regionun sərhədlərini aşa bilib. "Bu dünyanın ağ vərəqinə" o da öz şair adını həkk etmək istəyir.

Vaqif Aslanın şeirlərinin özünəməxsus "xəritəsi" var. Bu xəritə müxtəlif rənglərlə işarələnmiş hissləri, duyğuları əhatə edir. Hər şeydən yazır Vaqif Aslan, şair üçün mövzu məhdudluğu olmamalıdır, deyə düşünür. Bir daş üstündəki qədim yazı, bir qılınc qəbzəsi, gecənin qaranlığı, səhərin dan yeri, bir qom bənövşə, solğun payız yarpağı, bir dost itkisi, şirin bir yuxu, çörək ətri, ana laylası, torpaq qoxusu Hələ Vətən tarixinin şanlı və qanlı səhifələri, Babək, Nizami, Nəsimi, Füzuli, Cavad xan, Üzeyir, 20 yanvar şəhidləri, Aydın Məmmədov – vətən aşiqləri. Leyli, Məcnun, Əsli, Kərəm, bulaq başında səhəngi çiynində bir gözəl – sevda aşiqləri. Mərd adamların təbəssüm dolu baxışları, ilqarına sədaqətli insanlar, yaşmaqlı, həyalı gəlinlər, müdrik ağsaqqallarla ağzı dualı nənələr. Və bir də Şəki Xan sarayı kimi qədimlər, ulular, Dədə Qorqud dünyası. Və bir də sırf Şəki əhlinə məxsus yumor. Buna əks olan qütblər-xəyanətlər, ikiüzlülük, riyakarlıq, yaltaqlıq, yalançı dil bazarçıları.

Vaqif Aslan hələ Xarici Dillər İnstitutunda tələbə olanda şair Allahverdi Tağızadə onun şeirlərini başçılıq elədiyi ədəbiyyat dərnəyində dinləmiş, bu şeirlər haqqında "Bilik" qəzetində yazmışdı ki: "Vaqifin şeirləri hərarətlidir. Bu şeirlərdə bəzən hisslər pərişanlığı, bəzən dəlisov bir məhəbbət, bəzən də ürək dolusu bir bədii siqlət duyulmaqdadır".

Ancaq ilk kitabı çapdan çıxanda qırx üç yaşı vardı. Nədən gec gəldi ədəbiyyata? Hərçənd ədəbiyyata gəlişi ilk kitabla təyin edirlər, halbuki, Vaqif Aslanın 2009-cu ildə çap olunan "Seçilmiş əsərləri"nin birinci cildində onun 70-ci illərdə yazdığı şeirləri də öz əksini tapır.

Vaqif Aslanın 1993-cü ildə çap olunan ilk kitabının adı "Aydın" idi. Sənədli, sırf publisistik səciyyəli bu əsər-poema (əslində, mənzum xronika) unudulmaz dilçi-tənqidçi, böyük Azərbaycan ziyalısı, həyatının sonu faciəli qəza ilə bitən millət vəkili Aydın Məmmədova həsr olunmuşdu. Aydın Məmmədovu mən də yaxşı tanıyırdım, tənqidçilik fəaliyyətimiz eyni illərdə başlamışdı və açığını deyim ki, onun dərin zəkası, heyrətamiz istedadının pərəstişkarlarından biri də mən idim. Onun Milli Məclisdəki çıxışları, iqtidar və müxalifət arasında barışdırıcılıq missiyası yaratmaq səyi... Hamısını xatırlaya bilərik. Aydın Məmmədov Şəkinin Kiş kəndindən idi, məzarı da ordadır. Hərdən Kiş çayının aşıb-daşmasından, bağları, tarlaları, yolları sellərə qərq etməsindən xəbər gəlir və onda Aydını xatırlayıram. O, müəyyən səbəblərə görə elm aləmindən, ədəbi prosesdən ayrı düşmüşdü. Sonra birdən gəldi, sanki Kiş çayı kimi yerinə-yatağına sığmadı. Amma qəzavü-qədərdənmi, taleyin amansız oyunundanmı yox oldu, getdi. Kiş çayının qarşısı alındığı kimi Aydın da susdu.

Vaqif Aslanın Aydına həsr etdiyi bu poema haqqında böyük tənqidçimiz Yaşar Qarayev, şair İsa İsmayılzadə mətbuatda xoş sözlər söylədilər. Amma açığını etiraf etmək lazımdır ki, Vaqif Aslan bir şair kimi sırf şeir kitabları ilə tanındı. Çünki "Aydın" poeması Yaşar Qarayevin təbirincə desək, nə qədər "təsirli bədii lövhələrlə" qələmə alınsa da, sənədli-publisistik bir əsər idi. Publisistikanın lirikanı üstələdiyi məqamlar üstünlük təşkil edəndə bədiilik meyarına da xələl gətirir.

Qarşıdakı illərdə isə Vaqif Aslanın bir-birini yarışa çağıran və onun əsl şairlik potensialını üzə çıxaran şeirləri ilə qarşılaşdıq. Uşaqlıq və gənclik illərinin sevgi dolu anları, təbiətin koloritli, bədii təsvir vasitələri ilə cilalanmış gözəl mənzərələri, həyatın sevinc-

li-kədərli səhnələri, tarixi keçmişimizə müraciət bircə-bircə şeirlərinin mövzusuna çevrildi. Zahirən poetik ləfzində, yəni danışıq, nitq ədasında heç bir qeyri-adilik nəzərə çarpmırdı, ona doğma olan hecanın "sahillərində" aram-aram gəzişirdi, sərbəstdə də gücünü sınayırdı. Amma şeirlərinin əksəriyyətində aydın bir xətt nəzərə çarpırdı, bu da fikrin şeirdə misra-misra, bənd-bənd, pillə-pillə irəliləyişi idi. Bütün şeir həmin fikrin bədii təcəssümünə xidmət edirdi. Sonda müəyyən bir obraz yaranırdı. Məsələn, "Qılınc" şeiri.

*Sən ulu babamın yadigarısan,*
*Səbrin illər yorub, əsrlər yorub.*
*Nənəmin sehirli nağıllarısan,*
*Adın cinlər qovub, tilsimlər qırıb.*

*Bir namərd əlini qoydu döşünə,*
*Min namərd düşmənə əydi başını.*
*Sıxıldı babamın dişi dişinə,*
*Saxlaya bilmədi o, göz yaşını.*

*Sənə iki damla göz yaşı düşdü,*
*Düz iki yerindən oyuldun, qılınc.*
*İki qatlananlar qabağa keçdi,*
*Sən də öz qınına qoyuldun, qılınc.*

Şeirdə qüvvət və igidlik rəmzi olan qılıncın taleyindən (zəfəri və süqutu) söz açılır. Qabilin məşhur "Səhv düşəndə yerimiz" şeirindəki misra yada düşür: "Qılınc qında pas atıb, qında korşalıb". Odur ki, şeirin son bəndində qında pas atan qılıncın bir gün şimşək kimi parlamasına ümid doğur:

*Matəm paltarındır bu gün, soyun, çıx!*
*Sinəmin qanıyla silim pasını.*
*Göynəyən əlimlə bir zərbə çalım,*
*Doğra, tök Vətənin qəm libasını!*

Ümumiyyətlə, Vaqif Aslanın şeir və poemalarında tarixi olaylara tez-tez müraciət olunur. Amma tarix-tarixi hadisələr-tarixi şəxsiyyətlər onun şeir və poemalarında bir məqsədə xidmət edir, o da tarix və müasirlik bağlılığını, keçmiş və bu gün arasında milli-mənəvi körpünü nəzərə çarpdırmaqdır. Onun "Ruhlarla söhbət" adlı böyük həcmli bir poeması var. Poemada türkün qədim və müasir tarixi vərəqlənir, tariximizin həm acı, həm də şanlı səhifələri üzərində düşüncələr təqdim edilir. Poemada bu gün bizim üçün maraqlı olan nədir sualını versək, bu sualın yalnız bir cavabı olar: müasirliyin, çağdaşlığın problemləri tarixi təcrübənin işığında dərk olunur, tarixi yaddaş itməməlidir, tarix təkcə olmuş, bitmiş hadisələrin qaynağı deyil, həm də bu gün və gələcək üçün ibrət dərsləridir.

*Gecə-gündüz qaçırıq.*
*Yurd qaçır, biz qaçırıq.*
*Yenə də çatammırıq.*
*Getdi gedən yerimiz.*
*Ölüb-itən yerimiz.*
*İtib-bitən yerimiz.*
*Göydən asılı qaldıq.*
*Qəbri qazılı qaldıq*
*Haray, Vətən yerimiz.*

Bu şeir 90-cı illərin şeiridir. Böyük itkilərdən, Vətən yaralarından danışır. Dövrün dəyişən ab-havası, cəmiyyətdə baş verən xaos və hərc-mərclik, insanların içində baş verən mənəvi dəyişmələr onun bir çox şeirlərində öz əksini tapır. Mühitdə baş verən anti-milli proseslər onun "Kişilər" şeirində bariz nəzərə çarpır. Keçmişin kişiləri ilə bugunun kişiləri arasında az qala zəmin-asiman bir fərqin yaranması gözdən qaçmır. "Köhnə kişilər" düzlük, haqq, ədalət meyarı idilər. Bəs indi?

*Getdi özünüzlə zorunuz sizin,*
*Dolar gözümüzə qorunuz sizin.*
*Çatdam-çatdam olsun gorunuz sizin,*

*Daşımız qalmadı daşımız üstə,*
*Ay yurdu-yuvası talan kişilər!*
*Olunca dünyada olmasa, yeymiş,*
*Qalınca dünyada qalmasa yeymiş.*
*Sizin yerinizdə qalan kişilər!*
*İndiki kişilər – yalan kişilər!*

Vaqif Aslanın ən yaxşı şeirlərindən biri "Şəhid köynəyi"dir. Doxsanıncı illərdə cəmiyyətdəki mənəvi aşınmalar, məmləkətdə hər şeyin az qala möhtəkir psixologiyasına tabe olması, bazar hakimiyyəti hamımızda hiddət doğururdu. Budur, müəllifin qəhrəmanı bir bazar mənzərəsini seyr edir. Burda hər şey satılmaqdadır. Bircə şəhid köynəyi qalıb.

*Kəfən deyil –*
*Qandan baha, candan baha*
*köynəkdi bu!*
*Şivən deyil –*
*göz dağıdı, lal fəryadlı*
*göynəkdi bu.*

Vaqif Aslan şeirlərində hərdən özünün də portretini yaratmağa can atır və ironik tərzdə olsa da, özünün timsalında çox həmkarlarının taleyini, ömür yolunu ümumiləşdirir.

*Üstünə xətt düşüb qaralanıbsa,*
*Soyuq baxışlardan yaralanıbsa,*
*Sınıb, oşalanıb, paralanıbsa,*
*Nəyinə gərəkdir bu Vaqif Aslan?*

*Qanadı qırılan quş kimidirsə,*
*Bahar da gözündə qış kimidirsə,*
*Yanaqda quruyan yaş kimidirsə,*
*Bir ayrı ünvana tuş kimidirsə,*
*Nəyinə gərəkdir bu Vaqif Aslan?*

Vaqif Aslanın çoxlu sevgi şeirləri var və deyim ki, bu şeirlərdəki hisslər, duyğular yaşanılan hisslər, duyğulardır. Yalan ha deyil. Amma təbii ki, bu günün sevgi şeirini yazmaq bəlkə də azadlıq haqqında, təbiətin gözəllikləri haqqında, hətta ana haqqında yazmaqdan çox çətindir. Ölçü, meyar o deyil ki, gərək Füzuli kimi yazasan, Ələsgər kimi yazasan, bizim XX əsr şairlərindən Əli Kərim kimi, Bəxtiyar Vahabzadə kimi, Nüsrət Kəsəmənli kimi yazasan. Yox, hər şairin öz sevgi dünyası var. Bu baxımdan Vaqif Aslanın o çoxlu sevgi şeirləri içərisində yaxşı nümunələr az deyil. Onlardan yalnız birini misal gətirəcəyəm və mənim fikrimcə, bu şeir Vaqif Aslanın ən gözəl sevgi şeiridir. Şeirdə parlaq, necə deyərlər, "göz qamaşdıran" obrazlı ifadələr, orijinal metaforalar, təşbehlər yoxdur, amma bu şeir o qədər səmimidir ki

*Günəşim, dözmədim istinə bəzən,*
*Amma səni gəzdim üşüyən kimi.*
*Gördüm duman gəlir üstünə bəzən,*
*Qalxana çevirdim məhəbbətimi.*

*Ayım, mənim Ayım, doğan kimi sən*
*Salavat çevirdim səni görüncə.*
*Ay mənim ulduzum, xoşbəxtəm ki, mən*
*Göy ulduz görməyib sənintək incə.*

*Bu yaz səninkidir, çiçəyim, gülüm,*
*Keçir mən dəlini yaz köynəyindən.*
*Ölüm, ayağının altında ölüm,*
*Qurtarım biryolluq can göynəyindən.*

*Ay mənim alnımın yazısı, dinlə,*
*Tanrı qələmiylə nəqş edib səni.*
*Hansı dünya olsa, xoşdur səninlə,*
*Hara istəyirsən, al, apar məni.*

Vaqif Aslan haqqında bu yazıda mən onu tənqid də edə bilərdim. Yazardım ki, ithaf şeirlərinin içərisində yararsızları var. Yazardım ki, bəzi şeirlərində adi danışıq tonuna enməsin. Yazmadım, sadəcə dedim. Amma demədim ki, Vaqif Aslanın şeir dili safdı, təmizdi. Hətta mənə zəif görünən şeirlərində ədəbi dilin qanunları pozulmur, folklordan, xalq dilindən gələn ifadələr də şeirlərinə bir şirinlik gətirir. Yazmadım, sadəcə dedim. Vəssalam, şüttamam!

*"Ədalət" qəzeti. 8 oktyabr 2016-cı il*

***Bu yazıdan 6 il sonra – 30 avqust 2021-ci ildə Şuşada görüşdük.***



*Soldan: İsmayıl İmanzadə, Akif Cabbarov, Məhərrəm Qasımlı,*
*Vaqif Yusifli, Tehran Əlişanoğlu, Barat Vüsal, Vaqif Aslan.*
*Şuşa, 30 avqust 2020-ci il*

## Kiş kəndi

Ey bu qoca dünyanın qosqocaman Kiş kəndi!
Halal duz, halal çörək, zəhmət kəndi, iş kəndi!

Marxalın, Xan yaylağın, Atuçan yaylağın var.
Qaynar, Damarçın kimi çayın var, çaylağın var.

Qurcanan qurucanlı... Yağdımı? – Həyəcanlı...
Böyükçay sakit, ağır, daşdımı? – Gözü qanlı...

Döşəyin gül-çiçəkdir, yastığın dağ döşləri...
Yaradana bəllidir bu dünyanın işləri.

Çalmuğun, Süddü axın, Qocakəmin var sənin.
Öz yaşın, öz tarixin, öz aləmin var sənin.

Sakhunlar da səndədir, Sığnaq da, Pir qaya da.
Əlin çatır günə də, ulduza da, Aya da.

Sənindir Qızıl bərə, Laskının talası da.
Bu Gələrsən-Görərsən – bu Qızlar qalası da.

Ərşpirim Baba səndə, Cumay Ocağı səndə.
Qızın gözəli səndə, oğlun qoçağı səndə.

Dirilik çeşməsidir Baydar bulaq, Həmzələr.
Cilvələnir sularda axıb gedən qəmzələr.

Mənim məbədli kəndim, ocaqlı, pirli kəndim.
Daşıyla, qayasıyla sehirli, sirli kəndim!

Məhəllən var Doxuntək, Cour, Maflar, Gavantək.
Başının üstündə göy çil-çıraqlı tavantək.

Tayirlər, Dərə məhlə, Salayşağı, Yanıxlar ...
Bəlgəsi, nişanıyla, yanığısıyla tanıqlar.

Bədələr, Tatarşağı, Doduşağı, Duluzlar...
Var olsun bu nəsillər, var olsun bu uluslar!

Hekayətdir ayrıca Vələmmədlər, Layişlər...
Sayıb sadalamaqla qurtarmaz ki, bu işlər...

Ey bu qoca dünyanın qosqocaman Kiş kəndi!
Səni necə sevməsin Vaqif Aslan əfəndi?!

*01 yanvar 2019-cu il*

## Səndə şair olmamaq da günahdır

Qanqalını gözüm üstə qoyaram,
Zərrən üçün gözlərimi oyaram.
Nəfəsini min illikdən duyaram,
Eşqin ilə arzum budaq-budaqdır.
Səndə şair olmamaq da günahdır.

Xoş yazına, sərt qışına vuruldum,
Çiskininə, yağışına vuruldum,
Çınqılına, sal daşına vuruldum
Adın mənim yollarıma çıraqdır,
Səndə şair olmamaqda günahdır.

Bu dünyada qərənfil çox, lalə çox,
Amma sənin lalən kimi lalə yox.
Bulağının naləsi tək nalə yox,
Bulaqların nə nəğməkar bulaqdır,
Səndə şair olmamaq da günahdır.

Uşaqlığım belə döydü, ey yuvam,
Sevda məni yaman əydi, ey yuvam.
Cana gəldim, ətrin dəydi, ey yuvam,
Torpaq ki, var övladına dayaqdır,
Səndə şair olmamaqda günahdır



Şair sənsən, şeir deyən dilin – mən,
Sərkərdəsən, qılınc vuran əlin – mən.
Gözəl sənsən, sevgilin – mən, dəlin – mən,
Bilmirsənmi oğlun Kərəmsayaqdır?
Səndə şair olmamaq da günahdır

Dərdlərimin dərmanıdır yaylağın,
Kolun-kosun, daşın-qumun, çaylağın.
Mən ölmərəm, sinəm üstə torpağın
Gül açacaq zaman-zaman, bu – haqqdır,
Səndə şair olmamaq da günahdır.

*2 noyabr 1981-ci il*



## Etiraf

Mənə qədər sevdilər, sevdilərsə nə qədər,
Mən səni sevəcəyəm, sevəcəyəm o qədər.
İnan, hər saat, hər gün
Səni sevdiyim üçün
Mənə qədər deyilən şirin sözlərdən şirin
sözlər də tapacağam.
Torpağınla, suyunla özümü qarışdırıb,
yoğurub yapacağam.
Məndən sonra sevənlər sevsələr də nə qədər
Mən onların yadına düşəcəyəm o qədər.

*29 iyul 2015-ci il*

## Dünyam

Ey səhəri işıqlı, axşamı nurlu dünyam!
Mənim yar-yaraşıqlı, mənim qürurlu dünyam!
Qədəmləri mübarək, yolu uğurlu dünyam!
Sənin də gözün aydın! Mənim də gözüm aydın!
Mən şair olmaz idim, axı, sən olmasaydın!

Ey xanım qiz, xanım qız! Ürəyim qız, canım qız!
Ey hissim, həyəcanım! Ey qaynayan qanım qız!

Sən odsan, sən alovsan! Yandır məni, yanım, qız!
Yel vursun dörd tərəfdən, közərsin közüm aydın!
Mən şair olmaz idim, axı, sən olmasaydın!

Ey ata göy, ana yer! Yanınızda üzüm ağ!
Ey geniş çöl, uca dağ! Nolar çevril, mənə bax!
Ey yağış, yağdıqca yağ! Ey şimşək, çaxdıqca çax!
Parla – sön, sön – parla ki, görünüm özüm aydın!
Mən şair olmaz idim, axı, sən olmasaydın!

Ey açan gül, açan gül! Açıb ətir saçan gül!
Sevilmək həvəsiylə soyuqluqdan qaçan gül.
Deməræm soruşmasan, xoşbəxt olur haçan gül.
Bu yerdə fikrim qəti, bu yerdə sözüm aydın.
Mən şair olmaz idim, axı, sən olmasaydın!

*25 iyun 2016-cı il*

## Dünya, səndə yaşadım

Allaha çox şükür ki, gəldim, üzünü gördüm.
Əyrin əyri yerində, gördüm, düzünü gördüm.
Mən özüm kimisindən gündə yüzünü gördüm.
Dünya, səndə yaşadım.
Mən də, mən də yaşadım.

Soyuğundan titrədim, istindən tərlədim də.
Baxıb qohum-qonşuya səni çəpərlədim də.
Sevincimdən bayıldım, dərdindən çərlədim də.
Dünya, səndə yaşadım.
Mən də, mən də yaşadım.

Mən özümü özümdə axtardım, soraqladım.
Tapanda şadlıq etdim, itirəndə ağladım.

Mən səni fəsil-fəsil oxudum, varaqladım.
Dünya, səndə yaşadım.
Mən də, mən də yaşadım.

Var olmuşam varından.
Bar tutmuşam barından.
Ətir çəkdim gülündən, ləzzət aldım qarından.
Dönmədim, dönmərəm də sənə etibarımdan
Dünya, səndə yaşadım.
Mən də, mən də yaşadım.

*19 iyun 2017-ci il*



*Kiş kəndinin Xan yaylağından görünüşü*

## Torpağın ətri

Bu mənim kəndimdir, könül, dayan, dur!
Burda yarpaqların ətrini duyum!
Küsüb bənövşəsi, boynunu burur,
Gəl onu oxşayım, göz üstə qoyum!

Zirvəni qartallı, dağı dumanlı,
Göyləri hönkürən, ahlı, amanlı,
Çayları köpürən görməsəm, olmur!
Şehli lalələri dərməsəm, olmur!

Ora günbatandır, bura gündoğan...
Burda bulaqlar da həzin ötüşər.
Qonşu qız, ay mənə yad kimi baxan,
Asta get, səhəngin əlindən düşər!

Burda babalar var – dərindən-dərin,
Burda nənələr var – həzindən-həzin.
Burda gözəllər var – pərdəsi-ismət,
Varlığı sadəlik, sevgi, məhəbbət.
Burda oğullar var – ellərə dayaq,
Koroğlusayaq.

Bu mənim kəndimdir!
Könül, dayan, dur!
Çəkim ciyərimə yarpaq ətrini.
Vallah, min cənnətə dəyişdirmərəm
Bu sadə torpağın torpaq ətrini.

*May, 1972-ci il*

## Kiş çayı

Bir vaxt kənd adamları
sahilində bağ salıb,
ağaclar da əkdilər.
Səndən arx da çəkdilər
dirriklərindən ötrü.
Günlyü, güzəranı,
birliklərindən ötrü.

Sənsə daşdıqca daşdın...
Kiş çayı!
Coşdun, həddini aşdın...
Kiş çayı!

Bərələri, bəndləri
bir həmlədə qopardın.
Qarşına çıxanları
qamarlayıb apardın.

Sən ki, böyük çay idin.
Sakit axanda həyat,
daşanda ah-vay idin...

Səni bəndə saldılar
Hovrunu da aldılar

Çıxmadı cınqır səsin.
Tanrı bərkə düşməyi
kimsəyə göstərməsin!

*15 may 2016-cı il*



*Kiş cayı daşıb-daşıb sakitləşəndən bir neçə gün sonra*

## Sular

Sular kim deyir ki, eyni cür axır?..
Su var-damcı-damcı, su var-gur axır.
Su yerin başına dolanıb gəlir,
Gözlər görməsin ki, bulanıb gəlir.

*21 dekabr 2012-ci il*

## Torpaq

Qorxuram torpağa ayaq basmağa...
Kiminsə başını tapdaya billəm...
Başının daşını tapdaya billəm...
Gözünü, qaşını tapdaya billəm...
Uzaq, məndən uzaq elə günahlar!
Birmidir, beşmidir belə günahlar?

Mən özüm kiməm ki? – Bir ovuc torpaq.
O özü böyüdür, bəsləyir məni.
Qönçə dodağıyla pıçıldayaraq
Gəl deyə qoynuna səsləyir məni.

Mənim torpaq bacım, torpaq qardaşım!
Torpaqdır qanımız, canımız bizim.
Torpaqdan göyərən güllər, çiçəklər
Min-min arzusudur ürəyimizin.

Qorxuram torpağa ayaq basmağa...
Məni sadəlövhlər uşaq sanmasın.
Torpağın üstündə elə gəzək ki,
Arzular, ümidlər tapdalanmasın.

*14 dekabr 2015-ci il*



*Kiş məbədi*



*Kiş məscidi*

## Anam torpaq

Anam torpaq, mən oğlunam,yaxşı bax,
Dayanmışam qabağında baş əyib.
Qucdum səni, sinəm yandı, sinəm, ax!
Öpdüm səni, dodağıma köz dəyib.

Anam torpaq, tale – şıltaq, tale – kür,
Öz bəxtini sınaqlardan keçirdin.
Axşam aydan, gündüz gündən əmib nur,
Yeddi arxa dönənimə içirdin.

İnanmağa ayın, günün bəsdilər,
Külliyən küp elədilər, ay sonam.
Qıyma-qıyma doğradılar, kəsdilər
Əqidəni, inamını, ay anam.

Üzü dönmüş səmum yelitək
Əsib keçdi başı üstən obamın.

Heçə döndük, puça döndük, ay ürək,
Goru necə çatlamasın babamın?

Güc hərlətdi o dəyirman daşını,
Zaman bizi un olunca üyütdü.
Axıtdıqca gözümüzün yaşını,
Bayatılar qəlbimizi ovutdu.

Ağzımıza zəhər əzdi yağılar...
Dinəmmədik, deyəmmədik bu dərdi.
İçimizdə kök atdıqca ağrılar,
Məbədinin daş sinəsi göyərdi.

Kərpic olub divarına hörüldük,
Hörüldükcə kaman kimi sızladıq.
Yad əliylə yad ellərə sürüldük,
Sürüldükcə, Vətən, deyib bozladıq.

Anam torpaq, mən oğlunam, yaxşı bax,
Dayanmışam qabağında baş əyib.
Qucdum səni, sinəm yandı, sinəm, ax!
Öpdüm səni, dodağıma köz dəyib.

*21dekabr 1981-ci il*

## Saxsi qırığı üstə yazı

Mən bir kasa idim, bütöv bir kasa,
Yadın qılıncıyla paralanmışam.
Bir xalqa ad idim, bir yurda imza,
Zamanın hökmüylə qaralanmışam.

Toy ilə, yas ilə dolu yolların,
Düşüb kənarına palçığa batdım.

Üstündən keçəndə ulu yolların
Düşmən ayağını dəlib qanatdım.

Yağı təpik vurdu kəsik başıma,
Hayıma hay verən olmadı, neynim?
Yağdı zaman-zaman toz yaddaşıma,
Çox şey xatirimdə qalmadı, neynim?

Yaşadım mən odu sönmüş bu qəmlə,
Dərd üstə kökləndi kamanım, sazım.
Qurumuş mürəkəb, sınıq qələmlə,
Qırılmış qol ilə yazılıb yazım.

Mən qolça qopuzun qırıq simiyəm,
Toxunma, sızlaram... quruyar qanın.
O taylı, bu taylı Vətən kimiyəm,
Məni sinənə sıx, isinsin canım.

Bir qırıq saxsıya döndüm,ey insan!
Döyüş meydanında xeyirlə şərin.
Dünyada hər şeydən şirindir, inan,
Şirindir bütöblük, bütövlük – şirin!

*7 avqust 1982-ci il*

## Qalalar

Qəfil zərbə kürəyinə işləyib...
Qəfil zərbə ölümdən də yamanmış.
Acığından dodağını dişləyib,
Kürəyini dağa verib dayanmış
Cərgə-cərgə, sıra-sıra qalalar.

Yumruq kimi düyünlənib o vaxtdan,
Yağıların başı üstə asılmış.
Qıymakeşlə qıyma-qıyma doğranan
İgidlərin qanı ilə yazılmış
Sətir-sətir, misra-misra qalalar.

Sükutundan tük ürpəşər, donar qan,
Min illərdir zəhmi çöküb hər yana.
Yuxu bilməz, diclik bilməz heç zaman,
Keşik çəkər ulu Azərbaycana!
Əsrləri yora-yora qalalar,
Daş köynəyi para-para qalalar!

*7 noyabr 1990-cı il*

## Baxış

Dünyaya zirvədən baxmışam bu gün,
Çiynimi göylərə söykəyib həmən.
Bir məhək daşıymış həyat, ömür-gün,
Bir yaqut qaş imiş dünya büsbütün...
Niyə indiyədək görməmişəm mən?

Dünyaya zirvədən baxmışam bu gün...
Dağ dağa,daş daşa söykənib durub.
Ağaclar baş-başa söykənib durub.
Dolaylar keçmişəm bu hikmət üçün,
Buludlar başımda qılınc sındırıb.

Dünyaya zirvədən baxmışam bu gün...
Dünya sərhəd-sərhəd, çəpər-çəpərmiş!
Azadlıq, genişlik hər şeydən üstün!
Zirvədə yorğunluq çıxarmış bütün!
Ürək gah gülərmiş, gah sökülərmiş...

*10 avqust 1975-ci il*

## Bu dağın o üzü

Bu dağın o üzü sənin,
bu üzü mənim.
O üzün o düzü sənin,
bu üzün bu düzü mənim.
O üzün o düzündə
Qoşa xalı üzündə
Ceyran var.
Bu üzün bu düzündə
O Ceyrana heyran var...

*03 avqust 2015-ci il*



*Xan yaylağında. Dağ var dağdan yuxarı*

## Dağ yolu

Səndə dəyişməyib bir çınqıl belə,
Qaya da, qəcir də, daş da – yerində.
Mənim uşaqlığım yaşayır hələ,
Sənin tava daşlı pillələrində.

Şimşəyin başımda oynayıb mənim,
Bulağın köksümdə qaynayıb mənim.

Gəlmirmi yadına cılız bir uşaq?
Belində çantası, əldə dəhrəsi.
Qalxanda çiyələk yığardı, ancaq
Düşəndə çiynində çırpı şələsi.

Ehmalca enərdi bu pillələrdən,
Baxıb öz-özünə qürrələnərdi.
Gör neçə müddətdir ovuduram mən
Bu gizli həsrəti, bu gizli dərdi.

Bir vaxt üst yandakı əzgil koluna
İlişdi köynəyim, cızıldı qolum.
Qanım damcıladı bu dağ yoluna,
Bu dağın, bu yolun qurbanı olum.

Hər daşın, çınqılın mənə tanışdır.
İstəsən, sayaram lap bircə-bircə.
Daha dözəmmədim, bağrım alışdı.
Dağlar necə susur, görəsən necə?

Göydən ulduzları tökdürrəm yerə,
Dinməsə o yamac, sussa bu dərə.

Tutub qayaların daş yaxasından
Elə silkələrəm, paralanarlar.
Bir ah çəkərəm ki, övlad ahından
Dağlar sinəsindən yaralanarlar.

Axı,mən dağların şair oğluyam,
Şıltağam, dəcələm, hər nəyəm – buyam.

Salam, ey dağ yolu, tanış sarmalar!
Bu yolçu o cılız uşaqdır ki,var.

*11 sentyabr – 3 oktyabr 1978-ci il*

## Tanıyın məni

Mənim mətanətim, mənim mərdliyim,
Yenilməz iradəm, kişi sərtliyim,
Bu şahanə vüqar, şahanə baxış
Mənə torpaqdandır, torpağa alqış!

Sevinci sevincim, qəmi qəmimdir,
Yaxşısı mənimdir, pisi mənimdir.

Məndə dağ ətri var, aran odu var,
Ey məni yaxından tanımayanlar!
Bu ulu dağların gücü, qüdrəti
Biləyimdədir.
Bu əsrin qayğısı ürəyimdədir.

Bilirəm nədir eşq, nədir etibar,
Ey məni yaxından tanımayanlar!

Mən sizə yaxınam, tanıyın məni.
Axı doğulmayır gündə bir şair,
Sabahın eşqinə sınayın məni.
Sanmayın qızışıb özündən deyir,
Sınaqdan çıxmasam, qınayın məni.

*23 sentyabr 1975-ci il*

## Lövhə

Qayalarda
maralların izi donub.
Bulaqlarda
gözəllərin təbəssümü,
sözü donub.
Gülüşlərin hərarəti.
Mən heç belə
görməmişəm təbiəti.

Zirvələrim dümağ idi,
bəyaz olub.
Gündüzlərim ılıqnəfəs,
Gecələrim ayaz olub.
Dərələri yuxu çəkib
dərinliyə.
Çətindir ki, bu sükutdan
yanan ürək sərinləyə.
Elə bil ki, yoxa çıxıb
Günəşin də hərarəti.
Mən heç belə
görməmişəm təbiəti.

Məəttələm, dəyişibdir
necə dünya;
Başdan-başa olubdur ağ.
Sən geyimə-keçimə bax,
Deyərsən ki, gəlin köçür
qoca dünya.
Qoy başına yağsın onun
Yerin-göyün səadəti,
Mən heç belə
görməmişəm təbiəti.

*14 yanvar 1978-ci il*

## Qılınc

Sən ulu babamın yadigarısan.
Səbrin illər yorub, əsrlər yorub.
Nənəmin sehirli nağıllarısan.
Adın cinlər qovub, tilsimlər qırıb.

Bir namərd əlini qoydu döşünə,
Min namərd düşmənə əydi başını.
Sıxıldı babamın dişi dişinə,
Saxlaya bilmədi o, göz yaşını.

Sənə iki damla göz yaşı düşdü,
Düz iki yerindən oyuldun, qılınc.
İki qatlananlar qabağa keçdi,
Sən də öz qınına qoyuldun, qılınc.

Qoroğlu "Koroğlu" oldu həyatda,
Ayağı yer tutdu Keçəl Həmzənin.
"Qır" deyə qoyuldu lağa Qorat da,
Babamın köksünü deşən nizənin

Ucu kürəyimdən çıxdı, qılıncım.
Söndü bu yerlərin Günəşi, odu,
Daha ulduz-ayım yoxdu, qılıncım.
Bu dərd Cünun etdi Dədəm Qorqudu.

Bir aşıq anaynan bir aşıq bacı
Bayatı söylədi illərdən bəri.
Gəzdi yad başında Vətənin tacı,
Əlimiz göynədi səndən ötəri.

Qaldın arasında orun-odunun,
Gah da boy tirindən asıldın, qılınc.
Yetim uşaq kimi Fatma Dodunun
Tumanı altına qısıldın, qılınc.

Olub əl yaylığı, ellər gülüncü
Əyildik burnumuz dəyincə yerə.
Ərəbin qılıncı, Misrin qılıncı
Yaltaq tərifiylə tutuldu zərə.

Gör nələr işlədi zaman, təbiət,
Yerin dilovdumu, yük dalıydımı?
Bizim belimizi bükən itaət
Səni də qınına qoymalıydımı?

Yad əlin sığalı nə yaman imiş?
Ey hirsi, qəzəbi pas atan qılınc!
Dağlara çən gələr, el başına iş...
Hələ də Vətənə yas tutan qılınc!

Matəm paltarındır bu qın, soyun, çıx!
Sinəmin qanıyla silim pasını.
Göynəyən əlimlə bir zərbə çalım,
Doğra, tök Vətənin qəm libasını!

*21 dekabr 1981-ci il*

## Yaşamaram

İllər mənsiz ötüşəcək,
Nə mənası? Yoxam, varam.
Gələn bir şey götürməli,
Gedən bir şey verməlidir.
Yadigarsız yaşamaram.

Nəyə gərək hər söhbəti
Açıq deyəm, üzə vuram?
Başaşağı yaşayan çox,
Mən vüqarsız yaşamaram.

Kimə bəlli deyil görən
Bu torpağın səxavəti?
Qətrə-qətrə içmişəm mən
Bulaqlardan məhəbbəti.

Anaya da ananızdan
Əziz olan bir ana var.
O – Vətəndir!
Vətən qızı, mənim üçün
Səndən gözəl bir sona var.
O – Vətəndir!

Eşitdinmi, a sevgilim,
Deyən sənsiz yaşamaram?
Mən sənsiz də yaşayaram,
Mən Vətənsiz yaşamaram!

*13 aprel 1974-cü il*

## Anam Kişə

Gözəl Vətən!
Xoşbəxtəm ki,qucağında
doğuldum mən.

Bilən bilir, dünya – geniş,
Ömrün yolu yoxuş, eniş.
Hər qartala – öz yuvası,
Hər körpəyə – öz anası,
Mənim yuvam, anamsan, Kiş!

Göylər gördüm uca-uca,
Qanadlanıb uçar oldum.
Dağlar gördüm qoca-qoca,
Sevincimdən qucar oldum

Çaylar gördüm dəliqanlı,
Könlüm kimi həyəcanlı.
Düzlər gördüm – laləsi al.
Sənə doğru uçdu xəyal.

Arzularım açdı çiçək,
Ayağına səpəm gərək.
Çılğın-çılğın, kövrək-kövrək,
Çatdım, səni öpəm gərək.

*3 oktyabr 1974-cü il*

## Kəndimiz

Göylərimin rəngi duru, dumduru...
Torpağımın qucağında yuvamız.
Axşamüstü hər ulduzun öz nuru,
Nurda çimir süd yuxulu obamız.

Səhərləri şeirə gəlməz, deyim nə?
Gündüzləri gündüzlərin gözüdür.
İstəyirsən ürəyində gül mənə,
Günəşi də ürəyimin özüdür.

Dağlarım var – hündür, hündür, lap hündür,
Zirvələrim səmalara sütundur.
Küləklərim budaqları sim eylər,
Mən bilərəm nə danışar, nə söylər.

İgidlərim hər qıza bir adaxlı,
Gözəllərim hər anaya bir gəlin.
Evlərimiz bizim qonaq otaqlı,
Gəlməsəniz üşüyəcək, tez gəlin.

Bir oğlu var, görüş üçün gün sayıb,
Yollar boyu qızıl güllər əkibdir.
Oğulluqda atasına oxşayıb,
Şairlikdə anasına çəkibdir.

*16 sentyabr 1977-ci il*

## Özün bil

Eyb etməz, kənd yeri xoş gəlmir sənə...
Mənim oylağımdır o qaya, o dağ.
Onlar verməsəydi məhəbbət mənə,
Səni də sevməzdim heç zaman, heç vaxt.

Mən də bilirəm ki, genişdir Vətən...
Onun qucağında hamıya yer var.
Hansı bir ocaqda qızınar görən,
Ata ocağında qızınmayanlar?

Əgər qurban kəssəm ayağın altda
Yuvamın odunu, hərarətini,
Yurd oğul itirər, oğul – mən adda.
Dağlar geri alar əzəmətini,
O zaman nə qalar mənə həyatda,
Necə qoruyaram məhəbbətini?

*13 oktyabr 1975-ci il*

## Bulaq

Nə ötürsən asta-asta, gah həzin?
Son qoysana bu fəğana, ay bulaq.
Dilində söz durmaz, ürəyində kin,
Bənzəyirsən lap insana, ay bulaq.

Şahidin yox, kimsə bilməz yaşını,
Həsrət, nəfəs yandırıbmı daşını?
İçmisənmi ala gözün yaşını,
Yana-yana, qana-qana, ay bulaq?

Zaman-zaman burulursan, axırsan...
Göz yaşıtək durulursan, axırsan.
Gözəllərə sən doyunca baxırsan,
Mən qalıram yana-yana, ay bulaq.

Uşaq idim, cavanlığı haqladım...
Gah od oldum, gah su oldum, çağladım...
Yol keçirdim, burda ayaq saxladım...
Nə deyirsən bu nöqsana, ay bulaq?

Hal əhlisən...hal əhlini qanarsan,
Bu günləri bir də dönər sanarsan?
Mən gizlində, sən aşkarda yanarsan,
Sən – sevdalı, mən – divanə, ay bulaq.

Sən xeyir-şər qardaşısan bu elin,
Həmdəmindir sevən gənclər, qız-gəlin.
Kim deyir ki, yox nəfəsin yox dilin?
Desən, sığmaz min dastana, ay bulaq.

Duyan ürək, söylə, necə daş olsun?
Səndən keçən məhəbbətə tuş olsun.
Salam apar, xatirimiz xoş olsun,
Bu zamandan o zamana, ay bulaq.

*10 oktyabr 1979-cu il*

## Aldatdı məni

Mən bu kənddə qalmaz idim,
Yazıyla aldatdı məni.
Boynuma yük almaz idim,
Nazıyla aldatdı məni.

İşım-işım işıltısı,
Xışım-xışım xışıltısı,
Pıçıl-pıçıl pıçıltısı,
Sözüylə aldatdı məni.

Ey gedəri, ey gələri,
Sayım sənə mən nələri?
Qayım-qayım çeşmələri
Gözüylə aldatdı məni.

Qalasının daşı ilə,
Qayasının qaşı ilə.
Böyüklüyü, yaşı ilə
Özüylə aldatdı məni.

Bax, yenə də yaşıl dondu,
Məndən ötrü daha sondu.
Zirvəsinə quşum qondu,
Düzüylə aldatdı məni.

Dilə tutdu axşam-səhər,
O – füsunkar, mən birtəhər.
Gördü məni çəkir şəhər,
Qızıyla aldatdı məni.

*23 aprel 2007-ci il*

## Dağım

Qucub qayasından daşına kimi
Sarması boynuna sarılan dağım.
Çat verib bağrının başına kimi
Köksü köksüm kimi yarılan dağım.

Sıx-sıx ağaclardan sinəsi tüklü,
Başının üstündə buludu yüklü.
Ərşadlı-gürşadlı şimşək hörüklü,
Bənizi ağarıb qaralan dağım.

*28 mart 2005-ci il*

## Marxalın işıqları

Marxalın işıqları kəndin üzünə düşür.
Kənd gözünü açınca işıq gözünə düşür.
Marxal işıq içində, kənd qaranlıq içində...
Yuxulamaq da olmur nigaranlıq içində.
Gah sağa çevrilir kənd, gah sola çevrilir kənd.
Gah şəhərə boylanır, gah yola çevrilir kənd.
İçıq yanmır ki, yanmır.
İşıqlara bürünüb yatanlar da oyanmır.
Kənd göylərə əl açır işıq sönəndən bəri.
Qaranlıqda görünmür amma kəndin əlləri.

*16 dekabr 2018-ci il*

## Söndü işıqlar

Bizim kənddə əsdi meh...
Söndü işıqlar!
Yağış yağdı, kəsdi, eh...
Söndü işıqlar!

Quşmu qondu məftilə?
Dumanmı dəydi?
Qaranlıqda gözünü
yumanmı dəydi?

Yazım qaldı yarımçıq...
Söndü işıqlar!
Günəşim, çıx! Günüm çıx!
Söndü işıqlar!
Olmuşdu... olmamışa
Döndü işıqlar!

*5 may 2021-ci il*

## İşıq itirənlərə

Ey işıq itirən, işığın itsin!
İşıq axtarasan nəslin boyunca!
Görüm işıq gələn yer tapmayasan
Soykökün boyunca, əslin boyunca.

Ey işıq itirən, işığın itsin!
İşıqsız qalasan gözdən, könüldən.
Qığılcım gəzəsən, köz axtarasan
Sönən ocaqdakı bozaran küldən.

Ey işıq itirən, işığın itsin!
Sağını, solunu qarışdırasan.
Özünü zülmətə alışdırasan.
Qaranlıq otaqlar içərisində
Əlini, qolunu çalışdırasan

Ey işıq itirən, işığın itsin!
Sənə nur saçmasın Günəş də, Ay da.
Vurnuxa-vurnuxa var-gəl edəsən
Qaranlıq içində, bəyaz sarayda.

*5 may 2021-ci il*



*Qışın üzü bozdur, nəfəsi buzdur*

## Şəki

Şəki – qədim Şəki, əzəl Şəkidir.
Mehriban Şəkidir, gözəl Şəkidir.

Arxası dağlardır – başları qarlı.
Qarşısı bağlardır – nübarlı, barlı.

Yaylağı, qışlağı öz içindədir.
Təpələr üstündə, düz içindədir.

Yolları yükdolu karvanlar görüb,
Karvanlar başında sarvanlar görüb.

Örpəyi, çitməsi, kələğayısı,
Yaylığı, dəsmalı dillərdə dastan.

Xanlar məkanıdır, bəylər yurdudur,
Qızıyla, oğluyla ellərdə dastan.

Burda gözəllərin tülü ipəkdən.
Tülünün üstündə gülü ipəkdən.

Şəkinin donunu təbiət biçib,
Çəməni atlasdan, çölü ipəkdən.

Şəki – qədim Şəki, əzəl Şəkidir.
Mehriban Şəkidir, gözəl Şəkidir.

*09 iyul 2006-cı il*

## "Təbrizin baharı gəlinə bənzər"

*(Bu misranın müəllifi, Edinburq Universitetinin professoru Qulamrza Səbri Təbriziyə ithaf edirəm)*

Sağ ol, Qulamrza səbri Təbrizi!
Qışın ortasında umsutdun bizi

Bir kəlmə sözündən güllər açıldı,
Güllər açıldıqca dillər açıldı.
Qarşımda çəmənlər, çöllər açıldı
Yarımın xınalı əlinə bənzər.
"Təbrizin baharı gəlinə bənzər".

Elə bil, baş-başa gəldi buludlar,
Göylərin köksündə odlandı odlar.
Su daman sünbüllər, titrəyən otlar
Kəkilli qızların telinə bənzər.
“Təbrizin baharı gəlinə bənzər”.

Xumargözlülərin qönçə üzləri
Onsuz da didərgin salıb bizləri.
Bəzəkli, düzəkli Güney düzləri
Quzeyin Muğanı, Milinə bənzər.
“Təbrizin baharı gəlinə bənzər”.

Altun səhərlərə bəh-bəh eylərəm.
Şeh dolu laləni qədəh eylərəm.
Kövrələ-kövrələ cəh-cəh eylərəm.
Dilim şeyda bülbül dilinə bənzər.
“Təbrizin baharı gəlinə bənzər”.

Gah güllər içindən baxar gəncliyim,
Gah qərib sularda axar gəncliyim.
Bahar təravətim, bahar gəncliyim
Köpüklü çayların selinə bənzər.
“Təbrizin baharı gəlinə bənzər”.

Həsrətin axırı vüsaldır, kamdır.
Bu dünya yaz ilə, qış ilə tamdır.
Bahar soyuqluğa qarşı qiyamdır, –
“Cəngi”nin, “Yallı”nın zilinə bənzər.
“Təbrizin baharı gəlinə bənzər”.

Bir kəlmə sözündən qaynadı qanım,
Coşdu yaz sevincim, yaz həyəcanım.
Dünyanın köksündə Azərbaycanım
Cənnət çiçəyinə, gülünə bənzər.

"Təbrizin baharı gəlinə bənzər".
Sağ ol, Qulamrza Səbri Təbrizi!
Qışın ortasında umsutdun bizi.

*08 dekabr 1997-ci il*

## Gəlirəm

Şəhriyarın adına niyyət edib yol gəlirəm,
Gah ona səcdə edir, gah da açıb qol gəlirəm.

Qucmuşam, oxşamışam şövq ilə Heydərbabanı,
Yel kimi yellənirəm, sel kimi sağ-sol gəlirəm.

Gör neçə ildi ki, mən röyada yollar yoruram,
Tehrana baş çəkirəm, Təbrizə bol-bol gəlirəm.

Daha novruz havalı günlərə üz tutmuş ömür,
Gözün aydın, çəmənim, əldə tutub gül gəlirəm.

Yamyaşıl arzularımdır göyərən göy səməni,
Göz yaşım – yaz yağışı, lap anabülbül gəlirəm.

Üzə həsrət üzümün qisməti varmış bu dəfə,
Vaqif Aslan, vüsalın qiymətini bil, gəlirəm.

*07 mart 1999-cu il*

## Təbrizim

Mən sənə gəlməmişəm tərifdən çələng hörüm!
Təbrizim!
Gəlmişəm ki, mən səni xoşbəxt görüm, şən görüm!
Təbrizim!

Mən sənə gəlməmişəm beşulduz otel üçün.
Restoran, motel üçün.

Barlar, kazinolarçün ağzımın suyu axmır!
Təbrizim!
Neynəyim ki, ömür-gün mənim sözümə baxmır!
Təbrizim!

Mən sənə gəlməmişəm, nitqlər icad edim.
Mən sənə gəlmişəm ki, dünənimi yad edim.
Yeddi yox, yetmiş arxa dönənimi yad edim.

Mən sənə gəlmişəm ki, sənlə baş-başa qalım.
Təbrizim!
Yüz-yüz Şirvanilərdən, min-min Təbrizilərdən xeyir-dualar alım.
Təbrizim!

Bağrının başı yanmış, torpağı, daşı yanmış!
Təbrizim!
Kipriyi, qaşı yanmış, gözünün yaşı yanmış!
Ürəyi qurum olmuş, yadı-yaddaşı yanmış!
Təbrizim!

Gəlmişəm ki, yadını, yaddaşını oyadım!
Sinəmə sıxa-sıxa yurd daşını oyadım!
İlham bizim, təb bizim!
Təbrizim!

*21 mart 2013-cü il*

## Sarıbaşım

Salam, mənim Sarıbaşım!
Sənsən mənim təvəllüdüm,
Sənsən ömrüm, günüm, yaşım!

Sağım, salam! Solum, salam!
Kol-kos basmış yolum, salam!
Salam, yurdum! Salam, elim!
Tanıdınmı öz balanı, Sarvagelim?
Parasardan aşa-aşa,
Kürmük kimi daşa-daşa
Alagözdə at oynadan, axı, məndim!
Bəyəm məni tanımadın, Eskikəndim?
Salam mənim Səngərqalam!
Son mənzilim – Qabırtalam!
Salam üstü mamır tutan qəbir daşım!
Salam, mənim Sarıbaşım!

Zirvəsinə çıxılmayan, dağım, salam!
Bar-bəhəri yığılmayan bağım, salam!
İçilməyən bulaqlarım, içim səndən!
Keçilməyən irmaqlarım, keçim səndən!
Durul daha, Bulandığım,
Ay başına dolandığım!
Qurban olsun sənə başım,
Sarıbaşım!

Ey por tutan qapım-bacam!
Gəlmişəm ki, səni açam!
Olanları ürəyinə salma bir də!
Toya həsrət, yasa həsrət qalma bir də!
Qoy çalınsın "Sarıbaşı"m – "Ləqihəngim"!
Qabaqdadır hələ cəngim!
Gəlmişəm ki, üşüməsin ocaq daşım!
Sarıbaşım! Sarıbaşım!

***26 noyabr – 26 dekabr 2013-cü il***

## Sarıbaşın yolları

Dağlar başından keçər
Qaya qaşından keçər
Qan yaddaşımdan keçər.
Sarıbaşın yolları!

Enər Kürmük çayına.
Səngərqalaya qalxar.
Qabırtalaya qalxar
Dolanar zirvələrə
Ərşi-əlaya qalxar
Sarıbaşın yolları!

Kövrələrək körpətək
Sarılıram boynuna.
Yenə nəvaziş ilə
Alır məni qoynuna.
Sarıbaşın yolları!

Ehey!.. Sevdiyim gözəl!
Gəl, sənə söyləyim, gəl!

Cavan yaşımdan keçər.
Ürəyimin içindən,
Bağrım başından keçər
Sarıbaşın yolları
Yollar-ana qolları!

*8 noyabr 2020-ci il*

## Mingəçevir

Baş qoyub Boz dağın dizləri üstə,
Üzünü çevirib Kürə, yatırsan.
Uzanıb Mil, Muğan düzləri üstə
Çiçəyə batırsan, gülə batırsan.
Deyimmi nə qədər şirin dadırsan?

Uyu meydan-meydan, küçəbəküçə,
Səni gözüm gördü, ürəyim axdı.
Sənə min şükürlər, mübarək gecə!
Məni xoşbəxt etdin bu gecə vaxtı.

Uyu yaşıldonlu su pərisitək,
Bir ulduz oyaqdır, bir Ay, bir də mən.
Gündüz ilahəsən, gecələr mələk,
Bəs mən necə doyum gözəlliyindən?

Titrə yarpaq-yarpaq, xışılda, uyu!
İşıqlar içində işılda, uyu.

Mənə deyirlər ki, haçandan bəri,
Şair, sevəndə də yaman sevirsən.
Mən necə sevməyim səni, ey pəri!
Axı sən gözəlsən – Mingəçevirsən!

*12 iyun 2008-ci il*

## Bərdə

Məhinbanu diyarı...
Şirin şəhəri Bərdə.
Nazın bol, nemətin bol...
Qapın açıqdır mərdə.

Seyrin var, seyranın var...
Hər yerdə heyranın var.
Bağında qızıl gülün,
Düzündə ceyranın var.

Məstəm sevda dəmiylə.
Sevinciylə, qəmiylə.
Sənə naxış vurulub
Nüşabə müdrikliyi,
Nizami qələmiylə.

Yazın-yaz, qışın da yaz!
Səndən olmaz ki, olmaz!

*17 iyul 2018-ci il*

## Daş əlifba

Tarix yaşa dolub, tarix yaşlaşıb,
Burda yeriməyib, dayanıb zaman.
Böyük şəxsiyyətlər burda daşlaşıb,
Böyük məbədlər də hələ bir zaman.

Qobustan – zamanın kəsilən yolu,
Tapdanıb nə zaman, ot bitib haçan?
Qobustan – vətənin quruyan qolu,
Donub damarında daşa dönüb qan.

Görən neçə arzu burda gül açıb,
Görən neçə ürək yanıbdı burda?
Görən neçə körpə burda dil açıb,
Görən neçə nəsil donubdu burda?

“Qaval daş” çalınır nə vaxtan bəri?
O ana qəlbini necə ovudum?
Bəlkə asi düşən bəy ərənləri
Qarğışı tutubdur Dədə Qorqudun?

Gözdə qalan murad, deyilməyən sirr,
Kim sənə vurubdur belə kor düyün?
Bilsəm ki, bu daşlar danışa bilir,
Dönüb daş olaram danışmaq üçün.

Hay sallam, yayılar səsim hər yana,
Daşlar səda verər, danışmaz fəqət.
Ey mənə əzəldən dil verən anam,
Mənə Qobustanın dilini öyrət!

Bilim, o yurdumun şərəfi, şanı,
Bilim, – o yurdumun dərdi yasıdır.
Oxuyum: – Qobustan – Azərbaycanın
Daşlaşan imzası, əlifbasıdır.

*20 may 1970-ci il*



*Mayın əvvəlləri, 1970-ci il. Qobustanda.*
*Sevimli "Azərbaycan tarixi" müəllimimiz Tərlan Ağayev bizi Qobustana ekskursiyaya aparmışdır.*
*İkinci sırada-sağdan birinci – Vaqif Aslan*



*Mayın əvvəlləri, 1970-ci il. Qobustanda.*
*Sevimli "Azərbaycan tarixi" müəllimimiz Tərlan Ağayev bizi Qobustana ekskursiyaya aparmışdır.*
*Soldan ikinci sırada üçüncü – Vaqif Aslan*

*52 ildən sonra 20 may 2022-ci il
Qobustandayıq.*



*Soldan: Gəlinim Zülfiyyə Aslan, nəvəm Tuncər Aslan, mən – Vaqif Aslan, həyat yoldaşım Təranə Aslan*



*Nəvəm Tuncər Aslanla Qobustan qayalarından xeyir-dua alırıq. Bu ziyarəti Tanrım özü qəbul etsin*



*Tuncər üzünü Tanrıya tutub Qobustanda
yerdən və göydən xeyir-dua alır 20 may 2022-ci il*

## Əsirgə məni!

Baxma, mənə baxma, sən allah, gözəl!
Dəlinin biriyəm mən, vallah, gözəl!
Bir də görərsən ki, yaşımdan dönüb,
Ağlımdan fırlanıb, başımdan dönüb
Sevərəm səni.
Çəkmə, qurban olum, özünə məni.
Qoyma, yaxın qoyma gözünə məni.
Ölərəm, qalaram gözündə, gözəl!
Görəsən, yer varmı gözündən gözəl!
Özün də gözəlsən, gözün də gözəl!

*01 oktyabr 2014-cü il*

## Çünki

Sən məni öldürürsən...
Çünki gəlir xoşuna.
Özüm də istəmirəm
Yaşayım boş-boşuna.

*26 iyul 2018-ci il*

## Hər günün öz yeri var

*Keçən günlərimi qaytaraydılar*
*Gələn günlərimi qurban verərdim.*
***Rəfiq Zəka Xəndan***

Keçən günlərimin heç vaxt itməyən
Xətri-hörməti var mənim yanımda.
Heç vaxt tükənməyən, heç vaxt bitməyən
Ağrısı, acısı gəzir canımda.

Keçən günlərimtək gələn günlərim
Bu gündən sabaha axışlarımdır.
Ağlayan günlərim, gülən günlərim
Mənim alınımdakı naxışlarımdır.

Olub keçənləri salaram yada...
Yalana çərpələng hörmərəm, əsla!
Keçən günlərimi qaytarsalar da,
Gələn günlərimi vermərəm, əsla!

*28 oktyabr 2014-cü il*

## Kim olsa, and olsun, aldanacaqdır

Mən yalan satanam, sən yalan alan!
Ay mənim dərdimə, sərimə qalan!
Dünya da yalandır, sevgi də yalan...
Mən özüm yalandan vuruldum yaman
Bu yalan dünyaya, yalan sevgiyə.

Necə də, necə də vurulmayaydım?
Məni bu dünyaya salan sevgiyə,
Sonra da qaytarıb alan sevgiyə?
Məni də, səni də alandan sonra,
Bu qalan dünyaya, qalan sevgiyə

Sevgi də insana daldanacaqdır
Dünya da insana daldanacaqdır.
Kim olsa, and olsun, aldanacaqdır
Bu yalan dünyaya, yalan sevgiyə.
Bu qalan dünyaya, qalan sevgiyə.

*02 mart 2015-ci il*

## Qadın

Dağıdır saçını dəniz küləyi...
Uzaq üfüqlərə baxırsan, qadın.
Sən öz sinəndəki sevən ürəyi
Kim üçün yandırıb yaxırsan, qadın?

Dənizə açırsan sevən qəlbini...
Sən ki asta-asta ləpələnirsən.
Elə bil, çırpılıb qayalıqlara
Qayıdıb üstünə səpələnirsən.

Özündən-özünə yağırsan, qadın.
Üzündın, gözündən axırsan, qadın.

Udur, xatirələr boy vermir sənə...
Bir anlıq boğulan kimi olursan.
Gözlərin uzağa dikilir yenə...
Təzədən doğulan kimi olursan.

Gəlinlik donunu geyib əyninə
Bəlkə də, özünü seyr eləyirsən.
Daha bu düz-dünya gəlmir eyninə
Könlünü-gözünü seyr eləyirsən.

Dağıdır saçını dəniz küləyi...
Uzaq üfüqlərə baxırsan, qadın.
Sən öz sinəndəki sevən ürəyi
Kim üçün yandırıb yaxırsan, qadın?

*25 yanvar 2019-cu il*

## Kişilik vəsiqəsi

Nişanın üstündə. Ərkəksən... Bu-düz...
Sanma ki, kimliyin adından keçər.
Bığın, saqqalın var, gerçəksən ... Bu-düz...
Amma ki, təsdiqin qadından keçər.

Qaydadır... Düz sözə çəkilməz çiyin ...
İnsan Yaradanın əziz kəsidir.
Yadından çıxarma, qadın dediyin
Kişinin kişilik vəsiqəsidir.

*07 yanvar 2007-ci il*

## Soruş ki, deyim

Sən soruş ki, mən deyim
Biz kimə tay kimiyik.
Birimiz Günəş kimi,
Birimiz Ay kimiyik.

Elə hey dayanmadan
Dolanırıq, dönürük.
Birimiz alışanda
O birimiz sönürük.

*02 mart 2012-ci il*

## Sevgi

Yeri-yurdu göyərdən
göylərin göz yaşıdır.
Göyün yerə sevgisi
sevgilərin başıdır.

*05 may 2012-ci il*

## Mütləq

Sən Günəş kimisən, mən Ay kimiyəm ...
Açılan səhərlər səhərin olsun.
Mən sənə çatmayan haray kimiyəm ...
Sadəcə olaraq xəbərin olsun.

Gecəmiz gündüzə dönür beləcə
Biz də fırlanırıq göyün içində.
And olsun, haçansa görüşəcəyik
Biz bu dünya boyda öyün içində.

*12 dekabr 2018-ci il*

## Qırğız qızı

"Qırğız qızı-qırğızların anası."
Nəyim var ki, mənim səndən danası?
Mən qocaman Qafqazların oğluyam
Sən işıqlı İssıkkulun sonası.

İşıq kimi ürəyimi dəlmisən.
Dağ Tenqri tərəflərdən gəlmisən.

Göydən yerə uzadılan əlmisən?
Qanımdandır əllərinin xınası.

Göz dəyməsin, sinən Talas qarıdır.
Qoynundakı Fərqanənin narıdır.
Gözəlliyin bu dünyanın varıdır.
İşığında yanasıyam, yanası.

Göz dəyməsin, sinən Talas qarıdır.
Qoynundakı Fərqanənin narıdır.
Gözəlliyin bu dünyanın varıdır.
İşığında yanasıyam, yanası.

Türkmən olsun, özbək olsun, ya qazax...
Yaxşı bilir nə yasadır, nə yasaq.
Vaqif Aslan üzü ağdır, sözü sağ.
Kimdir səni məndən doğma sanası?
“Qırğız qızı-qırğızların anası”.
Ey türk qızı, türklüyümün anası!

*04 yanvar 2016-cı il*

## Səhər-səhər

Bəyaz gül açmışdı bu səhər donun ...
Nə gözəl açırmış gül səhər-səhər.
Qoy sürtüm üzümü gülünə onun!
Titrəsin ahımdan tül səhər-səhər.

Mənim gözlərimdə düz-dünya bəyaz ...
Səndən gözəl yoxdur, məndən kefi saz...
Min-min yaza dəyər bu səhərki yaz!
Gül görüb açılıb dil səhər-səhər.

Bəyaz köynək üstə qırmızı düymə...
Deiyr: – Qan salarsan, dur, mənə dəymə!
Gülə əl uzatma, çəmənə dəymə
Yıxıl, qabağımda öl səhər-səhər.

*21 fevral 2016-cı il*

## Özəl söhbət

Gözümün gözünlə göz söhbəti var
Mən gözümlə deyim, sən gözünlə yaz

Üzümün üzünlə üz söhbəti var.
Səndən xoşbəxt yoxdur, məndən kefi saz.

Özümün özünlə öz söhbəti var.
Özəl söhbətlərdən olmaz ki, olmaz!

*03 sentyabr 2017-ci il*

## Uzaqlara baxan insan

Uzaqlara baxan insan!
Uzaqlar yaxınmı sənə?
Şirin-şirin xatirələr
Eyləyib axınmı sənə?

Uzaqlara baxan insan!
Baxışında gül açılıb.
Elə bil ki, gül üzündən
Elə bu gün tül açılıb.

Uzaqlara baxan insan!
Yadına nəsə düşdümü?
Püşk atmışdın bir zamanlar...
Sevdiyin kəsə düşdümü?

Uzaqlara baxan insan!
Baxışından qayıdarsan.
Uzaqlarda gördüyünü
Yəqin, bizə ayıdarsan.

Uzaqlara baxan insan!
Uzaqlara apar məni.
Bəlkə, elə o yerlərdə
İtirənlər tapar məni.

Aparmasan, əllərindən
Zaman yağlı kökə kimi qapar məni.
Nə atam var, nə də anam...
Kim yoğurub yapar məni?

Uzaqlara baxan insan!
Uzaqlar yaxınmı sənə?
Mən də gedim uzaqlara,
Uzaqdan baxımmı sənə?
Gözlərinin işığında
Əriyim, axımmı sənə?

*19 iyun 2018-ci il*

## Ulduz

Başımın üstündə bir ulduz yanır.
Bir ulduz yanır...
Məni qaranlıqda itirər sanır.
İtirər sanır...

İşığı çevrəmdə halə kimidir.
Halə kimidir...
O mənim qəlbimdə nalə kimidir.
Nalə kimidir...

Düz-dünya qaralar, sönsə o ulduz.
Sönsə o ulduz...
Məndən üz çevirib dönsə o ulduz,
Dönsə o ulduz...

Deməli, deməli, axır zamandır.
Tanrım, o ulduzu qoru, amandır!

*14 iyul 2018-ci il*

## Qaçıram, qaçıram sevdiklərimdən ...

Qaçıram, qaçıram sevdiklərimdən ...
Məni bərkə çəkir, zora salırlar.
Əvvəl keçirirlər oddan, alovdan.
Sonra itələyib qora salırlar.
Qaçıram, qaçıram sevdiklərimdən ...
Məni sevə-sevə tora salırlar.

Qaçıram, qaçıram sevdiklərimdən ...
Qaçıram, bitirlər yolumun üstə.

Birisi sarılır ayaqlarıma,
O biri ad yazır qolumun üstə.

Qaçıram, qaçıram sevdiklərimdən ...
Onlar da mənimlə birgə qaçırlar.
Mənim qaça-qaça gedib-gəldiyim
Yolların başına oyun açırlar.

Qaçıram, qaçıram sevdiklərimdən ...
Yollara tökürəm alın tərimi.
Ölümü birinci qarşılayaram.
Ölümsüz edirəm sevdiklərimi.

*27 sentyabr 2018-ci il*

## Küsmüşəm

Küsmüşəm, səndən küsmüşəm!
Yalvar, barışaq, barışaq!
Qucaqlaşmaq dəbdən düşüb...
Di gəl, sarışaq, sarışaq!

*8 iyun 2019-cu il*

## Şərəfə

Bu – dostlar...
Bu da – tostlar...
Məni dingildədirlər...
Qədəh cingildədirlər...
Olumum şərəfinə!
Olumumdan başlanan yolumun şərəfinə!

Mən də ki dayanmışam yolumun finalında...
Arvad çiyinlərimdə, oğul-uşaq dalımda...
Deyirəm: – Yaxşı baxın, tanıyın Mən Adəmi”
Ölümüm şərəfinə qaldırıram badəmi!

*05 iyul 2013-cü il*

## Sınıqlıq

*Sənə rəhmət olsun, Aşıq Ələsgər!*

Mənim də qollarım sındı bir zaman...
Yarımın yanında yanıma düşdü.
Ayağım altından Yer qaçdı o an,
Başımın üstündən ulduz sürüşdü.

Sınan qollarıma kədərlə baxdım ...
Onları alası əlim vardımı?
Qar kimi əridim, su kimi axdım...
Sınıqlıq olmasa, daş yağardımı?

Bu necə dünyadır, mənim Allahım?
Körpüləri – sınıq, yolları – sınıq...
Bilmirəm sağamı, solamı baxım
Beləcə gedirəm qolları sınıq...

*24 yanvar 2019-cu il*

## Ağla

Yaxının, uzağın gözündən qaçıb,
"Niyə ağlayırsan" sözündən qaçıb,
Xəlvətə çəkilib ağlayan gözəl!
Demirəm: – Ağlama! Demirəm: – Bəsdir!
Yeraltı çaylartək çağlayan gözəl!
Axı, bu nə istək, bu nə həvəsdir?

Qəlbinmi başını ağrıdır belə?..
Başınmı qəlbini göynədir sənin?
Arada təklənən özünsən elə
Qalıb arasında iki düşmənin.

Qovrulan ürəyin, yanan canındır!
Qovrul, yan, oduna, közünə sağlıq!
Elə məqamındır, elə anındır...
Ağla, ağladıqca gözünə sağlıq!

Qəlbini, beynini yu incə-incə,
Asan olmasa da bu, qadan alım!
Başın da, qəlbin də yola gəlincə
Axsın gözlərindən su, qadan alım!

*29 may 2009-cu il*

## Xahiş

Ana Yerdən gül istədim...
Gül verdi.
Üzməyə əl, danışmağa dil verdi.
Gül də sənin, əl də sənin,
gözəlim.

Ata Göydən gün istədim..
Gün verdi.
Bir demişdim, bi yerinə min verdi.
Gün də sənin, min də sənin, gözəlim.

Daş əvəzi sevda düşdü
başıma.
Baxma mənim gözdən axan
yaşıma.
Səndən heç nə istəmirəm, gözəlim.
Amma bir də çıxma mənim qarşıma.

*27 aprel 2019-cu il*

## Axtarıram elə hey!

Axtarıram səni mən.
Harda? Ədəm bağında.
Ömrümün ilk səhəri,
dan yeri, sübh çağında.
Səni Həvva kökündə axtarıram elə, hey!
Yelə dönüb əsirəm, gəzirəm kainatı
Dilimdə Həvva adı.
Gah su olub axıram,
gah dönürəm selə, hey!
Səni min illərdir ki, axtarıram belə, hey!
Canımın canı kimi...
Qanımın qanı kimi
Axtarıram... Hardasan?
Bəlkə yaxınlardasan, bəlkə uzaqlardasan?
Səni ilk Həvva kimi Göy üzündə itirdim.
Min-min Adəm ömrünü Yer üzündə bitirdim.
Yenə ilk Adəm kimi axtarıram səni mən.

Soruş ki, deyim harda?
Şərdən, Şeytandan uzaq, uzaq, uzaq diyarda.

*02 sentyabr 2019-cu il*

## Hiylə

Baxışlar dəyişib – göz dolu hiylə.
Bu nə danışıqdır – söz dolu hiylə.
Getdikcə-gəldikcə əzablanıram...
Yol dolu yolsuzluq, iz dolu hiylə.
Bir üzdə neçə rəng olar, Allahım?
Rənglərdə rəngsizlik, üz dolu hiylə.
Dağıma, düzümə arxalanırdım...
Dağ dolu fırıldaq, düz dolu hiylə.
Məni qınasan da, qınamasan da...
Bu dünya heylədir, heylədir, heylə!

*05 sentyabr 2019-cu il*

## Ərk

– Məni Günəş bilib bərk-bərk qucaqla.
– Dəliyəm? Nə işim odla, ocaqla?
– De, məni heç kimə verməyəcəksən.
– Bir onu heç zaman görməyəcəksən.
– Qəlbim bu sevgidən şiddətlə vurur.
– Mənim qəlbim isə dayanır, durur.
– Tək sənin üçündür nəvazişlərim.
– Bitib tükənmir ki, mənim işlərim.

*19 fevral 2016-cı il*

## Sən gülə baxırsan

Sən gülə baxırsan, gül sənə baxır...
Sənə də, gülə də baxan var axı.
Gül üçün ürəyi titrəyib əsən,
Səninçün ürəyi axan var axı.

*17 may 2015-ci il*

## Bir az ağıllı olma!

Bir az ağıllı olma! Ey gözəl qız, əzəldən
Ağlı olanlar qaçır yarımağıl gözəldən.

*17 fevral 2016-cı il*

## İncimə məndən

Gözəlim, göyçəyim, incimə məndən.
Qorxuram səndən.
Sən məni sevirsən,.. səhv eləyərsən.
Mən heç, özünü də məhv eləyərsən.

*23 fevral 2016-cı il*

## Yol ver

Qışdan köçüb gəlirəm ...
Yazdan keçib gəlirəm...
Yol ver mənə, ey payız!
Ehey, payız, hey, payız!

*24 sentyabr 2020-ci il*

## Deyiləm

*Cənnətlik olasan, Yunus Əmrə*

Sən elə bilmə ki, səndə deyiləm.
Elə mən özüm də məndə deyiləm.

Yerimi-yurdumu "Ol" deyən bilir...
Aşkaram, dumanda, çəndə deyiləm.

Atamın belindən anam bətninə
Mən ki, yol gəlirəm, gendə deyiləm.

Tanrının əliylə yoğruldu xəmrim...
Hər kəs kəsə bilən kündə deyiləm.

Meyvə də özüməm, tum da özüməm...
Amma ki, sən deyən gündə deyiləm.

İsəvi, Musəvi məndən küsməsin ...
Axı, mən yarımçıq bəndə deyiləm.

Çəkmə sınaqlara Vaqif Aslanı ...
Mən, axı, sən deyən yöndə deyiləm.
Adəməm, Adəmdən öndə deyiləm.

*25 sentyabr 2019-cu il*

## Zarafat deyil

Qəbrim üstə yazı yazdım, budur ki!
Zaman dərya, ömür axar sudur ki!
Torpaq bizi yavaş-yavaş udur ki!
Göyərməyin vədəsində göyərtsin.

*29 may 2017-ci il*

## İki məclis

*(Atamı düşünərkən)*

Sən məclis qurdun bizə,
Qara zurna çalındı.
Boynumuza al-əlvan
Kələğayı salındı.
Rəqs elədi dost-tanış...
Toylu-büsatlı atam,
Söhbəti dadlı atam,
Sən demə, bu dünyanın
Toyu da bir aldanış...

Biz məclis qurduq sənə,
Ahlar, ünlər içində.
Fəryadlar, hönkürtülər,
Dağ-düyünlər içində –
Əcəb oynağa düşdük.
Yanıb-töküldük, atam!
Bənd-bənd söküldük, atam!
Qəm ilə, göz yaşıyla,
Dərdlə qaynağa düşdük.

Bu – sən, bu da – biz, atam!
Bənzəmir bir-birinə
Bu iki məclis, atam!

*6 dekabr 1989-cu il*

## Anam, gözlərin aydın!

*(Anamı düşünərkən)*

Anam, gözlərin aydın!
Məzarına gün düşüb!
Ürəyimə bir dəli,
sızıltılı ün düşüb!

İynə ucu işıqlar
kölgələrə sancılıb
yarpaqlar arasından.
İşıq ilə qaranlıq
burda kordüyün düşüb.
Anam, gözlərin aydın!
Məzarına gün düşüb!

Yaz gəlib, çiçək səpib
yenə də məzarına.
Dikələydin, baxaydın
gülünə, gülzarına.
Görəydin torpağına
göylərdən nur süzülüb.
Nur sapa muncuq kimi
mirvarilər düzülüb.

Anam, gözlərin aydın!
Nolaydı, sağ olaydın!
Ya da, ya da, ya da ki...
Elə bu dünyadakı
ağrıları unudub
yerin ağrı çəkəydi,..
yenidən doğulaydın!

Göyərən arzuları
boynuna çələng anam!

Gözəldən-gözəl, anam!
Qəşəngdən-qəşəng anam!
Gözün, gözlərin aydın!
Nolaydı, sağ olaydın!

## "Super insan"a

Qarşına çıxanı hədələyirsən,
Əydikcə insanı, əymə, ey insan!
İnsana inamı zədələyirsən,
Allaha inama dəymə, ey insan!

*04 sentyabr 2015-ci il*

## 5-i 7-ci ay

5-i 7-ci ay!..
A bay-bay!..

O gün anam səhərəcən ağrıyıb.
Ağrısından dədəmi də
Qarğıyıb…
İngildəyib!
Yaxınlarımın sinəsi qalxıb enib,
Uzaqlarımın qulaqları
cingildəyib

5-i 7-ci ay!..
A bay-bay!..

Dan ulduzu görününcə
Dünya nura bürününcə
Pərlər qarı məni tutub.
Nişanımı görüb...
Mamaçalığını unudub.

Qışqırıb: – Oğlan!..
Kişi imış doğulan!

5-i 7-ci ay!..
A bay-bay!..

O kasıbçılıqda
nənəm nəmər verib.
Birinə üzük bağışlayıb,
birinə kəmər verib...

5-i 7-ci ay
A bay-bay!..

Doğulan günündür, yay oğlu!
Vaqif Aslan Cumay oğlu

*05 iyul 2007-ci il*

## Yaddaş-dərin, daş ağır...

İnsan bünövrəsində Adəm-Həvva daşı var.
Məndə də bu səbəbdən mənədək olanların
yadı var, yaddaşı var.

Yaddaş-dərin, daş ağır...
Gözlərimdən yaş axır.

Gör, mənim daşım üstə neçə daş qoyulacaq.
Yadım-yaddaşım üstə yad-yaddaş qoyulacaq.

Hündür olacağam mən
Daim özüm-özümdən.

*22 noyabr 2016-cı il*

## İnsan balası

Atın balasından daha gözəlsən.
Amma ki, at kimi kişnəməyin var...
İnsan balası!

İtin balasından daha gözəlsən...
Hayıf ki, it kimi dişləməyin var...
İnsan balası!

Gah cılğı ağılsan, gah cılğı hissən.
Mələksən, şeytansan, cinsən, iblissən.
Yaxşısan ki, yaxşı, pissən ki, pissən!
İnsan balası!

Neynəyim, qoynuma alımmı səni,
İnsan balası?
Ayağım altına salımmı səni,
İnsan balası?

Onsuz da gözəldir, balalar bütün!
Səndən uzaq olsun bəlalar bütün!
İnsan balası!

*14 sentyabr 2015-ci il*

## Dostlarım

Öydüm, yenə doymadılar dostlarım...
Söydüm, yenə doymadılar dostlarım.
Acığımdan kəndir aldım özümçün...
Qoymadılar, qoymadılar dostlarım.

Bəziləri çevrildilər, döndülər...
Yağı damıb qurtardıqca titrəyən
Çıraq kimi öləziyib söndülər.
Bəzi vaxtlar paltar kimi atılıb,
Bəzi vaxtlar geyildilər dostlarım.
Sürtüldülər, yeyildilər dostlarım.
Salam – kəlam yoxa çıxdı bir anda.
Sanki dostum deyildilər dostlarım.

Vaxtlı-vaxtsıx vaxtımı da aldılar.
Çəkib məni vaxtsızlığa saldılar.
Qarışqatək daraşdılar canıma...
Ac qurd kimi susadılar qanıma...
Doymadılar, doymadılar dostlarım.
Gedib aldım darağacı özümçün...
Deyəcəkdim axır ki, son sözümü.
Öz əlimlə asacaqdım özümü.

Qoymadılar, qoymadılar dostlarım.
Ölüm nəydi, axır mənə onu da
Qıymadılar, qıymadılar dostlarım.

*14 may 2013-cü il*

## Ürəyini

Səbəbsiz-filansız qaralsa qanın,
Ağ-ağ vərəqlərə yaz ürəyini.
Sabah olmayacaq bu günkü canın,
Deyirəm ki, incit az ürəyini.

O sənə lazımdır, sən ona lazım,
Yeri var birlikdə çəkilən nazın.
Hər sözü söz edib, mənim sözbazım,
Gəl, nasaz eləmə saz ürəyini.

Çoxu ürəyini gizlədir, danır.
Sanır ki, ürəkdir-ətdir, nə qanır.
Görmürsən,soyumur, yanır, hey yanır?
Yanar ürəyimə bas ürəyini!

Mən ayrı, sən ayrı,.. deyib çox zaman!
Özün öz qəlbini sındırma, aman!
Səndə yer yoxdursa, ey qansız insan,
Gəl, mənim sinəmdən as ürəyini!

*22 aprel 2015-ci il*

## Arasında

Yaranandan hədd qoyulub
Gecə-gündüz arasında.
Pozulmaz sərhəd qoyulub
Əyriylə düz arasında.

Hər gün bir günü haqladım,
Gah sevindim, gah ağladım.

Yatanda da üz saxladım
Yastıqla üz arasında.

O kəsin ki, səbri dardır,
Yay vaxtı da yolu qardır.
Bir əlli də daha vardır
Əlliylə yüz arasında.

*06 fevral 2015-ci il*

## Mənimki deyildi ki, bu dünya məndən qabaq

Mənimki deyildi ki, bu dünya məndən qabaq,
Elə məndən sonra da mənimki olmayacaq.
Görsən ki, mən çaşmışam,
Özümü də aşmışam,
Dünyanı iki əlli tutmuşam, buraxmıram,
Sözə-sova baxmıram...
Kəs mənim əllərimi, dünyanı əlimdən al.
Aldınmı, qeydinə qal.
Amma sanma bu, dünya əllərində qalacaq,
Onu sənin əlindən alasılar alacaq.
Asıllaşıb qalma, gəl, çuğulların sözündən,
Qalxmayıbdır düşsənlər bu dünyanın gözündən.

*22 avqust 2015-ci il*

## Bilməsən

Görəmməzsən öz-özünü,
Özündən qaça bilməsən.
Geri dönüb öz-özünə
Bir ayaq aça bilməsən.

Qayğıların aşar-daşar.
Dərdlərin başından aşar.
Yolun yollara dolaşar
İzinlə qaça bilməsən.

Dünya budur!.. Bax kefinə.
Gülmə sevinə-sevinə.
Qəbir adlı haqq evinə
İşıq, nur saça bilməsən.

*05 mart 2017-ci il*

## Səndən yuxarı

Oğlum da, qızım da, nəvələrim də
Dayanıb durublar məndən yuxarı.
Çən, duman içində olan dağların
Zirvəsi dumandan, çəndən yuxarı.

Balam, inciyirsən mənim nəyimdən?
Çox şey asılıdır sənin səyindən.
Qalx, Ulu Tanrının tut ətəyindən
Gör, nə aləmlər var səndən yuxarı.

*03 avqust 2015-ci il*

## Yanğısı

Deyim ki, soyuq olsa da,
Buz da adamı yandırır.
Sizdən uzaq buz yanğısı!

Sərtləşdikcə, bozlaşdıqca
Üz də adamı yandırır,
Göz də adamı yandırır.
Bizdən uzaq üz yanğısı!
göz yanğısı!

Geyilməyən pəsə qalar,
Yeyilməyən nəhsə qalar.
Deyilməyən nəsə qalar,
Bitməz, bitməz söz yanğısı.

Bilir məni yanıqlılar,
Yanğısından tanıqlılar.
Özgələrə nə dəxli var?
Hər bir kəsə öz yanğısı.

*25 avqust 2015-ci il*

## Yerin xəbərdarlığı

Ey insan, burnunun tuşuna getmə!
İnsansan, insan ol, bəsdir, ağ etmə!
Mən yerəm, torpağam, ananam sənin,
Ananam, canına yananam sənin.
Hirsimdən yırtılıb sökülə billəm,
Qoparaq başına tökülə billəm.
Top kimi ataram, tutaram səni.
Kənd-kənd, şəhər-şəhər udaram səni.

Mən yerəm, torpağam, yetirənəm mən.
Bitən hər nə varsa, bitirənəm mən.
İtən hər nə varsa, itirənəm mən.
İndi sözünmü var, de, görüm nədi?
Göydən nə yağdı ki, yer götürmədi?
Göydən yağanı da götürənəm mən.
Mən yerəm, torpağam, tanı sən məni,
Süpürüb aparar sularım səni.
Nə var bu dünyada pislikdən asan?
Olarsan olmamış kimi, ey insan!

*07 sentyabr 2015-ci il*

## Ey adam!

Ağ adam!
Qara adam!
Sarı adam!
Adam olun!
Barı, adam!

Olmursunuz, çıxın, gedin
bu zamandan, bu eradan!
Haray salıb bağıraqmı?
Yrə adam çağıraqmı
Aydan, Marsdan,
Veneradan?

Gəlib, sizə nə verəcək göydəkilər
Ögeydirsə sizdən ötrü öydəkilər?
Nədən yerli saymırsınız özünüzü
dogma yerdə?
Bəyəm yerli olacaqsız
Saturnda, Merkuridə, Yupiterdə?

Başınıza dəysin sizin
Ayınız da, iliniz də.
Sizdən adam düzəldəndə
çiylik qalıb gilinizdə.

Ağ adam!
Qara adam!
Sarı adam!
Adam olun!
Barı, adam!

Yaradanın kürəsində
bişin bir də!
Düşün adam qaydasına,
düşün bir də!
Ondan sonra
doğmalaşar
İnsan üçün
göy də, yer də.

*06 dekabr 2018-ci il*



*Bəstəkar Qalib Məmmədov, norveçli musiqi professoru Elizabet Aanye, şair Vaqif Aslan. Bakı, noyabr 2002-ci il*

## Mənim əzizim

Mənim gördüyüm şey, mənim əzizim!
Bir gün xeyir olur, bir gün şər olur.
Toplayıb çıxıram, vurub bölürəm ...
Gecəm gündüzümə bərabər olur.

Gülüşüm süzülür gün işığından,
Sevincim göz yaşım qədərindədir.
Rəng aldım rənglərin qarışığından,
Olanım, olmazım çox dərindədir

Çoxun çox, azın az tarazlığında
Gün dönür, Ay dönür, ulduzlar dönür.
Çəkir bir-birini qaranlıq, işıq,
Sönənlər yandıqca yananlar sönür.

Bərabər yaranıb hər şeyə hər şey,
Təndir ağlımıza hissimiz bizim.
Bu dünya nə qədər bizimkidirsə,
O qədər bizimki deyil, əzizim.

Bir bütöv yaranır iki yarıdan,
Bir yarı mənəmsə, bir yarı sənsən.
Bu günkü məlumsan, sabahkı məchul ...
Hər necə olsan da, özünə tənsən.

*28 oktyabr 2015-ci il*

## Dialoq

**I**

– Vaqif Aslan, Əli pisdir deyirlər ...
– Əli pisdir... Vaqif Aslan neyləsin?
Qoy başını qabağına, fikirləş!
Əlidirmi Əlilərin hamısı?

– Vaqif Aslan, Vəli pisdir deyirlər.
– Vəli pisdir... Vaqif Aslan neyləsin?
Qoy başını qabağına, fikirləş!
Vəlidirmi Vəlilərin hamısı?

**II**

– Vaqif Aslan, çox adamlar düz demir ...
– Vaqif Aslan neynəsin ki, düz demir?
Qoy başını qabağına, fikirləş!
Düz deyirmi düz deyənin hamısı?

– Vaqif Aslan, söz deyən bir söz demir.
– Vaqif Aslan neyləsin ki, söz demir?
Qoy başını qabağına, fikirləş!
Söz deyirmi söz deyənin hamısı?

**III**

– Vaqif Aslan, dünən səni söydülər.
Sən ki məni söyməmisən, çox sağ ol.

– Vaqif Aslan, söydükcə də öydülər.
Nə yaxşı sən öyməmisən, çox sağ ol.

– Vaqif Aslan, Vaqif Aslan, filankəs!
– Ay filankəs, bəsdir daha, bəsdir, kəs!

*13 yanvar 2016-cı il*

## Aranla dağın söyləşməsi

Aran dedi: – El bilir, dağdan aran yaxşıdır.
Dağ dedi: – Göstər görüm, məndən haran yaxşıdır?

Aran dedi: – Yaxşı bax, don geymişəm lalədən.
Dağ dedi: – Baxammıram, göz yaşım şəlalədən.

Aran dedi: – Heyləcə bax sinəmə, yan, yaxıl.
Dağ dedi: – Qıtmır olma, ay qıyımsız, ay paxıl.

Aran dedi: – Görürsən? Yazın da məndən keçir.
Dağ dedi: – Heç demirsən nazın da məndən keçir.

Aran dedi: – Bilmirəm nədəndir sənə meylim.
Dağ dedi: – Varsa meylin, de görüm, sənə neylim?

Aran dedi: – Görməsəm hər gün səni, sıxıllam.
Dağ dedi: – Can, sıxılma, sən olmasan, yıxıllam.

Aran dedi: – Baxmadın gəncliyimə, yaşıma.
Dağ dedi: – Baxdığımdan qar ələndi başıma.

Aran dedi: – Bu şair deyir: – Öpüm gözündən!
Dağ dedi: – Çıxmaq olmaz Vaqif Aslan sözündən.

*19 yanvar 2016-cı il*

## Nəvəm Tuncərə

Dünya bizdən qabaq da əcəb yuxuydu, nəvəm!
Hamı varıydı, ancaq heç kim yoxuydu, nəvəm.
Var olanlar var idi, amma yox üzərində...
Çoxlar az üzərində, azlar çox üzərində...
Dünya barmaq ucunda, dünya ox üzərində
dönürdü, fırlanırdı...
Hər şey dolub daşırdı, hər şey sıfırlanırdı.
Yat, başın dizim üstə!
Oyan, gəz üzüm üstə.
İzin qoy izim üstə!
Var olanlar yuxunda yox kimi görünməsin.
İynələr damarında ox kimi görünməsin.
Yuxunun da ömürtək şirini, acısı var...
Uşağın uşqunmağı, böyüyün "çıs-çıs"ı var.
Sanma ki, həkim gəlib dərdin azalacaqdır.
Qanını bilmək üçün səndən qan alacaqdır.
Neynəyək üzülübdür canımız can ucundan.
Canlar öləziyibdir bir damcı qan ucundan.
Dünya bizdən qabaq da şirin yuxuydu, nəvəm!
Hamı varıydı, ancaq heç kim yoxuydu, nəvəm!

*26 iyun 2015-ci il*

## Öləziyir

Damarda dolaşan işıq olsa da,
Elə ki, azalır, qan öləziyir.
Sönür çıraq kimi gözlərin nuru,
Əl-ayaq soyuyur, can öləziyir.

Əyil bu körpəyə, üzərində əs,
Dərd çəkən dərdini oxşamazmı bəs?
Ömründə-günüdə əyilməyən kəs!
Burda şöhrət ölür, şan öləziyir.

Düyün də düşəndə bir anlıq düşür.
Xeyirin özündə də yamanlıq düşür,
Bəzən səhər-səhər qaranlıq düşür,
Dumanlar içində dan öləziyir.

*04 aprel 2015-ci il*



*Gülüşünə quzu kəsim*

## Baba və nəvə

Dayanıbdır qabaq-qənşər
İki nəfər.
Baba, Nəvə
Biri qabıq, biri nüvə.

O nəvənin babası var.
Bu babanın nəvəsi var,
Kimin belə təbəssümü,
kimin belə nəfəsi var?

Baba-nəvə olan yerdə
Yaddan çıxır umu-küsü.
Olsa-olsa belə olur
Səadətin görüntüsü.
Səadətin görüntüsü.

*21 may 2016-cı il*

## Tuncər-Röyal dostluğu

Bu oğlan Şəkilidir...
O oğlan Gəncəlidir...
Babaların sözüylə,
Nənələrin gözüylə
O, aslan təbiətli,
Bu, polad pəncəlidir.

Görüşüb dost oldular
onlar xəstəxanada.
Sevindi bu dostluğa
baxıb ata, ana da.

Ürək-dirək verdilər
bir-birinə uşaqlar.
Dəmir iradəliymiş
bu qəlbi yumuşaqlar.

Uğurla da çıxdılar
tibbi əməliyyatdan.
Elə buydu bizim də
istəyimiz həyatdan.

Hesab etməyin daha
adi xəyal dostluğu!
Baxın, görün ki, nədir!
Tuncər-Röyal dostluğu!

*17 aprel 2016-cı il*



*Bakı, Respublika Klinik Xəstəxanası. Röyal və Tuncər.*
*Bakı, 10 aprel 2016-cı il*

**I**

***Qeyd: Mənim "Ruhlarla söhbət" kitabım 1997-ci ildə "Ozan" nəşriyyatında çap edilmişdir. Onun bir nüsxəsini ustadımız Bəxtiyar Vahabzadəyə hədiyyə etmişdim. Bir müddət keçəndən sonra böyük şair mənə dedi ki, sənin "Qəbirqazan" şeirin qeyri-adi şeirdir. Lakin orada hər şey deyilməmişdir. Mən sənə bu mövzuda şeir həsr edəcəyəm, amma inciməyəsən. Axı, mövzu ağır mövzudur. Mən həyəcanlandım. Böyük şairdən bu sözləri eşitmək mənim üçün ən böyük mükafat idi. İndi mən həm özümün, həm də Bəxtiyar Vahabzadənin şerini oxuculara təqdim edirəm.***

## Qəbirqazan

Külüngü, kürəyi qoyub yanına,
Qucub dizlərini göy otun üstə.
Nə fikrə getmisən, a Qəbirqazan?
Dərin dəryalardan xəyalın dərin...
Qazılan torpağa, açan yarpağa
Nə böyük heyrətlə baxır gözlərin?!
Günahmı etmisən, a Qəbirqazan?

Gün düşüb, alnında çiçəkləyib tər,
Gün aydın, usta!
Allah uzadaydı sənin ömrünü,
Bu göy çəmənlikdə bir bahar günü
Mənim də qəbrimi qazaydın, usta.
Amma yorulmusan, bir azca dincəl!

Mən də bu güllərə sürtüm üzümü,
Əsən küləklərə qoşum özümü,
Dostumun oğlunun toyuna çatım.
Düşür sümüyümə zurnanın səsi,
"Cəngi"si, "yallı"sı, "tərəkəmə"si,
Bir hava çaldırıb, bəlkə oynadım.

Şıtqa vur, ovça çal, döyülsün qaval!..
Onsuz da bu dünya oynadır məni.
Gözümü açmağa vermiyir macal,
Oynada-oynada göynədir məni.

Nə yazıb – xoş yazıb o Taleyazan.
Sən də çox düşünüb özünü yorma.
Mən – qəbir yiyəsi, sən – Qəbirqazan...
Qucub dizlərini, boynunu burma.

Onsuz da ölənin qəbrini qazmaq
Qaydadır, aqətdir, a Qəbirqazan!
Quyu qazmırsan ki, gizlində mənə?!
Söz gəlsin sənə.
Kiş-kiş!..Bizdən uzaq! Yolundan azmaq,
Böyük qəbahətdir, a Qəbirqazan.

Bəlkə, tənha qalmaq səni qorxudur?
Sənə də bir Qəbirqazan tapılar.
Ayıl bu sükutdan, ölüm – yuxudur!
Amandır, qaralma buludlar kimi
Gələndə ilk bahar göy otlar kimi
İnsanın torpaqdan göyərməyi var.
Göyərmək – ləzzətdir, a Qəbirqazan!

*8 may 1988-ci il*

***Bəxtiyar Vahabzadə***
***(16.08.1925-13.02.2009)***

## Məzarçı ilə söhbət

*"Qəbirqazan" şeirinin müəllifi*
*şair* ***Vaqif Aslana***

Çatıb salam verdim qəbirqazana,
Alıb salamımı yana çəkildi.
Dilimdə suallar baxdım mən ona,
Osa börkü ilə tərini sildi.
– Qəbrini qazdığın bu ölülərlə
Əvvəl tanışdınmı?
– Əlbəttə, hələ.
Bəzisi dotumdu…Açılan solar.
Bunların içində qohumum da var.
Bu, mənim peşəmdir, şükür Allaha.
Əli boş getmirəm evə bir axşam.
Bir vaxt bu şəhərdə yaşayanların
Çoxunun qəbrini özüm qazmışam.
Sənin dədəni də dəfn etmişəm mən.
– Deyirsən,məni də dəfn edəcəksən?
– Onu Allah bilər...Allaha yalvar
Sənə də nə vaxtsa qismət eləsin.
Dədənə tikdiyim belə bir məzar.
Dünyada qurd-quşa yem olan da var.
– Axı qəbir qazmaq...
Gülür:
– Nə olar,
"Mənim də qəbrimi qazan tapılar".
– Qəbir qazmaq ilə çörək qazanmaq
Sənə ağır gəlmir?
– Xeyir, mənə bax,

Anlaya bilmirəm düzü, mən səni.
Niyə dəfn etmədin özün dədəni?
– Ölü çox olanda sevinirmisən?
– Çörək ordan çıxır.
– Bayquşmusan sən?
– Mənə vəz eləmə insanlığından.
Çəkməçi çəkməsi alınan zaman
Sevinmir məgər?
Mənimdə əlimin rəncidir axı,
Yan-yana düzülən, bax, bu qəbirlər.
– Doğru buyurursan, zəhmətdir bu da.
– Mənə də bu işi tapşırıb Xuda.
Mənimçün doğulan bütün uşaqlar,
Tikilən binalar, salınan bağlar,
Mələyən quzular, uçan böcəklər,
Əkilən ağaclar, açan çiçəkər
Hamısı ölümdür... –
Deyərək güldü:
– Bax,indi hardasa, kim isə öldü.
--Mən isə deyirəm, indi hardasa,
Kimsə doğuldu.
Atası, anası bəxtəvər oldu.
– Elə qayda qoyub o böyük Xuda,
Axı, gec-tezi var, öləcək o da.
– Bu gün neçəncidir qazdığın məzar?
– Onu deyəmmərəm, saysam göz dəyər.
– Qazancın görürmü xərcini?
– Şükür.
Məm harın deyiləm, xərcimi görür.

İnsanın başına gələn bəlalar
Görmüşəm, həmişə nəfsindən gəlir.
Evimdə gündəlik əppəyim ki, var,
Deməli, xərcimlə qazanc tən gəlir

Ulu Tanrının da öz mizanında
Gəlir də, çıxar da birdir, əzizim,
Ama o kişinin haqq divanında
Savab qiymətimiz başqadır bizim.
Torpaq qalağında bir kəllə gördüm.
Ətim çimçişsə də onu götürdüm.
Soruşdum: – bu kəllə, de, niyə gülür?
– İnsan ürəyində özündən ağır
Daşınan arzuya, diləyə gülür.
– Yuxuna girirmi burda yatanlar?
– Düzünü deyim ki, axır zamanlar
Mənə gileylənir ölülər, yaman
Məzarın onlara dar olmasından.
– Gen tikə bilməzdin?
– Nə fərqi vardır.
– Onlara dar gələn məzarlar deyil,
Dərgahda divara qısnamalardır.

Bu sözün zəhmindən xoflandım bir an.
Baxdım bir qəbirə, bir Qəbirçiyə.
Daldım ürəyimdən məni sarsıdan
Əzəli, əbədi haqqa, gerçəyə.
Düşündüm:dünyada ölüm ki, haqdır,
Ya bu, ya başqası, nə fərqi varmış?
Qəbirlər həmişə qazılacaqdır.
İndi ki, belədir, mənası varmı
Qocaya verdiyim bu sualların?
Sirrini açmağa gücüm çatarmı,
Olumdan ölümə gedən yolların?
Qorxub xoflanırıq bəs onda nədən
Qəbirdən, ölüyə qəbir tikəndən?
Bizi xoflandıran, bizi qorxudan
Məzarda qurtaran sabahımızdır.
Allah dərgahında min bir sorğudan
Cavabsız qalacaq günahımızdır.

Təzədən xoflandm, boylandım göyə.
Bir qəbirə baxdım, bir qəbirçiyə
Dağıtmır, o tikir əslinə baxsan.
O, irəli baxır, geriyə deyil.
Ancaq bir fərqi var: bu mənzilləri
O, ölüyə tikir, diriyə deyil.
O, doğru demirmi ölür uşaqlar?
Ölür daş binalar, bağçalar, bağlar.
Ölür güldən-gülə uçan böcəklər.
Əkliən ağaclar, açan çiçəklər...
Ölməyən təkcə şey: dünən, ya bu gün
Yan-yana tikilən məzarlar imiş...
Ölümün içində ölümsüzlüyün
İmzası var imiş, xətti var imiş...

Baxdım məzarçıya,bir də qəbrə mən,
Qəlbimin nidası çıxdı dilimdən:
Məzar tikən üçün tikdiyi qəbir
Çörək ağacıdır, mənimçün fikir.

*30-31 iyul 1997-ci il*

***Bax. Bəxtiyar Vahabzadə. Bir ömür yuxu. Səh. 149-152. Bakı, "Azərbaycan", nəşriyyatı, 1998.***

## Filosofla şairin deyişməsi
***(1936 – 9 fevral 2018)***

*(Filosof Fərman İsmayılaovla tələbəsi arasında deyişmə)*

**FƏRMAN İSMAYILOV**

Mən köçürəm, qalır dünya,
Məni yola salır dünya.
Vaqif,fikrə dalır dünya,
Sor: – O yönə sözü varmı?

**VAQİF ASLAN**

Mənim əziz müəllimim,
Bu dünyanı kim bilir, kim?
Qırılanda bir sarı sim,
Titrəməyə yüzü vardır.

**FƏRMAN İSMAYILOV**

Bilmədim heç bu nə yoldu,
Gözlərimə tozu doldu.
Duman gəldi, boran oldu,
Sisə,çənə sözü varmı?

**VAQİF ASLAN**

Dünyanın da bizim kimi
Əyrisi var,düzü vardır.
Öz havası,öz iqlimi,
Öz yolu,öz izi vardır.

**FƏRMAN İSMAYILOV**

Anlamadım sirrini mən,
Saçlarıma düşsə də dən.
Ömrümüzdən gəlib-gedən
Aya-günə sözü varmı?

**VAQİF ASLAN**

O, odur ki, odur yenə,
Gəzir qodu-qodu yenə.
Demə itib odu yenə,
Kül altında közü vardır.

**FƏRMAN İSMAYILOV**

Mənsiz dağlar, bağlar yenə
Yaşıllaşar dönə-dönə.
Mən sözümü dedim ona,
Onun mənə sözü varmı?

**VAQİF ASLAN**

Açılandır, solan kimi.
Boşalandır, dolan kimi.
Sənin sözün olan kimi,
Dünyanın da sözü vardır.

**FƏRMAN İSMAYILOV**

Mən bir sirdən doğulmuşam,
Nə yaxşı ki,doğrulmuşam.
Halallıqdan yoğrulmuşam,
Görən,yenə sözü varmı?

**VAQİF ASLAN**

Meyi xoşdur, qədəhi boş,
İçməlisən, nə əs,nə coş.
Bacarırsan özünə qoş,
Gör, neçə cür üzü vardır.

**FƏRMAN İSMAYILOV**

Gördüm, üz vermək hədərdir,
Əzabı dağlar qədərdir.
Dır-dır Fatmadan betərdir,
Dönə-dönə sözü varmı?

**VAQİF ASLAN**

Yırtılıbdır yaşmağımız,
Dağılıbdır başmağımız.
Mənasızdır qaçmağımız,
Üstümüzdə gözü vardır.

**FƏRMAN İSMAYILOV**

Ağla qızım,ağla bacım!
Viran olur həyat tacım.
Nə çarəm var, nə əlacım,
Dağ-düyünə sözü varmı?

**VAQİF ASLAN**

Gedən gülər, gələn ağlar,
Saç yoldurar, sinə dağlar.
Ağ çıxarıb, qara bağlar...
Arşını var, bezi vardır.

**FƏRMAN İSMAYILOV**

Mən Fərmanam, üzüm gülməz.
Gələn gedər, gedən gəlməz.
Mən biləni dünya bilməz...
Yenə mənə sözü varmı?

**VAQİF ASLAN**

Haqq-nahaqdan çapar bizi,
Yoğurduqca yapar bizi.
Bir də çətin tapar bizi...
Baxıb görər özü vardır.

*5 yanvar 2000-ci il*

**II**
**FƏRMAN İSMAYILOV**

Vaqif, getdi gənclik,qocalmışam mən.
Artıq yazı verib, qış almışam mən.
Dostlarım gedibdir,tək qalmışam mən...
Gəl,indi çarə qıl bu çarəsizə.

**VAQİF ASLAN**

Yalandır, kim deyir qocalmısan sən?
Dostun çoxluğundan tək qalmısan sən.
Həmişə yaz verib, yaz almısan sən,
Ən yaxşı çarədir yaz çarəsizə.

**FƏRMAN İSMAYILOV**

Qəlbimi göynədir dərdlər, təzadlar.
Zaman quduzlaşıb üstümdən adlar.

Hayana baxıram – timsahlar, yadlar...
Gəl,indi çarə qıl bu çarəsizə.

**VAQİF ASLAN**

Söz alıb söz satan naşıdır, naşı.
Qurumaz timsahın gözünün yaşı.
Hər yerdə ağırdır aqilin daşı...
Aqillər eyləyər tez çarə Sizə.

**FƏRMAN İSMAYILOV**

Qırmağım gərəkdir çox-çox tilsimi...
Bu "həyatın tacı" bitənə kimi.
Xəyyamın toyunu görəcəyəmmi?
Gəl, indi çarə qıl bu çarəsizə.

**VAQİF ASLAN**

Bəli, yarımçıqlıq acıdır,acı.
Bütövlük istəyir "həyatın tacı".
Əvvəlcə Xəyyama edək əlacı
Çalınsın toy, olsun saz çarə Sizə.

**FƏRMAN İSMAYILOV**

Şəkiynən Bakının arasındayam...
Çaş-baş olanların sırasındayam.
Bilmirəm dünyanın harasındayam,
Gəl, indi çarə qıl bu çarəsizə.

**VAQİF ASLAN**

Şəki də, Bakı da ulu şəhərdir...
Hər biri nur ilə dolu şəhərdir.

Sənin əməllərin ölməz əsərdir,
Sən özün çarəsən yüz çarəsizə.

**FƏRMAN İSMAYILOV**

Çox cəfa çəksəm də, görmədim səfa.
Axtardım, aradım, tapmadım şəfa.
Yox imiş ömürdə, gündə bir vəfa,
Gəl, indi çarə qıl bu çarəsizə.

**VAQİF ASLAN**

Cəfanın axırda səfası vardır,
Səfanın insana şəfası vardır.
Ömrün də, günün də vəfası vardır,
Taleyi göstərsə üz çarəsizə.

*18 may 2000-ci il*

**III**
**FƏRMAN İSMAYILOV**

Vaqif Aslan, qopdu tufan, əsdi küləklər.
Yaman yerdə şaxta vurdu, soldu diləklər.
Yerdə insan narahatdır, göydə fələklər,
Gəl görüşək, halallaşaq, mən gedər oldum.

**VAQİF ASLAN**

Əsən külək şər küləkdir,əsir yalandan.
Əsib gəlir filan tindən, filan dalandan.
Küsürsə, qoy filan küssün filan-filandan,
Sən ki, haqsan, haqq nazilər, üzülməz axı.

**FƏRMAN İSMAYILOV**

Vallah, bizə nə eylədi, zaman eylədi.
Gah komsomol, gah kommunist haman eylədi.
Koroğluyduq,.. Həmzələrdən yaman eylədi,
Qəlbimdə qəm, gözlərimdə çən gedər oldum.

**VAQİF ASLAN**

Bir gün gəldi, boşa çıxdı haqsız gedişlər.
Dövrana da, zamana da qıcandı dişlər.
Nə sənlikdir, nə mənlikdir, bütün bu işlər.
Bu tezlikdə ağardılmaz, çözülməz axı.

**FƏRMAN İSMAYILOV**

Cəfa çəkdim, bir ev tikdim, göz götürmədi...
Halal idi, yad ocaqdan köz götürmədi.
Neynəyim ki, qiymət qoyan düz götürmədi...
Zaman saldı saçlarıma dən, gedər oldum.

**VAQİF ASLAN**

Hər nə gəldi danışanda doğru söz olmaz.
İddiası böyük olan kəsdə üz olmaz.
Vay o kəsin halına ki, ondan iz olmaz,
İziyoxun şıltağına dözülməz axı.

*25 dekabr 2000-ci il*

## Etibar Etibarlının elektron məktubu

***(2.IV.1951, Şamaxı, Kürdəmic – 7.V.2019, Bakı)***

Əzizim Vaqif Aslan!

Elə zənn eləmə ki, dəyişmisən. Elə həminki Vaqifsən. Bir az yaşlaşmısan. Tələbəlik illərimiz yadındadırmı? Səhv etmirəmsə, sən fransız dili, mən isə rus dili və ədəbiyyatı fakultəsində oxuyurduq. (SONRA İNSTİTUT AYRILDI.) İmzana rast gələndə, televiziyada görəndə hədsiz dərəcədə sevinirəm. Səni o dağlar kimi məğrur və əyilməz görüm. Qaynayan ilhamın tükənməsin. Xəstəlik məni yaman yerdə haqladı. Sənə isə möhkəm cansağlığı arzulayıram. Təxminən 20 il bundan əvvəl jurnalist kimi Balakənə gedirdim. Şəkinin tuşuna çatanda yol yoldaşıma dedim ki, bura Mirzə Fətəlinin, Bəxtiyar Vahabzadənin, bir də mənim dostum Vaqif Aslanın Vətənidir. Başın dağlar kimi uca, ilhamın axar sular kimi çağlar olsun, qardaş!

*30 aprel 2016-cı il*

## Etibar Etibarlıya elektron cavab

*(Məzun olduğumuz gündən etibarən rastlaşmadığım Etibar Etibarlının "Skype"də yazdığı "Xəstəlik məni yaman yerdə haqladı" sözlərindən kövrəltdim)*

Yaman yerdə oyatdın yadımı, yaddaşımı ...
İndi ovudum necə ürəyimi, başımı?
"Yoldaş", "Yoldaş" deyirlər, bəs yoldaş yol daşımı?
Yolda qoyub gedələr, Etibar Etibarlı?
Getməyib nə edələr, Etibar Etibarlı?

Fırlandım bu yaşımdan, döndüm, o yaşda oldum.
Yumşaldım ipək kimi, bərkidim – daş da oldum.
Ürəyimlə, başımla yenə savaşda oldum.

Qəlbimdən qaralandım, Etibar Etibarlı!
Başımdan aralandım, Etibar Etibarlı!

Gözüm önündə durdu tələbəlik illəri ...
Küçələrin, yolların qələbəlik illəri...
İndi hayandan tapım o sevdalı dilləri?
İtik var ki, tapılmır, Etibar Etibarlı!
Yıxıq var ki, yapılmır, Etibar Etibarlı!

O illərdə qəlb geniş, nəsə dünya dar idi ...
Allahverdi müəllim Tağızadə var idi...
İsmixan Rəhimovlu dünya bəxtiyar idi.
Ağayev Zeydulla bəs, Etibar Etibarlı?
Ona varmıydı əvəz, Etibar Etibarlı?

Vardı Nəbi Saniyev, xalqın varı idi o.
Bir nəslin öz əslinə etibarı idi o.
Hacı Kərim Sanılı yadigarı idi o.
Zəhmi ağırdı amma, Etibar Etibarlı!
Nə idi bu müəmma, Etibar Etibarlı?

Rasim Kərimli necə, Ənvər Rza necə bəs?
O cürə olmalıydı sevilən kəs, sevən kəs.
Adları çəkilməyən kəslər bizdən inciməz.
Onlar qəlbimizdədir, Etibar Etibarlı!
Sirlər var ki, bizdədir, Etibar Etibarlı!

Şəkiyə yaxınlaşıb Şəkidən yan keçmisən.
Bilməzdim deməsəydin, burdan haçan keçmisən.
Dilində, ürəyində Vaqif Aslan keçmisən.
Etibar səndə imiş, Etibar Etibarlı!
Hamıdan öndə imiş Etibar Etibarlı!

Qax da, Zaqatala da, Balakən də – füsünkar!
O sudan, o havadan, o torpaqdan harda var?
Bu məqamda, bu anda kimdir səndən bəxtiyar?
Alnımızda yazı var, Etibar Etibarlı!
Talenin də nazı var, Etibar Etibarlı!

Dərdini dərdə düşsün, haçandan tapıb səni?
Əsib qara yel kimi qəfildən qapıb səni?
Ağrılar, acılarmı talayıb, çapıb səni?
Dərd də var, dərman da var, Etibar Etibarlı!
Əfvinə fərman da var, Etibar Etibarlı!

Hər ürəkdə göydəki ulduz sanı arzu var
Vaqif Aslan dostuna can sağlığı arzular.
İnsanın ürəyinə bu istəklər, arzular
Öz-özündən dolarmış, Etibar Etibarlı!
Hər nə desən olarmış ki, Etibar etibarlı.

*30 aprel – 3 may 2016-cı il*

## Etibar Etibarlının electron cavabı

*(Gecikmiş etiraf)*

Aldığım söz böxçası dost payıdı – baratdı,
Hər kəlmə ürəyimdə təlatümlər yaratdı.
Nədir bu qopan tufan, nə leysandı, gurşaddı?!
Uzaqda yorğun yatan illərimi oyatdı –
Döndüm üzü dağlara, baxdım, Vaqif Aslanım!
Əridim əlcə-əlcə, axdım Vaqif Aslanım!

Xatirələr kükrəyib, selləndilər gözümdə,
Düymə-düymə açılıb gülləndilər gözümdə
Damla-damla yaş olub göllləndilər gözümdə,
Vaxt-zaman silkələndi – ələndilər gözümdə,
Köynəyində boğulan sazdım, Vaqif Aslanım!

O səsləndi, mən yazdım, yazdım, Vaqif Aslanım!
Ayrıldıq, səpələndik – bir yolluq itəni var,
Yeri behiştlik olsun, dünyadan gedəni var.
Sanki qu nəğməsiymiş, oxunub bitəni var,
Hərənin öz dünyası, öz yurdu, "Vətəni" var.
Üçü dost, beşi boyat, boyat, Vaqif Aslanım!
Düz deyib Molla Cümə – ustad, Vaqif Aslanım.

Vurğundu müdrik Rasim sözə, saza, bilirdim,
Dözməzdi bu qovğaya Ənvər Rza, bilirdim.
Qurulan mağarlara – düşən yasa, bilirdim,
Qışda qübar bağlayan çıxmaz yaza, bilirdim.
Bilmir yara görməyən, bilmir, Vaqif Aslanım!
Tale həmişə gülmür, gülmür, Vaqif Aslanım!

İndi burda buludla yarışır göydələnlər,
Yollar sükuta həsrət, yatmır gedib-gələnlər,
O vaxt utancaq idi sevənlər, sevilənlər,
Üzə çıxıb nə varsa, artıb "çöpə gülənlər",
Korşalır ülvi hisslər, qalmır, Vaqif Aslanım!
Neyləsən yeri dolmur, dolmur, Vaqif Aslanım!

Kimə gərəkdir günün qürubu, ya doğuşu?!
Damlardan yerə düşmür şəfəqlərin yağışı.
Nə bitir, nə tükənir "maska"ların yarışı,
Laqeydlik perik salıb yaz gələn qaranquşu,
Eyvanda yuva qurmur, qurmur, Vaqif Aslanım!
Şəhərə bel bağlayıb durmur, Vaqif Aslanım!

Heç nəyə dəyişmədin dağların havasını,
Kişin hərdən qəzəbli, gah həzin nəvasını.
Daddırdın dostlarına nemətlərin xasını,
Qoxladın çiçəklərin, güllərin butasını,
Şeirin də ətir saçır, ətir, Vaqif Aslanım!

Gələndə bir dəstə tut, gətir, Vaqif Aslanım!
Ömrü yaradan verir, baş əymək xilqətindir,
Yaşa, xoş sədan gəlsin, nə qədər qismətindir.
Şairəm deyib, sənə şeir yazmaq çətindir,
Beş-üç kəlmə yazdıran o dost məhəbbətindir.
Qəbul elə ürəklə, elə, Vaqif Aslanım!
Sonu belə alındı, belə, Vaqif Aslanım!

*11 may 2016-cı il*

## Yazırsan

*Barat Vüsal (AYB Qazax bölməsinin sədri)*
*(Mütəfəkkir şairimiz Vaqif Aslanın 60 illiyinə)*

Şairim, ilahi eşqə bağlısan...
Dadandan, o camdan, şeir yazırsan.
Cana cəfa verir Canan yolunda,
Canana sən candan şeir yazırsan.

Yetişər Musaya Turdan əvəzi.
Günəş axtarırsan, nurdan əvəzi.
Qurbanlıq gəzmirsən qurban əvəzi.
Pərvanəsən, şamdan şeir yazırsan.

Səs verdin dostların çağırışına...
Çıxdın pişvazına, çıxdı qarşına.
Qədim Qobustanda Qaval Daşına
Əllərin yatandan şeir yazırsan.

Dinirsən, ...avazın Azərbaycandır.
Xoş sözün, Daş Sazın Azərbaycandır.
Nə yazsan, baş mövzun Azərbaycandır.
Çox sağ ol, Vətəndən şeir yazırsan.

Keçmişlərə sən səyahət edirsən.
Gələcək günlərlə ülfət edirsən.
Edəndə "Ruhlarla söhbət" edirsən.
O daddan, o tamdan şeir yazırsan.

Xalqın ruhundasan, ağılındasan.
Elin cahılında, ahılındasan.
Dünyanın əvvəli, axırındasan.
Adəmdən, Xatəmdən şeir yazırsan.

Ömrünün 60-ı arxada qaldı.
Gəlirəm arxanca altımış ildi.
Qazaxda bir adın Barat Vüsaldı.
Şəkidə sən məndən şeir yazırsan.
Bəlkə də, sən mənnən şeir yazırsan.

*01 avqust 2010-cu il*

***P.S. Bədahətən yazıldığım üçün şeirin üzünü köçürmədim***

## Vaqif Aslanı

Bilsəniz, ox olub yay axtarıram...
Versəniz, bəsimdi Vaqif Aslanı.
Görsəniz, loğmana ehtiyacım var...
Görsəniz,.. bəsimdi Vaqif Aslanı.

Tanıyıb bilərsiz hər kim necədir...
Onda bilərsiniz ərkim necədir.
Bilmək istəsəniz, kefim necədir...
Sorsanız, bəsimdi Vaqif Aslanı.

Son nəğməmi oxur qu ürəyimə...
Oddamı? Çiləyir su ürəyimə.

Ürəyi həq kimi bu ürəyimə
Tərtəmiz bəsimdi Vaqif Aslanın.

Deməyin Kiş hara, Kosalar hara?
Deyin ki, olanda dost belə ola.
Görməyə ya Kişə, ya Kosalara
Varsanız, bəsimdi Vaqif Aslanı.

*"Kredo" qəzeti, səh.16.*
*1-8 mart 2014-cü il*

## Gün aydın

*Şair dostum Barat Vüsala cavab*
*(Şair dostum Barat Vüsalın 70 illiyinə)*

Hörmətli, adlı şair!
Barat Vüsal, gün aydın!
Yaddaşlı, yadlı şair!
Sözü qanadlı şair!
Barat Vüsal, gün aydın!

Oldun yaz gecə-gündüz
Tarazlığı anında.
Tanrı eşqi çağladı
Damarında, qanında.

Qoşuldun mələklərə
Fələklərə uçdun, ey!
Ulduza sığal çəkib
Günəşi də qucdun, ey!

Yer gəmidə yer tutub
Göy dənizdə üzürsən.
Suları, sahilləri
Heyran-heyran süzürsən.

Yaranışdan bu dünya
Gözəldir, Barat Vüsal!
Söz dünyanın özündən
Əzəldir, Barat Vüsal!

İşığını, nurunu
Bütün aləmə yaydın.
İşıqlandı bu dünya
Barat Vüsal, gün aydın!

*21 iyul 2021-ci il*

## Yusif Savalana Vaqif Aslan təbriki

Yaşın mübarək olsun, Yusifim – Savalanım.
Xocalı xiffətiylə məni məndən alanım.
Allah qismət eyləsin, görüşək Xocalıda!
Sən kükrə Araz kimi, mən Kürtək havalanım!

## Yusif Savalanın cavabı

Çox təşəkkür edirəm, ey Vaqifim – Aslanım,
Əziz tələbə dostum, mənim ürəyim, canım,
Bilirsən ki, əzəldən sənə qaynayıb qanım,
Sözlərini oxudum. çoxaldı həyəcanım,
Xocalıdan uzaqda az qalmışam paslanım,
O nə zaman qayıdar, mən nə qədər yaslanım?



*Bakı, 1973. 1 May nümayişində. Solda – Vaqif Aslan,*
*Sağda – Yusif Savalan*



*Bakı, 1973. 1 May nümayişində.*
*Vaqif Aslan və Yusif Savalan tələbə dostları arasında*

## Vaqif Aslanın Hasan Kallimciyə məktubu barədə

Hasan Kallimci'nin Şeki şehrinden 1902 yılında göç ederek, Denizli'de Akhan adlı köyü kuran Azerbaycan Türklerini anlatan yazısı, "Geçmişten Günümüze Denizli" dergisinin Aralık 2014 tarihli nüshasında yer almış, dergi Şeki'ye de ulaştırılmıştı. Azerbaycan Yazıcılar Birliği'nin Şeki Bölümü Başkanı Şair-Yazar Vaqif Aslan, o yazıyı okuyunca duygulanarak, gönderdiği e-posta ile dergi yönetimine teşekkür etmiştir. Vaqıf Bey, aynı e-posta ile 2012 Eylül'ünde Şeki'de tanıştığı Kallimci'ye yazdığı şiiri de göndermiştir. İşte Azerbaycan'dan gelen "Ay Hasan" adlı şiir**:**



*H.Kallimci tərəfindən çəkilən foto*




*Hasan Kallimci "Zaman və ədəbiyyat dilemması qarşısında" kitabımı Pamukkale Universitesinin kitabxanasına təqdim edir*

## Ay Hasan!

***– Qardaşım, Hasan! Qəlbinə və ruhuna eşq olsun!***

Mən bu dərdi udamadım, ay Hasan!
Göz yaşımı tutamadım, ay Hasan!
Qafqazlarda budaq-budaq budandım,
Budayanı budamadım, ay Hasan!

Var idim ki, bəd gözlərə ox idim,
Yazdığını dönə-dönə oxudum.
Hər sözünü yaddaşıma toxudum.
Soyuqqanlı ötəmədim, ay Hasan.

Nə fərqi var, ya Şəki, ya Dənizli?
Gündüzü gün, gecəsi Ay bənizli.
Hər ikisi tən addımlı, tən izli...
Gələmədim, gedəmədim, ay Hasan!

Rəvadırmı dərd içində yaslanım,
Yerə düşüm, ayaq altda paslanım?
Alpər Tonqa'm, Mətə'm və Alp Arslan'ım...
Mən ki ölüb itəmədim, ay Hasan!

Söyləyərsən görsən İmdat Avşarı,
Bu dünyada yoxdur onun oxşarı.
Doğmalara ödəyəsi borcları
Layiqincə ödəmədim, ay Hasan!

Vaqif Aslan sədaqəti bol istər,
Bərk ayaqda bükülməyən qol istər.
Amma o gün sən gəldiyin yol üstə,
Çınar olub bitəmədim, ay Hasan!

*Şəki, Kiş kəndi.*
*Azərbaycan, 26 mart 2015-ci il*

***Bax. Tarih Kültür Toplum Ayca Günkut Vurucu armağanı. Səh. 282. Hazırlayan: İkbal Vurucu. Eğitim yayınevi, Konya, Ağustos-2016. 544 s***

## Hasan Kallimcinin Vaqif Aslana cavab məktubu

**P.S.** Hasan kallimci yazır: "Vaqif ASLAN kardeşimin, şahsıma yazdığı ve "Şeki Belediyyesi" gazetesinde yayımladığı "Ay Hasan" adlı şiir, Türk dünyası aşığı şahsımı ziyadesiyle duyğulandırmışdır. Bu şiiri ve karşılık olarak yazdığım "Ay Vaqif" şiirimi kardeş gönüllerin kaynaşmasının belgeleri olarak paylaşıyorum:

## Ay Vaqif!

Alev topu dertler bizi çok gerdi ...
Ağlattı, inletti, yerlere serdi.
Kişi kardeşiyle paylaşır derdi...
Görüşelim, konuşalım, ay Vaqif!
Derdimizi paylaşalım, ay Vaqif!
..................................................
Tür'kün derdi hem çok, hem de çok büyük...
Taşırız omuzda, saymayız ki yük!
Nerede var ise hüznlü bir türk

Göz yaşını biz silelim, ay Vaqif!
Yarasını biz saralım, ay Vaqif!
.....................................................
Türkiye'miz ile Can Azerbaycan
Arasına bıçaq gibi sokulan
Ermeni'yi çıkaralım aradan.
Karabağ'a kovuşalım, ay Vaqif!
“Şol Revan'da buluşalım, ay Vaqif!
........................................................
Aras var ya Aras, onun güneyi
Hasretiyle yakar nice sineyi.
Kabul etmiyorum ayrı kalmayı!
“Bütöv Azerbaycan” benim muradım!
Şu sınırı kaldıralım, ay Vaqif!
............................................................
Karaçay – Malkarla tanışmak için...
Kumukla, Avarla karışmak için...
Çeçenle, İnguşla kaynaşmak için
Kafkas Sıradağları'nı aşalım!
Mingi Tav'da buluşalım, ay Vaqif!
.........................................................

Yedi devlet ve bir millet olmuşuz...
Özerk nice kardeşleri bulmuşuz...
Dünya üzre yerimizi almışız.
Ayaqları yere sağlam basalım!
Hesabları tam yapalım, ay Vaqif!
.....................................................
Hep yüksekte dalgalansın Ay-Yıldız!
Gönderinden hiç inmesin Ay-Yıldız!
Bayrak kölgesinde yaşlı, bala, kız...
Türkcemizi konuşalım, yazalım....
Töremizi yaşatalım, ay Vaqif!

Farkı yoktur Bakü ile İzmir'in...
Farkı yoktur Denizli'yle Şeki'nin.
Şehrinde, köyünde iki ülkenin
Karşılıklı oturalım, kalkalım...
Gezip, görüp yaşayalım, ay Vaqif!

Türkiye'den Oğuz soylu Ozan'ım..
Türkü söyler, destanları yazarım.
Nerede Türk varsa, orda yaşarım.
Tuzakları, oyunları bozalım...
Su Turanı konuşalım, ay Vaqif!

*Denizli/TÜRKİYE, 09 may 2016-cı il*

***Bax. Tarih Kültür Toplum Ayca Günkut Vurucu armağanı. Səh. 283-284. Hazırlayan: İkbal Vurucu. Eğitim yayınevi, Konya, Ağustos – 2016. 544 s.***

# Urmiyada görüş

(9-11may 2011-ci il tarıxdə İranda – Güney Azərbaycanda Urmiya Universitetində Türkiyənin Yüz Yıl Universiteti ilə birgə keçirilən **"Çelebi Hüsameddin-iUrmevi ve Mesnevi-i Manevi" I uluslararası simpoziumu**nun Quzey Azərbaycanı təmsil edən işti-rakçılarından biri də mən idim. Mənim orada olmağımdan xəbər tutan Təbrizli dostlarım – Seyid Məhəmməd Çavuşian və Ağayi Əli Sübhani simpoziumun ilk gününün günorta çağı mənə bir səbət Təbriz çiçəkləri gətirərək görüşümə gəlmişdilər. Mən ömrümdə o qədər ətirli çiçəklər görməmişdim. O nadir gül səbətini simpozumun Quzey Azərbaycanı təmsil edən qadın iştirakçılarına – Nüşabə Araslı, Leyli Əliyeva, Xədicə İsgəndərli və Aida Şükürlüyə bağışladım.

Seyid Məhəmməd Çavuşian mənə oxumaq üçün bir kağız uzatdı. Kağızda Azərbaycan latın əlifbası iləyazılmışdı:

Vaqif Aslan kimi şair ayaq qoyub ölkəmizə.
Sanki bir gündü çıxıb, işıq salıb kölgəmizə.

Seyidin mənə mənalı-mənalı baxdığını görüb kağıza daha iki beyt əlavə etdim:

Nə qədər dünya durur dosta sədaqət də durur.
Əhdinə sadiq olan daxil olar cərgəmizə.

Seyidin bir sözünə başımı qurban verərəm.
Söz dönüb qanun olar, yermi qalar bəlkəmizə?

Kağızı hər üçümüz imzaladıq. Kağız məndə qaldı.



Seyed Mohammad

V. Aslan

09.05.2011

## Təbrizdə görüş

Urmiyadan qayıtdıqdan bir neçə ay sonra – 2011-ci il avqust ayının ortalarında dostlarımın təkidi ilə Təbrizə getdim. Ədəbi məclislərdə oldum. “Firdövsi əncümən” məclisində Seyid Məhəmməd Çavuşian bayatıları elə bir tərzdə ifa etdi ki, birinci iki misrası adi qayda ilə deyilən bayatıların sonrakı iki misrasındakı ritm və ahəng sanki ürəyimi çəkib yerindən çıxardı.

### Təbrizli Seyid Məhəmmd Çavuşianın oxuduğu bayatılar

Dağlara çən düşəndə...
Sünbülə dən düşəndə...
Ruhum bədəndə oynar
Yadıma sən düşəndə.

Dağlar başı tütündü,
Kimin bağrı bütündü?
Əyil, üzündən öpüm...
Dünya ölüm-itimdi.

Qızıl gül oyum-oyum...
Dərim eyvana qoyum.
Yağış yağar, yer doymaz...
Mən səndən necə doyum?

Qərənfil abı gərək,
Yar yarın babı gərək.
Zərrəcə eşqi olanın
Dəryaca tabı gərək.

## Təbrizli Seyid Məhəmmd Çavuşianın oxuduğu bayatılara cavab

"Dağlara çən düşən" dəmdə oynaram.
"Sünbülə dən düşən" dəmdə oynaram.
Necə oynamasın ruhum bədəndə?..
Ruhum da oynayar, mən də oynaram.

Oldum ki, olumdu-ölümdü dünyam,
Gah açan, gah solan gülümdü dünyam.
İstədim "əyiləm, üzündən öpəm
Şüşətək ikiyə bölündü dünyam.

"Qızıl gül" açdıqca "oyulub" gedər.
"Dərilər, eyvana qoyulub" gedər.
Yağan yağışlardan yer doya bilməz,
Amma bağrınacan oyulub gedər.

Sən Təbriz ləhcəli bir bülbül kimi
Oyulmuş qəlbimi oyma, qardaşım!
Mənim ürəyimi dərib gül kimi
Ovuclar icinə qoyma, qardaşım!

Hər yerdə “qərənfil abı”olurmu?
Həmişə “yar yarın babı” olurmu?
Bəs eşqi dəryaca olan kəslərin
Olursa, “zərrəcə tabı” olurmu?

“Dağlara çən düşən” dəmdə oynaram.
“Sünbülə dən düşən” dəmdə oynaram.
Oynayan deyiləm hər deyəndə mən,
Dostlar yada düşən dəmdə oynaram.
Necə oynamasın ruhum bədəndə?..
Ruhum da oynayar, mən də oynaram



*Rəsul Ilməddinoğlu, Vaqif Aslan, Ağayi Əli Sübhani,*
*Seyid Məhəmməd Çavuşian. Mirəli həkim Seyidgildə.*
*Təbriz, avqust 2011-ci il*



*Seyid Məhəmməd Çavuşian Şəkidə.Oktyabr 2012-ci il.*
*Soldan: Baba Muradxanlı, Rəsul İlməddinoğlu,*
*Seyid Məhəmməd Çavuşian, Vaqif Aslan, Akif Salam*

***Səməd Məcid Səbbaqi İrani "Yalqız" təxəllüs***
***("Göz yaşları içində gülən şair" adı ilə tanınır, tənznəvisdir.)***
***(Hicri: 1316-1391, miladi: 1937-2012-ci illərdə yaşamışdır)***

## Kimdi bu xilqəti gündən-günə gülləndiriri?

*(Şeir Təbrizli Seyid Məhəmmd Çavuşian tərəfindən*
*mənə 05.03.2011-ci ildə təqdim edilmişdir)*

Kimdi bu xilqəti gündən-günə gülləndiriri?
Göyü göy üstə qalir, göylərə milləndiriri.

Kəşf olduqca fəzalər, tazalıqlar görünür
Bu gözəl xilqəti kimdir belə gülləndiriri?

Bu səs hardandı, varam mən, gəliri hər yandan
Yaxud kimdiir ki, içimdən məni dilləndiriri.

Mən kiməm, varlığım oddu, sudu, topraqdı, hava...
O qoşub sazımı köklür, bəmi zilləndiriri.

Vardı o, mən də varam, bağlıdı bu varlıq ona.
O mən heyətdə özün aləmə bəlləndiriri.

Pay verib insana, öz cövhərəsindən də qatıb.
Verdiyi elm ilə ülviyyətə pilləndiriri.

Bu necə badədi ki. hammı içir bir küpdən?
Huşu başdan eləyir, min cürə lülləndiriri?

Hərə bir yanda düşüb başlayır hədyan deməyə.
Dəmbədəm püflür özün ərsə də yelləndiriri.

Şeyx ilə müfti özün hammıdan artıx biliri
Özlerin sərver edib ümmətə hellendiriri.

Dupduru gözyaşıtək ölkədə çay-çeşmələri..
Bir balıq tutmaq üçün şər ilə lilləndiri.

Şeyx deyən Allax ilə mən deyən Allax tutmur.
Şeyxin Allahı bu gün zefini bəlləndiriri.

Kimsə ki, yağlar onu, hey keçiri sağ-soluna.
Artırar ruzusunu, kölgədə vellendiriri.

Eyriyə do veriri, eyri tutur boynunu düz.
Təhmət altında düzün boynunu şəlləndiriri.

Güllü bağlar hasilin paylırı yaltaqlanana...
Tir-tikanlı çolu da Yalqıza bellındiriri.

## Bərəkəllah!
*(Böyük dost və böyük alim Asif Rüstəmliyə)*

Uca dağlar görmüşəm ...
Dağlara bərəkəllah!
Dağları yorulmadan
səmaları çiyninə
alıb saxlar görmüşəm...
Yeri göyə bağlayan
bağlara bərəkəllah!
Dağlar dağ olduğundan,
göylər göy olduğundan
Buna da bərəkəllah!
Ona da bərəkəllah,!
Yenə də bərəkəllah!
Yaradanın dağlara
vurduğu naxışlara,
Qayalardan biçdiyi
dona da bərəkəllah!
Dağları çeşmə-çeşmə
göz-göz ağlar görmüşəm...
Yaşanılan ömrə də,
günə də bərəkəllah!
Xeyirli başlanğıca,
sona da bərəkəllah!

Dostum Asif Rüstəmli,
sənə də bərəkəllah!
Muğayat ol özündən!
Böyüklüyün üzündən
Dağlar oldu dizindən.

*29 aprel 2016-cı il*

## Asif Rüstəmli

***Bu səhər sübh çağı Şəkinin Kiş kəndində yaşayan dostum, çağdaş poeziyamızın görkəmli nümayəndəsi, AYB Şəki bölməsinin rəhbəri Vaqif Aslandan mobil telefonuma bir mesaj gəldi. Mənə yenicə həsr etdiyi "Bərəkallah" şeirini göndərmişdi. Doğrusu bu şeir məni çox duyğulandırdı. Mənim barəmdə işlətdiyi yüksək poetik fikirlərdə Vaqifin özünü görürdüm... Mən də ona qafiyəli misralarla cavab verməyi qərara aldım:***

### Alqış

*(Şair dostum Vaqif Aslana)*

Şeirimizin aslanı
Vaqif Aslana alqış!
Kişdə yeni yazdığı,
Böyük dastana alqış!

Dost, ürəyi oxuyur,
Şeiri çiçək qoxuyur,
Sözdən çələng toxuyur –
Bu gülüstana alqış!

Saçlarına düşür dən,
Eşqi, amalı – Vətən!
Dağdı – dağa söykənən,
Xan Qobustana alqış!
Vaqif Aslana alqış!

*Bakı, Əhmədli, 29 aprel 2016-cı il*

## Etibar Etibarlının yazışmaya münasibəti

*(Şair-publisist-tənqidçi)*

### I

Əsil şair tərif də yazanda yüksək poetik ruhla yazır. Vaqif Aslan ilhamlı şairdir və bu, hər şey deməkdir. Şerin ruhuna bax ki, bir alim kimi rəğbət bəslədiyim Asif Rüstəmlini də ilhama gətirib. Dostluğunuz əbədiyaşar olsun.

*29 aprel 2016-cı il*

### II

...Tələbəlik illərindən tanıdığım (O, fransız dilində, mən isə rus dilində təhsil almışıq.) çılğln təbiətli dostum o nadir şairlərdəndir ki, təbiətən öz şeirlərinə bənzəyir.

...Öz nəfəsi, öz yazı üslubu vardı. Hamı onun gələcəkdə böyük şair olacağına inanırdı, o cümlədən, mən də. Vaqif çılğın təbiətli olduğu qədər də təvazökar idi. ...

...görkəmli ədəbiyatşünas alimimiz, filologiya elmlər doktoru, professor Asif Rüstəmli şair dostumun (Vaqif Aslanın) yaradıcılığı haqqında "Sözün közü və düzü" sərlövhəli maraqlı, ətraflı, daha doğrusu, bənzərsiz bir təhlili yazı yazıb.

...Klassik poeziyamızı gözəl bilən, çağdaş ədəbi prosesi diqqətlə izləyən və mütəmadi ədəbi-tənqidi məqalələr yazan, yorulmaq bilməyən cəfakeş ədəbiyyatşünas alim, filologiya elmləri doktoru, tənqidçi Vaqif Yusifli ...Vaqif Aslan yardıcılığını elə təhlil edib ki, elə bil o zaman bizimlə "Cığır" dərnəyində iştirak edib, Vaqifin ilk şeirlərinin dinləyicisi olub. Eyni zamanda onun poemalarını da ətraflı və məhəbbətlə təhlil edib. Vaqif Aslan bu gün böyük ədəbiyyatın yolunda öz zirvəsinə doğru sakit, hay-haraysız irəliləyən müdrik yaşlı gözəl şairimizdir. Canı sağ, yolu açıq olsun.

*Etibar Etibarlı, 13 yanvar 2018-ci il*

## Fəxrəddin Meydanlının yazışmaya münasibəti

Ay maşalah, bu dostlar yamanca şeirləşir.
Biri baş kəndimizdən, biri Kişdən dilləşir.
İki şair bir olsa, şeir də gözəlləşir.
Vaqif Aslan, şeirinə, sözünə bərəkkallah,
Asif də şair oldu, özünə bərəkallah!

*29 aprel 2016-cı il*

## Asif Rustemli

Eşq olsun Vaqif Aslan
Meydanlı yazdı dastan.
Ovqatda şeir dedin
Silkələndi Qobustan

*Bakı, 19 fevral 2017-ci il*



*08.06.2016 – Fəxrəddin Meydanlı. Bakı bulvarı, Şəkinin Kiş kəndində yaşayan ünlü şair dostum Vaqif Aslanla və bir qrup şəkililərlə birlikdə tarixi bir şəkil. Soldan: Rəsul İlməddinoğlu, Rahim Cumayoğlu, Rusiyanın və Azərbaycanın əməkdar artisti Mərdan Feyzullayev, Hikmət Nəbiyev, Hikmət Əziz oğlu, Vaqif Aslan, Fəxrəddin Meydanlı*

## Fəxrəddin Meydanlıya Vaqif Aslan cavabı

Fəxrəddin Meydanlıya bizdən salamlar olsun!
Dilində, ağzında da şirin kəlamlar olsun!
İsitsin bu dünyanı qəlbindəki köz ilə.
Əl dəyməyən vərəqdə
dil dəyməyən söz ilə.
Üstünə şeh düşməyən çiçəkləri oxşasın!
Əsli, nəsli, soy-kökü göyçəkləri oxşasın!
Öz sevdalı başıyla,
Ömür-gün yoldaşıyla
Fəxrəddin Meydanlının meydanı geniş olsun!
İlhamlı uçuş olsun, ilhamlı eniş olsun!
Fərəhlənsin oğluna, qızına baxıb hər an.
Ürəyi dağa dönsün şipşirin duyğulardan.
Dəvələri də olsun!
Nəvələri də olsun!
Daha da geniş açsın qolunu, qanadını
Qoy çıxarsın deyirəm ömrün-günün dadını.
Noğulu öz yerində.
Nağılı öz yerində.
Şikayəti olmasın meydanın darlığından.
Həzz alsın, şövqə gəlsin özü öz varlığından.
Yadından çıxarmasın bundan sonra, nə olar!
Dostların arasında bir Vaqif Aslan da var!

*Şəki, Kiş kəndi, 6 may 2016-cı il*

## Piramida

Toy etdim,.. sandım ki, murada çatdım.
Mindi yavaş-yavaş dalıma arvad...
Mindi, topuğacan torpağa batdım.

Bir vaxt oğlum oldu, bir zaman qızım ...
Mən necə xoşbəxtdim, mən necə şaddım ...
Amma diziməcən torpağa batdım.

Oğlu evləndirdim, qızı köçürdüm ...
Qaynata olmağın dadını daddım.
Məni cüt-cüt mindi tək-tək minənlər ...
Onda qurşağadək torpağa batdım.

İndi nəvələrim çıxır başıma ...
Dərinə getdikcə mən addım-addım.
Belə qurulubmuş piramidalar...
Mən ki, piramida qurub yaratdım.
Daha boğazacan torpağa batdım.

Bir azdan dolacaq gözümə torpaq.
Heyrandır məndəki dözümə torpaq.

*26 fevral 2019-cu il*

## Zabil Pərviz
## "Piramida"

*Şair dostum Zabil Pərviz məhz bu şeirimə görə mənə şeir həsr etmişdir. (Eyni adlı şeirin müəllifi, Şəkidə yaşayan böyük şair Vaqif Aslana)*

Kiş kəndində bir kişi var
Yarı dağdır, yarı şair.
Kim deyir ki, bu ölkədə şir qalmayıb?
Kiş kəndində şir yaşayır.

İndi kimin həddi nədir
Kiş kəndinin toyuğuna "kiş" deməyə?
İndi kimin ağzı nədir

Kiş kəndində bir kişiyə
Görürəm var gözün üstə qaş deməyə?

Kiş kəndində bir kişi var...
Söykənibdir dağlar ona, o, dağlara.
Nəğmələri dağ çayıtək qayaları parçalayır...
Axıb gedir...
əbədiyyət adlı sonsuz uzaqlara.

Kiş kəndində bir şair var...
Bu zamanda, bu məkanda
Yarı dəniz, yarı ada.

Zirvələrdə söz villası...
Misirlilər gəlib baxsın!
Piramida yaradıbdır-
Əsil, ölməz piramida.

*10 dekabr 2020-ci il*
*Salyan şəhəri. T.Davudzadə, 1/6*

## Şöhlət Əfşar
## Alovlu şaman

*Ustad şair, nəcib insan əziz qardaşım Vaqif Aslana*

Təbi billur bulaq, ilhamı dağlar,
Vulkantək püskürər, çay kimi çağlar.
Sözü aşiqlərin qəlbini dağlar,
Sənətin atəşi, közüdür Vaqif.

Şəkidə hücrədən dünyanı görür,
İrfandır, sufitək dövranın sürür.
Şeirin zülfünə incilər hörür,
Sənətdə ustadın özüdür Vaqif.

Alovlu şamandır, ehtiraslıdır,
Gecə-gündüz zikri Haqqın adıdır.
Gah Dədə Ələsgər, gah da Alıdır,
Haqqın vəyhlə gələn sözüdür Vaqif.

*14 iyul 2016-cı il*

## Şöhlət Əfşarı xatırlayarkən

*(1949-06.II.2022)*

Sənə cavab verməyim, Şöhlət Əfşar, gec oldu.
Olanlar oldu, ancaq bilmədim ki, necoldu?

Dedilər: "Tutdu Əcəl əlində bir ulu cam"
O anda Şöhlət Əfşar içdi ondan, aldı kam.

Bir səs gəldi qeybdən: – Gecikmək mümkün deyil!
Tələsməyə də dəyməz, sönməlidirsə bir şam.

O günləri görməyən bir kimsə olmayacaq...
Veriləcək hər kəsə vaxtında o "sərəncam"

İki dünya bir oldu, durub dayandı zaman.
Bundan sonra səninçün "nə səhər var, nə axşam".

Əziz ruhun dolaşsın torpağın, daşın üstə.
Axar dünyan boyunca doyunca alasan kam.

Övladların göyərsin yadın-yaddaşın üstə.
Olub-olacaqların tam olsun, olduqca tam.

***Qeyd: Dırnaqcıqlardakı sözlər XIII əsrdə yaşamış türk şairi Şəyyad Həmzədəndir. – V.AS.***

## "Bilik" qəzetindən

Fabritsius küçəsindəki təhsil korpusunun böyük salonuna toplaşanlar bayırdakı çovğunu unutdular. "Şer, şer, şer"...gecəsinə gənc şairlərdən Məmməd Kazım, Dəmir Gədəbəyli və Məmməd İsmayıl dəvət olunmuşdular...

Tələbə-şairlərdən Dilqəm Hüseynov, Fərrux Sadiq, Vaqif Aslanov, Şahin Xəlilov, Leyli Əliyeva, Dilsuz Musayev, Namaz Manafov şerlərini...oxudular.

... Qonaqlar "Cığır" ədəbi dərnəyi üzvlərinin müvəffəqiyyətlərini yüksək qiymətləndirdilər...Dəmir Gədəbəyli Dilqəm Hüseynovun, Vaqif Aslanovun və Fərrux Sadiqin adlarını xüsusi qeyd etdi.

*"Bilik" qəzeti №4(150), 24 fevral 1972-ci il. səh.4.*
*M.F.Axundov adına APDİ-nin rektorluğu, partiya,*
*komsomol və həmkarlar ittifaqı təşkilatlarının orqanı*

## Etibar Etibarlıdan

Hamının istedadlı, təvazökar bir şair kimi tanıdığı və sevdiyi, gəncliyindən indiyədək "Əl açıb Allahına., Haqqa sarı gedən" şair dostum Vaqif ASLANIN "Ovqat" verlişində ... səsləndirdiyi ... şeirlər ... bügünkü səhərimi bir az da gözəlləşdirdi, bir az da şirinləşdirdi.

Şairin qəzəllərini ... xüsusi şövqlə oxuyan ... gözəl xanəndəmiz Gülyanaq Məmədovanın və tarı ... az qala "danışdıran" Mehmanın ifalarından xüsusi zövq aldım.

Vaqif ASLANIN poeziya haqqında təkrarsız mühakimələri də, şübhəsiz, poeziyasevərləri sevindirib.

*13 yanvar 2018-ci il*

## Vaqif Aslandan

Qardaşım Etibar Etibarlı! Nə yaxşı ki, sənin yaddaşın Qobustanın qayaları kimidir. Mən orada özümü daha yaxşı görə bilirəm. ... Ürəyi zamanın toz-tozanağından, beyni kənar düşüncələrin zər-zəhərindən qoruyub saxlaya bilmək elə sənin kimi etibarlı kişilərin işidir.

*Vaqif Aslan, 13 yanvar 2018-ci il*

## Mürfəttar Seyidməmmədovdan

Etibar müəllim, sağ olun ki, bu yazını oxumaq şərəfinə nail olduq! Böyük şairimiz Vaqif Aslana uzun ömür və can sağlığı, müvəffəqiyyətlər arzulayıram! Tələbəlik illərində "Bilik" qəzetində çap olunan hər şeirini acgözlüklə oxuyardıq .

*Mürfəttar Seyidməmmədov. 13 yanvar 2018-ci il*

## Oktay İsmayıllı (Fərzəliyev)dan

Vaqif Aslan, həqiqətən, dərin mənaların vaqifi, böyük mətləblərin aslanıdır. Allah onu qorusun!

Vaqif müəllimlə bağlı xatirələrinizi yazmaq çox yaxşı olardı, Əlisafa müəllim. Vaxt gələcək, belə yazıları toplayaıb nəşr etdirən oğlan tapılacaq.

*13 yanvar 2018-ci il*

## Əlisəfa Muradovdan

Oqtay müəllim, Vaqif Aslan mənim tələbə yoldaşım, həm də dostumdur. Çox gəzəl, sadə, təvazökar, həm də dahi insandır.

*İsmayıllı, 13 yanvar 2018-ci il*

## Qocalar

Hər axşam yığışıb gimgə yerinə
Böyüyü, kiçiyi sorar qocalar.
Hərəsi əyləşər bir daşın üstə,
Qəlyana dəm verib durar qocalar.

Söhbət təzələnər, söz şirinləşər...
Hər sinə – bir kitab, hər sinə – dastan.
Qocalar get-gedə hey həzinləşər
Danışa-danışa cavanlığından.

İlk baxış, ...ilk görüş, ...ilkin məhəbbət...
Yenə qızışarlar, yenə coşarlar.
Biri qalxmaq istər yerindən bu an,

– Ay belim! – deyərək əyləşər fəqət,
Sakit, qəmli-qəmli hey baxışarlar,
– Qocaldıq... – deyərək pıçıldaşarlar.

Yenə söhbət düşər güləşdən, atdan,
Mərdlikdən, düzlükdən, toydan, büsatdan...
Deyib qəmlənərlər, deyib gülərlər,
Qalmaz heç birisi xoş zarafatdan.

Eh, sonra nə bilim, nə bilim nələr...
Hər şeydən şikayət, köksötürmələr.
Qəm yeyib bir anda yüz il qocalar,
Qocalar!

Qəlyan tüstülənər, anlar ötüşər,
Axşamı beləcə başa vurarlar.
Əl-ayaq yığışıb qarışanda şər
– Ay belim! Ay qıçım! – deyib durarlar.

*“Şəki fəhləsi” qəzeti №85 (7.820).*
*Çərşənbə Axşamı, 18 iyul 1972. səh.4.*




*27 sentyabr 2018-ci il. Kiş kəndinin qosqocaman kitabxanaçısı Ənvər dayı (İsrafilov Ənvər Davud oğlu – 1928-03.VII.2021) ilə. Soldakı şəkildə soldan: İsrafilov Məməti Ənvər oğlu, Vaqif Aslan, Ənvər dayı və onun yeznəsi Rahid Vahid oğlu. Sağdakı şəkildə soldan: Vaqif Aslan, Ənvər dayı və onun dostu əslən Qoxmuqlu Telman Ağakişiyev*



## Axırı varmış

Çox qızlar görmüşəm – üzügülər, şən...
Deyən, gülüşən.
Qəlbimin hər teli bir hava çalmış...
Amma baxmaq olmuş mənə pay düşən.
Axırı yoxmuş!

Çox qızlar görmüşəm – gözləri ala,
Adım da yadımdan çıxıb az qala.
Axırı yoxmuş!

Çox qızlar görmüşəm – ruh qədər incə...
Barmaq toxunmamış saralar, solar.
Kim olsa gözlərin maviliyində
Vallah, diri – gözlü batar, boğular.
Çox gözlər gözümün içinə baxmış...
Axırı yoxmuş!

Gozlərdən gözümə şəhvət axıbdır,
Gözlərdən gözümə nifrət axıbdır.
Bəzən qızışmışam, bəzən coşmuşam,
Bəzən də üzümə elə baxıblar,
Tamam çaşmışam.

Baxışlar üstümə soyuq nur yayıb
Bəzən Ay kimi.
Baxışlar, baxışlar, vəhşi baxışlar
Əsəb tellərimi gərib yay kimi.
Gəlmir xatirimə bu baxışmalar
Hayandan başlamış, hayana çıxmış...
Axırı yoxmuş!

Həyatın ən böyük sirri, mənası
Mənə də, mənə də gizli qalarmış.
Təkcə sənə baxdım, dəyişdi fikrim,
Sevgilim!
Bildim baxmağın da axırı varmış!

*"Şəki fəhləsi" qəzeti №90 (7.825). Şənbə,*
*29 iyul 1972-ci il. səh.4.*

## Həkim bıçağı

– Anacan, ağlama, yorma özünü!
Oğlunuz bıçaqdan yaxşı çıxıbdır.
– İnana bilmirəm, görüm üzünü!
Ay həkim, balamı bıçaq yıxıbdır.

Oğlunun yanından çıxanda ana
Soruşdu həkimi, girdi içəri.
Baxdı döşəməyə, baxdı tavana,
O əsdi, titrədi, doldu gözləri.

Dayandı üz-üzə ən gözəl insan,
Ana-təlatümlü, həkim-mehriban.
Qılıncmı çəkmişdi anaya dərdi?
Susduqca susurdu, qəhərlənirdi.

Bu qəmmi, sevincmi? Bilmirdi həkim...
Xəyallar ananı hara çəkirdi?
Bəlkə də qan tökən, oğullar yıxan
Qanlı bıçaqları dara çəkirdi.

Ürək duya-duya, göz görə-görə
Sükut uzanırdı, ana yanırdı.
Baxdıqca heyrətlə dolan gözlərə
Həkim də coşurdu, dalğalanırdı.

– Can həkim,..can həkim...O köks ötürdü...
Açdı qollarını, sarıldı ona.
Stolun üstündən gəlib götürdü,
Həkim bıçağını öpdü o ana.

Xəyalmı, yuxumu görürdü həkim?
Bir müddət özünə heç inanmadı.
Amma heyrət etdi,.. göz yaşlarından
Necə oldu ki,
Bıçaq od tutmadı, bıçaq yanmadı?

*"Şəki fəhləsi" qəzeti №145 (8.033).*
*Şənbə, 15 dekabr 1973-cü il. səh.4.*

## Şair görüşə gəlib

147 nömrəli Aşağı Göynük seçki dairəsindən Azərbaycan SSR Ali Sovetinə deputatlığa namizəd, SSRİ Dövlət mükafatı laureatı, istedadlı şair Nəbi Xəzri gənclərin görüşünə gəlmişdi.

Görüşü şəhər partiya komitəsinin ikinci katibi Ə.Nəzərli yoldaş açdı. "Səbuhi" ədəbi məclisinin üzvü V.Aslanov Nəbi Xəzri poeziyası barədə danışdı. Qələm dostları Söhrab Tahir və Məmməd Araz şairin yaradıcılığındakı yüksək xəlqilik, dərin realizm, incə lirika, torpağa bağlılıq kimi yeksək keyfiyyətlərdən söz açdılar.....

Axırda Nəbi Xəzri M.F.Axundovun vətənində ona göstərilən yüksək etimad üçün minnətdarlığını bildirdi.

*"Şəki fəhləsi" № 64.*
*29 may 1975-ci il*

## Sovet ədəbiyyatı elçiləri Şəkidə

Azərbaycanda sovet ədəbiyyatı günlərinin iştirakçılarından bir dəstəsi iki gün şəhərimizin qonağı oldu. Şəkililər rus, gürcü, erməni, moldav, türkmən elçilərini elimizə xas olan əsil qonaqpərvərliklə, qardaş məhəbbəti ilə, duz-çörəklə qarşıladılar...

Şəki Dövlət Dram Teatrının tamaşa zalı ağzına qədər adamla dolmuşdu....Gecəni giriş sözü ilə Azərbaycan KP Şəki Şəhər Komitəsinin birinci katibi S.N.Murtuzayev açaraq...dostluq əlaqələrindən...danışdı...

Gürcü şairi X.Berulava, moldav şairi L.Damian, türkmən şairi İ.Nuriyev, onların azərbaycanlı qələm dostlarından N.Xəzri, Ə.Kürçaylı, Q.Xəlilov, M.Araz, T.Mütəllibov, ...gənc şairlərdən Musa Yaqub, A.Abdullazadə, "Şəki fəhləsi"redaksiyası yanındakı "Səbuhi" ədəbi məclisinin üzvü V.Aslan şer oxudular. *Azərbaycan şeirinin sədaqətli dostu,Azərbaycan SSR Ali Soveti*

*Rəyasət Heyəyinin üzvü, "Qrakan Adrbedjan" jurnalının baş redaktoru Samvel Qriqoryanın erməni və Azərbaycan dilində oxuduğu şerlər gurultulu alqışlarla qarşılandı*... T.Streşneva, Q.Konovalov, M.Lukonin qardaşcasına qəbul və qonaqpərvərlik üçün... səmimi minnətdarlıqlarını bildirdilər...

*"Şəki fəhləsi"№121(8.315).*
*Çərşənbə axşamı,*
*7 oktyabr 1975-ci il. səh.1.*

*P.S. Altından xətt çəkilmiş cümləyə və o cümlədəki hiyləgərliyə diqqət edin!!!*

## Ömür

Doğulduq,..çox əcəb. Böyüdük,..əcəb!
Həyat çeşməsindən hamı su içdi.
Ömürdən danışdıq güc gələndə təb,
Demədik yarısı yuxuda keçdi.

*"Şəki fəhləsi"№37(8.231). Şənbə,*
*29 mart 1975-ci il. səh.4.*

## Dünya

İllər keçir, qocalırıq... Qocalır dünya....
Dağ dağdır ki, zirvəsinin beli bükülür.
Tələsirik zaman-zaman biz sabahlara,
Sabahlara al Günəşin nuru tökülür.

*"Şəki fəhləsi"№37(8.231). Şənbə,*
*29 mart 1975-ci il.səh.4.*

## Qovaq nəğməsi

Ey yolçu, laqeyd ötmə, bir zaman
Kölgəmdə tapmısan sən dincliyini.
Ey qoca, ey qarı, sən də bir dayan,
Mənə bax, xatırla öz gəncliyini.

Vaxt vardı yamyaşıl yarpaqlarımdan
Öpərdi sevənlər, öpərdi bulaq.
İndisə quruyan budaqlarımdan
Köçəri quşlar da uzaqdır, uzaq.

Ey cavan, baltanı əlinə al bir,
Xəyallar uzağa çəkməsin səni.
Demə ki, qocadır, gərək deyildir,
Elə gərəksizlik qocaldıb məni.

Ey usta, bir beşik qayır bu sayaq.
Ana əllərində yırğalanım mən.
Tarixlər şahidi bu qoca qovaq
Qızınsın bir körpə təbəssümündən.

*"Şəki fəhləsi" №8. (8.825). Şənbə,*
*20 yanvar 1979-cu il.səh.4.*

## Şəkidə Sabir poeziyası günü

Dövlət dram teatrında görüşü...Azərbaycan KP Şəki şəhər komitəsinin ikinci katibi Ə.Nəzərli açmış, "Azərbaycan" jurnalının baç redaktoru Əkrəm Əylisli Sabir poeziyası günləri barədə məlumat vermişdir. Şairlərdən Fikrət Qoca, Tofiq Abdin, həmyerlimiz, "Səbuhi" ədəbi məclisinin üzvü Vaqif Aslan öz şerlərini oxumuş, tənqidçilərdən Aydın Məmmədov və Kamil Vəliyev müasir poeziyanın qarşısında duran vəzifələrdən danışmışlar....

*"Şəki fəhləsi" №64(8.881).*
*Çərşənbə axşamı, 5 iyun, 1979-cu il. səh.4.*

## Heyif sənə, İngiltərə!

*(Londonda Tauer həbsxanasının 900 yaşı var.*
*Mütərəqqi xadimlərin, o cümlədən, 1535-ci ildə*
*Tomas Morun qətlə yetirildiyi bu qala muzeyə çevrilmişdir)*

Eşitmişəm bir zindanın
Muzey olub... Gözün aydın!
Sevinmişəm buna görə.
İngiltərə!
Amma yenə deyirəm ki,
Sən dünyada olmasaydın
Yiyə duran olmazdımı
London Kral Muzeyində
Zəncirlənmiş əsirlərə?

Bir tərəfdə "dustaq olub"
Qoca Şərqin şan-şöhrəti.
Bir tərəfdə "qandallanıb"
Azərbaycan şeriyyəti.
Heyrətindən "donub qalıb"

Qədim hindli filosoflar.
Nə qəribə muzeyin var?!

Muzeylərin zindan ikən
Zindanını muzey etdin sən nə deyib?
Heyif sənə İngiltərə! Heyif, heyif!..

Şekspirin, Nyutonun ana yurdu!
Ondan-bundan törəyənlər
Sənə yaman tələ qurdu.
Onlar özgə papağını
Örtməyi də bilmir eyib.
Heyif sənə İngiltərə! Heyif, heyif!..

Ey şöhrətli, əzəmətli, ulu torpaq!
Yer üzünün qanı ilə
Xınalanmış əlinə bax.
Sonra da bax sol-sağına.
Bütün dünya şübhə edir
Xınalanmış barmağına.

Eşitmişəm bir zindanın
Muzey olub. Sevinmişəm
Buna görə.
Zindanın da muzey olsun,
Muzeyin də muzey olsun
İngiltərə!
İngiltərə!

*"Şəki fəhləsi" №65.(8.882.) Cümə Axşamı, 7 iyun 1979-cu il. səh.4.*

## Ağlasın

*(Xocalı qətliamı qurbanlarına ağı)*

Qoca da, cavan da boyanıb qana,
Eşidə səsimi, bəlkə, oyana.
Oxşaya-oxşaya dil deyim ona,
Aylar yas saxlasın, illər ağlasın.
Dil de, dil yiyəsi, dillər ağlasın.

Anamdır, bacımdır. Onu kim vurub?
Küsüb bu dünyadan, boynunu burub.
Telləri üzünə tökülüb durub,
Ucundan qan daman tellər ağlasın.
Dil de, dil yiyəsi, dillər ağlasın.

Atamdır, babamdır... Can verir hələ...
Müsibət üz verib obaya, elə.
Bu dərdi söyləyim küləyə, yelə...
Küləklər döyünsün, yellər ağlasın.
Dil de, dil yiyəsi, dillər ağlasın.

Qardaş hanı qıçın, hanı bəs qolun?
Qızıl qan gölüdür sağınla solun.
Üzü dönük çıxdı sən gələn yolun,
Baxdıqca üzünə yollar ağlasın.
Dil de, dil yiyəsi, dillər ağlasın.

Nə işdir başına gəlib, ay bala?
Bir də tapılarmı sənə tay bala?
Ürəyim partlayır hay ver, hay, bala!
Üzünə tərs gələn illər ağlasın.
Dil de, dil yiyəsi, dillər ağlasın.

*23 sentyabr 1996-cı il*

# Dəvət və gediş

Bakı Avrasiya Universitetində kafedradaşım, Azərbaycanda əksər aydınların yaxşı tanıdığı görkəmli jurnalist və filoloq alim Seyfəddin Altaylı fevralın ortasında mənə bildirdi ki, qardaş Türkiyənin Dənizli şəhərindən "Xocalı Çalışma Qrupu" bizim ikimizi ayın 26-27-də həmin şəhərdə Xocalı soyqırımının 25 illiyinə həsr edilmiş önəmli tədbirlərə qatılmağa dəvət edib. … Məruzə də etməliyik. Tərəddüdsüz razılaşdım

Universitetin təxminən 5 yüz nəfər tutan böyük zalında "Xocalı Çalışma Qrupu"nun təşkilatçılığı ilə Xocalı soyqırımının 25 illiyini anma mərasimi keçirildi. Mərasimə Bələdiyyə başqanı Osman Zolan, Azərbaycan konsulunun müavini Yadulla Paşayev, Pamuqqala kaymakamı Xeyrəddin Balcıoğlu, il (vilayət) milli təhsil müdirinin müavini Hüseyn Başgün, ilçə (rayon) milli təhsil müdiri Rəşad Ərdoğan, çoxlu tanınmış ziyalı, Universitetin müəllim və tələbələri qatılmışdı. ... Protokola uyğun olaraq Azərbaycan nümayəndələri Bələdiyyə başqanının yanında əyləşmişdilər.

Mərasim şəhidlərin ruhuna sayğı duruşu və Türkiyənin İstiqlal marşının oxunması ilə başlandı.

"Xocalı Çalışma Qrupu"nun başqanı Sədat Sərdaroğlu və TEV Anadolu liseyinin müdiri Fevzi Yetik təqdim və təşəkkür çıxışları etdilər. Sonra söz Dənizli Böyükşəhər Bələdiyyə Başqanı O.Zolana verildi və o, Xocalı faciəsi haqqında düşüncələrini paylaşdı.

...Musiqi müəllimi Əminə Çivi Azərbaycan mahnılarını oxudu. Onun mahnıları arasında iki şagird səhnəyə çıxdı. ***Azərbaycan bayrağına bürünmüş qız Şəkidə yaşayan görkəmli ədib Vaqif Aslanın, Türkiyə bayrağına bürünmüş ikinci qız isə romançı Həsən Kallimçinin*** bir-birinə yazdıqları türk dünyası ilə bağlı həsrət və düşüncələrini ifadə edən iki şeiri oxudular.

Bundan sonra Xocalı qətliamı paneli başlandı. Pamuqqala Universitetinin müəllimi, paneli idarə edəcək dos. Süleyman Solmaz məruzə etmək üçün məni və Seyfəddin bəyi səhnəyə dəvət etdi. Məruzələr bitdikdən sonra Süleyman bəy də daxil, üçümüzə

də plaket (təşəkkür bəlgəsi) verildi. Bununla da Dənizlidəki iki gün çəkən Xocalı soyqırımı anımı başa çatdı.

*Ədalət Tahirzadə*
*Bakı Avrasiya Universitetinin professoru*
*01 mart 2017-ci il. 525-ci qəzet.*




*Dənizlidə*

## "Ruhlarla söhbət" kitabının müəllifi ilə görüş

Bu yaxınlarda yerli yazarlardan olan Vaqif Aslanın "Ruhlarla söhbət" adlı...kitabı nəşr olunub. Şairin həmin uğrunu poeziyasevərlər maraqla qarşılayıblar. 3 saylı orta məktəbdə maraq daha böyük olub. Bədii ədəbiyyata xüsusi maraq göstırən müəllimlər və şagirdlər müəllifi görüşə dəvət eləyiblər...

Görüş məktəbin böyük sinif otaqlarından birində keçirildi. Şəhərimizin ən seçkin ziyalıları, Şəki şəhər İcra Hakimiyyəti başçısının müavini Firqət Məmmədov və başqaları çıxış etmişlər.

*X.Teymur*
*AYB Şəki bölməsinin sədri*
*"Şəkinin səsi" qəzeti,№1-2(128-129), 2 yanvar 1998-ci il*



*18 noyabr 1997-ci il. "Ruhlarla söhbət" kitabının BDU Şəki filialında təqdimatı. Soldan: BDU Şəki filialının direktoru, filosof Fərman İsmayılov,  Vaqif Aslan, AYB Şəki bölməsinin ilk sədri Teymur Xəlilov (18.09.1935-02.09.1999)*

## Söz..Söz...Söz!

Bu günlərdə Şəki rayonunun mədəniyyət sarayında Azərbaycan Yazıçılar Birliyi Şəki bölməsinin tərtib etdiyi "Söz...Söz... Söz!" toplusunun birinci buraxılışının təqdimat mərasimi keçirildi.

Mərasimi Şəki RİH-in məsul işçisi Sahib Əlişanbəyli açaraq bildirdi ki, geniş oxucu kütləsinə təqdim edilən bu almanaxda Şəki ədəbi mühitini təmsil edən yazıçıların bir qrupunun əsərləri toplanmışdır. Bu, Yazıçılar Birliyi Şəki bölməsinin ilk təcrübəsidir. Sonra o, sözü AYB-nin Şəki bölməsinin sədri Vaqif Aslana verdi. Bölməyə xüsusi diqqət yetirən xalq yazıçısı Anarın simasında AYB İdarə Heyətinə, Şəki şəhər İcra Hakimiyyətinin başçısı Nazim İbrahimova səmimi minnətdarlığını bildirən bölmə sədri sonda yeni seirlərini oxudu.....



*Sərvaz Hüseynoğlu-Əskərli (soldan 3-cü), Əli Səmədov (sağdan 2-ci), İsmayıl İmanzadə (sağdan 3-cü) AYB Şəki bölməsinin qonaqlarıdır. Şəki, 2006-cı il*

"Ədəbiyyat qəzeti"nin şöbə müdiri S.Hüseynoğlu çıxış edərək bildirdi":...Bu gün Şəki ədəbi mühiti deyiləndə ilk yada düşənlərdən biri də Vagif Aslandır. Onun bir söz adamı olaraq yerini yaxşı bilirik. Təqdim olunan toplu isə Vaqifin təşkilatçılıq qabiliyyətini bir daha ortaya qoyur".

Sonra söz xalq şairi Zəlimxan Yaquba verildi. O ... dedi: "...Bu məclisdə şeirlər dinlədik. Nə qədər aydın, təmiz bir dildə, pak ruhla yazılıb bu şeirlər. Bakı ədəbi həyatında mən-mən deyən bir para gənclər peyda olub, ağızlarına gələni yazırlar...






*Şəki, "Master" – 2006 Soldan: Ağa Ramazan, Vaqif Aslan,*
*Adanalı qonağımız Ahmet Kaytançı,*
*Şəki şəhər İcra Hakimiyyətinin başçısı*
*Nazim İbrahimov avqust, 2009-cu il*

Dahi Üzeyir Hacıbəylidən sonra ən böyük ziyalılarımızdan biri kimi yetişmiş Anarın haqqına belə göz yumurlar. Mən xahiş edirəm, mənim dediklərimi necə var, eləcə yazın, qoy sözünün dalı ilə qabağı bilinməyən, ağızlarına gələn hər cür hərzə-hədyanı yazan, mətbuata çıxaran bir para cızma-qaraçılar gəlib bu gün burada dinlədiyimiz şairlərin yaradıcılığı ilə tanış olsunlar. Söz budu, ...sənət budu..."

*"Ədəbiyyat qəzeti", 2006-cı il*

## Bəli, Abdulla Şaiq!

*(“Tülkü həccə gedir” əsərinini oxuyarkən)*

Sizin zəmanənizdə
tülkü həccə gedirdi.
Yanında xoruz-beçə,
toyuq-cücə gedirdi.
Həm də necə gedirdi!..

Dəyişsə də şir, pələng,
tülkü haman tülküdür.
Hamam haman, tas haman,
ülgü haman ülgüdür.
İndi burası var ki,
Tülkü töküb tükünu...
Banka qoyub yükünu..
Hara getsə, lüt gedir.
Təndir çox, dünya böyük...
Yapılanlar küt gedir.

Belə yerdə deyirlər:
– Kim yuxulu, kim ayıq?
Bir səs gəlir qeybdən:
– Qardaş-bacı yuxuda...
Hacılar ayıq-sayıq.
Bəli, Abdulla Şaiq!
Bəli, Abdulla Şaiq!
Hər deyəndə tapılmır
Hacılar haqqa layiq.

*14 aprel 2011-ci il*

## Şeytan

Mənim Hacı qardaşım!
Başıma düşən daşım!

Şeytan şeytandır elə
Olsada nə biçimdə.
Daş sənin ovcundadır,
Şeytan sənin içində.

*May 2013-cü il*

## İsmayıl

Hayıl-mayıl, İsmayıl!
Yuxudan ayıl, İsmayıl!
Get, bazardan yemiş al!
Gəl, Həvvadan öpüş al!

*(Xalq deyimi)*

Neynirsən mənasız ayıqlığı sən?
Çox da ki, deyirlər: – Ayıl, İsmayıl!
Vermə əllərindən sayıqlığı sən!
Yuxula, yuxulu sayıl, İsmayıl!

İncitmə özünü!..
Hər işdən ötrü
Ayılıb bazara getməyə dəyməz!
Yemiş qiymətində öpüşdən ötrü
Həvvaya bazarlıq etməyə dəyməz!
Olma ucuzluğa mayıl, İsmayıl!
Çox da ki, deyirlər: – Ayıl, İsmayıl!

Yuxunda üstünə gəlmirsə qoşun,
Qanın çəkmələrə çilənməyirsə,
Alovlar içində yanmırsa qonşun,
Qohumun, qardaşın dilənməyirsə,
Qulağın batmırsa haydan, haraydan.
Göylərdən ensə də Həzrət Cəbrayıl,
Çıxma yuxundakı bəyaz saraydan,
Bəyaz döşəklərə yayıl, İsmayıl!
Ayılma, bir az da bayıl, İsmayıl!
Çox da ki, deyirlər: – Ayıl, İsmayıl!

*27 avqust 2010-cü il*

## Xəstə və həkim

– Həkim, mənə bir əlac!
Qarnım toxdur, gözüm ac.
– Əlacsız xəstəsən sən.
Çıx, get, yol üstəsən sən.

*09 oktyabr 2020-cü il*

## Görürsənmi nələr olur, əzizim?

Bir zamanlar öyünürdün,.. bağ belə.
Ağırlıqdan qırılırdı tağ belə.
Gözlər baxır, sulanırdı ağızlar.
Qalmayırdı ürəklərdə yağ belə...
Görürsənmi nələr olur, əzizim?..

Qorxurdun ki, bar-bəhrəni yeyərlər.
Yeyən kimi gözün aydın deyərlər.

Hərəyə bir papış tikib atırdın...
Bilmirdin ki, papışını geyərlər...
Görürsənmi nələr olur, əzizim?..

Güvənmişdin bu dünyanın nəyinə?
Köhnə paltar yaxşı gəlmir əyinə.
İnananlar süpürgəsiz qalırlar
Küpdənçıxan qarıların rəyinə...
Görürsənmi nələr olur, əzizim?..

Bağ-bostanın uralanıb, aşınıb...
Qoltuq-qoltuq, ətək-ətək daşınıb....
İtik var ki, "itdi-bitdi" deyirlər
Nə gəzirsən ondan-bundan yaşınıb?..
Görürsənmi nələr olur, əzizim?..

*22 sentyabr 2019-cu il*

## Şahın kəkili

Nə fərqi var –
Bakılıdır,
Şəkilidir.
Şahın ağlı
vəziridir,
vəkilidir.

O birilər
şahın yandan
qoydurduğu
kəkilidir.

*10 yanvar 2015-ci il*

## Səndən adam çıxmayacaq

*(Bir gün şair dostlarımızdan biri bu adda bir şeir oxudu.*
*Şeir valideyn danlağı üzərində qurulmuşdu.*
*Çox duzlu-məzəli şeir idi)*

Arxayın ol, qardaş ağa!
Səndən adam çıxmayacaq.
Çox boylanma sola, sağa!
Səndən adam çıxmayacaq.

Bu dünyaya gələn gündən.
Gəlmiş idin sən bu yöndən.
Fağır-fağır baxma gendən.
Səndən adam çıxmayacaq.

Üz tutsan da ərşə, ərzə
Keçməz işə ərzə-mərzə.
Olsan da kargüzar, mirzə
Səndən adam çıxmayacaq.

Göynüklü demişkən, qadam!
Yad olana mən də yadam.
Həvvadan çıxacaq adam...
Səndən adam çıxmayacaq.

*30 noyabr 2016-cı il*

## Köpəyin qızı

*(Şəkidə heyrət və heyranlıq bildirən*
*qəribə ifadə tərzlərindən biri də budur)*

Ceyrandır –
Muğandan, Mildən gəlibdir.
Köpəyin qızı!
Çiçəkdən çəkilib, güldən gəlibdir.
Köpəyin qızı!

Ağlıma, başıma
zor eləyibdir.
Görən gözlərimi
kor eləyibdir.
Köpəyin qızı!

Sanki Əzrayıldır,
sinəmə çöküb
Çəkib ürəyimi
dağıdıb, töküb
Köpəyin qızı!

Daha şaşırmışam
gəlhagəlimdən,
Olan-olmazımı alıb əlimdən.
Köpəyin qızı!

*11 yanvar 2015-ci il*

## Olmasa

Dərd özü dərd tapar, çəkən olmasa.
İnsan da göyərməz, dərdiylə birgə
Basdıran olmasa, əkən olmasa.

*18 oktyabr 2014-cü il*

## Müdirəm mən

Əzizim, müdirəm mən...
İşçimi ütürəm mən.
Otarıram qarnımı,
Başımı güdürəm mən.

*04 may 2012-ci il*

## İt dəftəri

Bir it gördüm Bakıda
xaltasında nömrəsi.
Kəmərindən sallanan
baltasında nömrəsi.

Pultla qısqadırdılar,
o da cumub qapırdı.
Rayondan gələnləri
burunlayıb tapırdı.

İt məni görən kimi
qıcartdı dişlərini...
Tərgitmir şəhərdə də
itlər vərdişlərini.

“Ham-ham!” edib üstümə
atıldı birdən-birə...
Nə Allaha inandı,
nə ocağa, nə pirə.

Bir it gördüm Bakıda,
nə dedimsə, “ham!” dedi.
Rəis məni öldürər,
səndən almasam dedi.

Dedim: – Allahın olsun!
Məni dəftərə yazma!
Dedi: – Şəkili qardaş,
yağlı dilinə basma.

Baxdım, gördüm ki, işlər
dərindədir, dərində...
Şəkiyə üz çevirdim,
adım it dəftərində.

*14 iyul 2015-ci il*

## Dərd özü nə dərddədir

Dərdin mərdi mərddədir,
Namərdi namərddədir.
Kim bilsin, necə bilsin?
Dərd özü nə dərddədir.

*19 oktyabr 2015-ci il*

## Doğuş

İnəklər buzov doğar ...
Camışlar xötək doğar ...
Bəzisi cüt-cüt doğar,
Bəzisi tək-tək doğar.

Qoyunlar quzu doğar, ...
Canına muzu doğar.

Höyür alanlar doğar...
Boğaz olanlar doğar.
Həqiqəti kim boğar?

*24 fevral 2016-cı il*

## Nədəndir?

Saçımın ağlığında
Yaşım yadıma düşmür.
Canımın sağlığında
Başım yadıma düşmür.

Yadımdan çıxır tamam
Görəsi işlərim də,
Protez dişlərim də.

Yadımdan çıxır tamam
Taqətim də, zorum da.
Çırpınıram balıqtək
Gözəlliyin torunda.

*05 oktyabr 2015-ci il*

## Yalana aldanan "ağıllı" adam!

Yalana aldanan "ağıllı" adam!
Yalan nəyə görə xoşuna gəldi?
Yalana aldanan "ağıllı" adam!
Ağlına gəlməyən başına gəldi.

Şəklini köçürüb plakatlara,
Adını "qəhrəman" qoydular sənin.
Sonra da şəklini çəkdilər dara.
Kağız gözlərini oydular sənin.
Karton dərini də soydular sənin.

Yalana aldanan "ağıllı" adam!
Uydun yalanların harasına sən?
Divara vurulan şəkillərdəki
Üzünün yaxşı bax qarasına sən.

Yalana aldanan "ağıllı" adam!
Özünü, sözünü yalan etdilər.
Vəzifə deyilən bu kor eşşəyə
Səni çul etdilər, palan etdilər.

Yalana aldanan "ağıllı" adam!
Bu – axur, bu – saman,
bu – tövlə, bu – dam!

*10 dekabr 2020-ci il*

## Tutuquşu məclisi

Qatılaşır dünyanın çəni, dumanı, sisi...
Hər tərəfi bürüyüb pası, tüstüsü, hisi...

Hamı eyni cür çalır, eyni cür oxuyur, bax!
Kimisə keyləşdirib,
Ortada əyləşdirib
Birisi palan tikir, biri çul toxuyur, bax!

Uzun sözün qısası, çıxıb çox şeyin pisi...
Qurtarmır ki, qurtarmır tutuquşu məclisi...

*29 oktyabr 2016-cı il*

## Məqamdır

Məqamdır,.. öz-özümdən
durum intiqam alım.
Əvvəlcə ürəyimi
ayağım alta salım.
Deyim: – Di öl, taptalan.
Səni yola gətirmək
ağ yalandır, ağ yalan!

Sonra da ikiəlli
qapaz salım başıma.
Qaldırım, çırpım onu
yolun-izin daşına.
Deyim: – Paralan, dağıl!
Məni pis günə qoydu
səndə olan bu ağıl!

*04 avqust 2009-cu il*



*Başını sapanda qoyan adam*

## Nə var

Ərlər cəsarətli, mərdlər mətindir...
Namərdlik eləyib ölməyə nə var?
Dünyanı bir yerə yığmaq çətindir ...
Dünyanı min yerə bölməyə nə var?

*5 sentyabr 2017-ci il*

## Qardaş, qada, qadaşcan

Dolub-dolub daşmısan,
Özünü də aşmısan.
Nədən belə təntiyib,
Nədən belə çaşmısan?
Nəslimizin başına
Tanrı salan daşmısan?
"Böyük adam" olunca
Dönüb uşaqlaşmısan.

Qardaş, qada, qadaşcan.
Ürəyin yoxmu daşcan?

Olmayan papağınla
Qarpışıb əlləşmisən.
Başını daşa döyüb
Əcəb təpəlləşmisən,
Əcəb qaşqalaşmısan.
Sən ki belə deyildin,
Tamam başqalaşmısan.
Qardaş, qada, qadaşcan.
Ürəyin yoxmu daşcan?

Evlənən gündən çıxıb
Atan evi yadından.
Yolun kəndə düşəndə
Qaynatanın evində
Düşüb dəmir atından
Anana zəng edirsən
Qaynananın adından.
Qardaş, qada, qadaşcan.
Ürəyin yoxmu daşcan?

*11 aprel 2015-ci il*

## Uybala

Görməyib, quyu var ayağı altda.
Uybala uyuya-uyuya düşüb.
Dəli bir daş atıb, o daş da, hətta...
Uybala uyuyan quyuya düşüb.

*7 iyul 2017-ci il*

## Boş şeydir

Nə qədər istəyirsən sığallan,
Nə qədər istəyirsən parla!
Ey əkilməyən torpaq,
Becərilməyən tarla!

*12 iyun 2018-ci il*

## Batdın, əmoğlu, batdın!

Yaddaşın yox, yadın yox ...
Ünvanın yox, adın yox ...
Ət yeyəsi dimdiyin,
Uçası qanadın yox ...
Nə qurdun, nə yaratdın?
Batdın, əmoğlu, batdın!

Dünya iki üzlüdür,
Gecəli-gündüzlüdür.
Özü də yupyumburu,
Dərəlidir, düzlüdür.
Get ha, get ha ki, çatdın!
Batdın, əmoğlu, batdın!

Döyəsi qapı yoxsa,
Qanun yox, tabu yoxsa.
Dalında qarlı dağlar,
Əlində habı yoxsa,
Ağ üzünü qaraltdın.
Batdın, əmoğlu, batdın!

Hər yer qırmızı lentdir.
Qiyməti bircə sentdir.
Burda rəis lent kəsən,
Başçı "president"dir.
Fil qulağında yatdın.
Batdın, əmoğlu, batdın!

Kişilər dişiləşdi ...
Dişilər kişiləşdi ...
Dodaqlar qaymaqlaşıb,
Dillər kişmişiləşdi...
Şabalıdı, fındığı
Dəyər-dəyməzə satdın.
Batdın, əmoğlu, batdın!

*3 iyun 2016-cı il*

## Bakıda yaman gec açılır səhər...

Bakıda yaman gec açılır səhər...
Küçə süpürürlər tezdən duranlar.
Yatır səkilərdə, skamyalarda
Sarımsaq çörəklə yüz-yüz vuranlar.

Bakıda yaman gec açılır səhər...
Onda da gözləri yuxulu olur.
Orda quzu kimi yatır yatanlar,
Orda oyananlar qorxulu olur.

Bakıda yaman gec açılır səhər...
Nə olsun, keçibdir gün günortadan?
Girləyir başını hərə bir təhər,
Güya, umu – küsü qalxıb ortadan.

Bakıda yaman gec açılır səhər...
Amma ki, Xəzərdə gəmilər oyaq.
Vağzallar, otellər nəzarət altda ...
Hesabdar dayılar, əmilər oyaq.

Bakıda yaman gec açılır səhər
Bircə salam versən Günəşə, bəsdir.
Naxışlı, bəzəkli qapıya baxıb
Vaxt-vədə gözləmək orda əbəsdir.

Bakıda yaman gec açılır səhər
Rayondan Bakıya gələnlər üçün.
Sənin nə işin var orda, əmoğlu?
Kəndə gəl, dua et ölənlər üçün.

*12 iyun 2016-cı il*

## Qəbristanlıq üzərində lövhə

Hürülərdən Hürülərə!
Pərilərdən pərilərə!
Pirilərdən Pirilərə!
Ölülərdən dirilərə
SALAMLAR
Tələsməsin
bizdən dala qalanlar!

*23 aprel 2012-ci il*

## Dəymə! Yıxılar! Yavaş!..

Rəssamam...
Baş çəkirəm.
Göz qoyub,
qaş çəkirəm.
Sağ gözə sevinc çəkir,
sol gözə
yaş çəkirəm.
Sifariş edənlərə
"baş üstə" söyləsəm də.
Baş üstə
daş çəkirəm.
Altda baş,
üstündə daş...
Dəymə!
Yıxılar!
Yavaş!..

*21 fevral 2019-cu il*

## Qəribə adam

Qəribə bir adam gördüm
Ağlı yaşından yuxarı.
Qaldırıb əlhəd daşını
Baxır daşından yuxarı.

Qarışıqdır suyu, gili ...
Bilinməyir ayı, ili.
Ağzına sığmayır dili,
Gözü qaşından yuxarı.

İbinə oğlu ibinə
Cumub nəfsinin dibinə...

Qalıb ivinə-ivinə...
Əlləri çatmır cibinə...
Qarnı başından yuxarı.

Quru bilmir, yaş tanımır.
Ayaq qanmır, baş tanımır.
Öldürsən də aş tanımır
Ehsan aşından yuxarı.

Qəribə bir adam gördüm
Ağlı yaşından yuxarı.
Qaldırıb əlhəd daşını
Baxır daşından yuxarı.

*24 avqust 2018-ci il*

## İlə

Quş dilində danışdım neçə-neçə quş ilə.
Axır ki, yola verdim quşları Ququş ilə.

İstədim adam kimi bircə kərə söz deyəm.
Dilləníncə kəsdilər sözlərimi tuş ilə.

Dedim: – Gedək, bu yerdə yerimiz yoxdur bizim!
Yola saldılar bizi quşqunları boş ilə.

Yol boyunca şortdular, dayandırmaq olmadı.
Axır mənzilə çatdıq, amma “toşhatoş” ilə.

Gileyləndim,.. deyindim,.. arxamca soz atdılar:
– O hansı mətləbdir ki, olur xoşaxoş ilə?

Vaqif Aslan, bu dünya gözəldir gözəl üçün.
Çirkin gözəlləşməyir şampun ilə, duş ilə.

*24 fevral 2019-cu il*

## Dünya ilə dialoq

Uşaq idim...
Məmə bilib
əmziyi əmdim.
Məmə hara, əmzik hara???
Mən ağlı kəmdim...

İməkləmək həvəsiylə düşdüm beşikdən.
Ayaq tutub uzaqlaşdım evdən, eşikdən.

Dedim: – Dünya, səndən çıxıb qaçıram daha!
Dünya güldü: – Qapıları açıram daha.

Gedəcəyin yer varmıdır Yerdən ayrı bəs?
Ayaq saxla, əmzik görüb məmə bilən kəs!

Görmürsənmi?
Ölməmişdən gor içindəsən.
Dur, yaxşı bax!
Dünya boyda tor içindəsən.

*20 noyabr 2018-ci il*

## Bir-bir

Kənddə beş ev var idi.
Beş bacı yıxdı bir-bir.
Özləri özlərinin
Axırna çıxdı bir-bir.

Görüb ağrı-acını
Biri yoldu saçını.

Dörd bacı bir bacını
Köksünə sıxdı bir-bir.

Kəndin o gündən bəri
Pozuldu xeyri-şəri.
Beş bacı tökənləri
Yüz bacı yığdı bir-bir.

Laxladı çox təməllər.
Birləşəmmədi əllər.
Beş kənd boyda əməllər
Bir şeyrə sığdı bir-bir.

*09 sentyabr 2019-cu il*

## Piramida

Toy etdim,.. sandım ki, murada çatdım.
Mindi yavaş-yavaş dalıma arvad...
Mindi, topuğacan torpağa batdım.

Bir vaxt oğlum oldu, bir zaman qızım ...
Mən necə xoşbəxtdim, mən necə şaddım ...
Amma diziməcən torpağa batdım.

Oğlu evləndirdim, qızı köçürdüm ...
Qaynata olmağın dadını daddım.
Məni cüt-cüt mindi tək-tək minənlər ...
Onda qurşağadək torpağa batdım.

İndi nəvələrim çıxır başıma ...
Dərinə getdikcə mən addım-addım.
Belə qurulubmuş piramidalar...

Mən ki, piramida qurub yaratdım.
Daha boğazacan torpağa batdım.
Bir azdan dolacaq gözümə torpaq.
Heyrandır məndəki dözümə torpaq.

*26 fevral 2019-cu il*

## Şər ab

Gözünə qan sağılsın.
Sənə şər su deyənin,
Beyni daşa dağılsın.
Haramdır bu deyənin

Sən olmasan bilinməz
Kim aqildir, kim dəli.
Sən qəribə bir susan
Qədərincə içməli.

Nadanın nə xəbəri
Nələrin, nələrindən?...
Sən süzülüb gəlmisən
Cənnət meyvələrindən.

Sənin sular içində
Öz yerin, öz adın var.
Nə əcaib ləzzətin,
Nə qəribə dadın var.

Sən şüşədə gizlənən
Can kimisən, gözəl su.
Damarlarda qaynayan
Qan kimisən, gözəl su!

Sənə "şər ab" deyirlər.
Amma "şər su" deyilsən.
Sən ki, həyat suyusan.
Sən ki, hər su deyilsən.

*31 iyul 2017-ci il*

## Dostun pulu olmayanda

Dostun pulu olmayanda söz-söhbətlə aldadarlar.
Artıq boyun əti kimi tərəzidən salladarlar.
Üz-gözünə qara yaxıb, saqqalını çalladarlar.
Haldan salıb halladarlar.
Bal yerinə, yağ yerinə yal verərlər, yalladarlar.
Görəndə ki, bərk yeriyir, yavaşıdıb nalladarlar.

Dostun pulu olmayanda dostam deyib lağ edərlər.
Alçaldarlar, alçaltdıqca ağ edərlər.
Harınlıqla kefləri saz, damaqları çağ edərlər.
Yaxşılığı boğazlara bağ edərlər.
Zarafatla çox işləri dağ edərlər.
Sağı xəstə, xəstələri sağ edərlər.

Dostun pulu olmayanda pul-paradan danışarlar.
Dolaşdırıb söz-söhbəti ağ-qaradan danışarlar.
Gah Qızılgül yada düşər, gah Saradan danışarlar.
Gah qapıdan, gah bacadan, gah aradan danışarlar.
Pulsuz kişi, diqqət elə, gör, haradan danışarlar.
Çox dərdlərdən, çox əlacdan, çox yaradan danışarlar.

Dostun pulu olmayanda dost-tanışlar məzə qilar.
Təzəsini təbrik etməz, köhnəsini təzə qılar.
Qıldığını heç özü də bilməz hansı kəsə qılar.
Yandan baxan görsün deyə nəsə qılar.

Mənfəti hesabına dostdan kəsə-kəsə qılar.
Qıldığını çərə qılar, çörə qılar, pəsə qılar.

Dostun pulu olmayanda baş qatarlar ələm ilə.
Çek yazarlar, oynadarlar kağız ilə, qələm ilə.
Dərzi olub don biçərlər faiz ilə, sələm ilə.
Heç bilmirəm hara gedəm mən bu boyda şələm ilə.
Qolumdakı cələm ilə, ayağımda tələm ilə.
İcazə ver, Vaqif Aslan, halallaşım lələm ilə.

*03 sentyabr 2019-cu il*

## Köpək oğlu

*Kişi görəndə arvad...*
*Arvad yanında bərbad.*
*Yada dost, yaxına yad...*
*Xalqa paz köpək oğlu.*
***Hüseyn Arif***

Dombaltma gözlərini,
Ağlı çaş köpək oğlu.
Göyərtmə sözlərini,
Yekəbaş köpək oğlu.

Yuva salıb qanında
Biclik gəzir canında.
Lotu-potu yanında
Ağırdaş köpək oğlu.
Yeyilməyən çərəzsən...

Sağalmayan mərəzsən...
Halallığa qərəzsən.
Güya qohumpərəstsən...
Ay oğraş, köpək oğlu.

Görənlər oldu hali
Yanağındakı xalı.
Dodağı pomadalı...
Qələmqaş köpək oğlu.

Soxa-soxa burnunu
Çək başına fırnını.
Doyuzdurmur qarnını
Piti, xaş, köpək oğlu.

Vaqif Aslandan eşit,
Kim qorxaqdır, kim rəşid.
Sən kimsən? – bir sünək it!
Alabaş köpək oğlu!

*30 iyul 2012-ci il*

## Düdük

Qarşındakı dağdır, dibini qazma,
Yıxılar, altında qalarsan, Düdük.
Hissində dolaşıb, ağlında azma,
Özünü bəlaya salarsan, Düdük.

Atan söylədikcə şər əmanəti,
Anan haray saldı zər əmanəti.
Əmanət saymırlar hər əmanəti,
Gün gələr, payını alarsan, Düdük.

Nəyimə gərəkdir bildim-bilmədim...
Dalında kim durur, qabağında kim.
Sən ola bilməzsən özünə hakim,
Tüpürüb, sonra da yalarsan, Düdük.

Ey əsli-nəsliylə insanlara yuk!
Sən kimsən? – Ayıblı yerdə bitən tük!
Hər yetən əlinə verər bir düdük,
Ağzına alarsan, çalarsan, Düdük.
Düdüyü düdüyə calarsan, Düdük!

*23 mart 2013-cü il*

## Televizor

Televizor necə olar, ekran necə olar, axı?
Vurhavurdur, gurhagurdur axşam üstü, səhər çağı.

Bu kanalda qara zurna, o kanalda ney çalınır.
Ələ keçən hər nə varsa, çalındıqca hey çalınır.

Bu kanalda top atılır, göyə uçur ev-eşiklər.
Param-parça olub düşür göydən yerə ber-beşiklər.

Bu kanalda xalq artisti ətcəbala, çırım-çılpaq.
Abrın olsun, tamaşaçı, o yana yox, bu yana bax.

Bu kanalda qışqırırlar, bağırırlar yenə bar-bar.
O kanalda mitinqləri dəyənəklə dağıdırlar.

Bu kanalda gənc müğənni... Şalvarının dizi gedib.
Öz babalı öz boynuna, nə edibsə, özü edib.

Bu da madam-madonnadır, gərdən çəkib maral kimi.
Amma heyif, qarnı qalxıb saman dolu xaral kimi.

Kanala bax, soyundumu, tuman altdan kişi çıxır.
O kanalda o kişinin hələ indi dişi çıxır.

Bu kanalda əlində saz bir yekəpər aşıq oynar.
Aş bişirən müğənni qız əllərində qaşıq oynar.

Televizor necə olar, ekran necə olar, axı?
Vurhavurdur, gurhagurdur axşam üstü, səhər çağı.

*16 yanvar 2016-ci il*

## Axır zaman aşiqləri

*(21 dekabr 2012-ci il tarıxdə axır zamanı gözləyənlərə)*

**Ey ulular, eşidin, axır zaman olmuşdur!**
**Sağ müsəlman seyrəkdir, o da güman olmuşdur.**
**Yunus Əmrə (1239-1321)**

Axır zaman aşiqləri,
Çox-çox axır zaman olub.
Hər sonrakı axır zaman
Əvvəlkindən yaman olub.

Zamanın da ömür kimi
Tamamlanan zamanı var.
Dağın-daşın, odun-suyun,
Yerin-göyün tamamı var.

Axır zaman aşiqləri,
Axır zaman çoxdan olub.
Yox olanlar var idilər,
Var olanlar yoxdan olub.

Axır zaman aşiqləri,
Yadınıza yad olmayın.
Ayağınız altda dünya
Çökür, çox da şad olmayın.

Bundan sonra gələn zaman
Zamansızlıq zamanıdır.
Yamanlığın axırıdır,
Yaxşılığın tamamıdır.

*12 dekabr 2012-ci il*

# Çingiz Ənvəroğlu
## (Gördüklərim, bildiklərim)

### I

İndi hamının şair Vaqif Aslan kimi tanıdığı Vaqif Cumay oğlu Aslanovla mənim ilk tanışlığım 1977-ci ildə olub. O vaxt mən "Şəki fəhləsi" qəzetində jurnalist işləyirdim. Vaqif Aslan redaksiyaya yeni şeirləri ilə gəlirdi. Qəzetin redaktor müavini-öz biliyi və səmimiyyəti ilə çoxlarından fərqlənən Rəhim Maqsudov onu çox hörmətlə qarşılayıb şerlərini diqqətlə oxuyardı və demək olar həmin şerlərin hamısını növbəti nömrələrdə çapa verirdi. Onun şeirlərini hər dəfə qəzetdə oxuyanda məndə də Vaqif Aslana qarşı rəğbət və hörmət hissləri artırdı. Bu rəğbət və hörmət axır ki, dostluğa çevrildi. Vaqif Aslan isə dostlarına olan istək və arzularını şeirlə ifadə etməyi çox sevirdi. Onun 1999-cu ildə Rəhim Maqsudovun qızının toy məclisində bədahətən dediyi bu şeir dediklərimə əyani sübutdur:

Rəhim qardaş, dünya gencə dünyadır.
Gülü qönçə, zərif, incə dünyadır.
Səndən cavan, məndən öncə dünyadır.
Baharı da, payızı da bal dadır.
Necə deyim? – Dünya adam aldadır.

Rəhim qardaş, sözü çoxdur bizlərin
Əvvəl-əvvəl aydın olsun gözlərin.
Sevincindən şölə saçan üzlərin,
İşığından ürəyimə nur düşüb.
Mənə düşən işıq, vallah, gur düşüb.

Rəhim qardaş, biz ki dostuq köhnədən.
Ayrı şeydir ürəyimi göynədən.
Hardan gəldi, saçımıza düşdü dən?
Vaxtmı bizi qəfil tora salıbdır?
Gör kim vaxtın əllərində qalıbdır.

1950-ci ilin iyul ayının 5-də Şəkinin KİŞ kəndində dünyaya göz açan Vaqif Aslan Bakıda keçirdiyi ali təhsil illəri istisna olmaqla indi də öz kəndində yaşayır. O, ilk şeirini də burada yazıb, yəqin ki, son şeirini də burada yazacaqdır. Onun duyğularındakı saflıq təbiətdən gəlmə saflıqdır:

Sevinc verirəm sənə,
Kədərini ver mənə.
Gülüş verirəm sənə,
Qəhərini ver mənə.

Qəzəbini mənə ver,
Öldürüm sərtliyimlə.
Əzabını mənə ver,
Məhv edim mərdliyimlə.

Hirsinə zəncir olum.
Hissinə zəncir olum.

Ağrını da ver mənə,
Qayğını da ver mənə,
Qoy sənə yük olmasın!
Mən də səadətimi,
Gülüm, verirəm sənə.
Qoy sənin sevincinin
Üzü dönük olmasın!

Mən bu yazımda oxuculara Vaqif Aslanın tərcümeyi-halı haqqında məlumat vermək fikrində deyiləm, sadəcə olaraq, istədim ki, onun yaşadığı qədim və əzəmətli kəndin, həmin ərazinin, uca dağların onun formalaşmasındakı rolunu oxucularımın diqqətinə çatdırım.

1979-cu ilin sonlarında mən Şəki radio verilişləri redaksiyasında redaktor işləməyə başladım və radioda müstəqil verilişlər hazırlamaq imkanlarımdan istifadə edib Vaqif Aslanı "Ədəbi-bədii"

verilişlərə dəvət etdim. Hər dəfə Vaqif Aslan belə verilişlərdə şeirlərini səsləndirəndən sonra redaksiyamıza çoxlu məktublar gəlir, telefon zəngləri olurdu. İnsanlar onun şerlərini öz səsi ilə dinləmək arzusunda olduqlarını bildirirdilər. Bütün bunlar bizim görüşlərimizin və ünsiyyətimizin artmasına səbəb olurdu və beləliklə bizim dostluq münasibətimiz yarandı, ildən-ilə də möhkəmləndi. 2005-ci ildə Azərbaycanda İctimai Televiziya yarananda televiziyanın baş direktoru İsmayıl Ömərov məni Şəki-Oğuz-Qəbələ-İsmayıllı rayonlarına bölgə müxbiri təyin etdi. Hər dəfə kollektivin geniş toplantılarında İsmayıl Ömərov bizə tapşırıq verirdi ki, bölgələrdə xalq sənətkarları, xüsusi istedadı olan ziyalılar, maraqlı yeniliklər, müxtəlif hadisələr və kütləvi tədbirlər haqqında xəbərlər, sujetlər hazırlayaq. Həmin il Şəkiyə yağan ilk qar haqqında süjet hazırlayanda mən Vaqif Aslanı çəkilişə dəvət etdim və şair özü “Qar yağır” şeirini qar yağa-yağa dedi.

Lopa-lopa, quşbaşı,
Piltə-piltə qar yağır.
Ay könlümün sirdaşı,
Baxma, gəl, fağır-fağır.

Bizi indi üşüdən
Sinəmizin dağıdır.
Qışdır,.. bilmirsənmi sən?
İlin qızlıq çağıdır!

Nə sevimli yardır bu,
Tumurcuqda gizlənən,
Çiçəkdir bu, bardır bu.
Dövlətdir bu, vardır bu.

Ağlıqda elə bir rəng
Görmədim onun kimi.
Nəzərimdə tutduğum

Gəlinlik donun kimi
Soyunmaqçün geyilən,
Bəzəkdir, paltardır bu...
.................................
....................................

Vaqif Aslanın bu şerində qış fəslini ilin-təbiətin qızlıq çağı adlandırması ilk dəfə deyilmiş poetik, obrazlı ifadə kimi diqqətimi cəlb etmişdi.

2006-cı ildə İctimai Televiziyzda "Ovqat" verilişi ilk dəfə efirə gedəndə tamaşaçılar – xüsusilə ziyalılar tərəfindən çox böyük rəğbətlə qarşılandı. Mənim təşəbbüsümlə Şəki xan sarayının həyətində Vaqif Aslan "Ovqat" verilişinə dəvət edildi. Yenə mənim təklifimlə musiqi tərəfmüqabili kimi Şəkiyə Respublikamızın Xalq Artisti Gülyanaq xanım Məmmədova gəldi. Onu yerli musiqiçilər müşayiət etdilər. Rayonda yaşasalar da respublikada tanınan istedadlı tarzən Seyran Zülfüqarov, kamançada Rüstəm Xəlilməmmədov, balabanda məşhur zurna çalan Ələfsər Şəkilinin nəvəsi Ələfsər idi. Nəticə çox yüksək oldu, Vaqif Aslan həmin "Ovqat" verilişindən sonra təkcə Azərbaycanda deyil, demək olar ki, bütün dünyada tanındı. Mən bunu cəsarətlə dünyada deyirəm. Ona görə ki, veriliş efirə gedədən sonra Kanadada, Amerikada, Fransada, Böyük Britaniyada, İranda, Türkiyədə, Orta Asiyada, Çində, Hindistanda, Yaponiyada və başqa ölkələrdə yaşayan azərbaycanlılar telefon əlaqəsi, internet vasitəsi ilə İctimai Televiziyaya "Ovqat" verilişinə Vaqif Aslanın dəvət edilməsinə görə təşəkkür etmişdilər. Çoxsaylı müsbət rəyləri nəzərə alaraq İsmayıl Ömərov məni kabinetinə çağırıb bölgədə yaşayan belə nadir və istedadlı insanları verilişə təklif etdiyimə görə xüsusi təşəkkür etdi. Bir neçə aydan sonra departament direktoru, gözəl insan, səmimi dostumuz olan, şeir xridarı Fizuli İsmayılovun təşəbbüsü və televiziya rəhbərliyinin razılığı ilə Vaqif Aslan ikinci dəfə "Ovqat" verilişinə dəvət olundu. Amma bu dəfə çəkiliş televiziyanın studiyasında aparıldı. İsmayıl Ömərov öz kabinetində fasiləsiz aparılan çəkilişə baxıb Vaqif Aslanın zəkasına, onun şeirlərinin təbiiliyinə, xüsusi ahənglə danışıq diksiyasına

heyran olmuşdu. Çəkiliş başa çatanda Füzuli İsmayılov dedi ki, İsmayıl müəllim Vaqif Aslanı və səni kabinetinə dəvət edir. Biz birlikdə İsmayıl Ömərovun kabinetinə getdik. İsmayıl müəllim Vaqif Aslanı xüsusi hörmət və ehtiramla qarşıladı. Təxminən 40 dəqiqə davam edən səmimi söhbətin axırında İsmayıl Ömərov Vaqif Aslana dedi ki, bizim televiziyanin qapıları sizin kimi ziyalıların üzünə daim açıqdır, istədiyiniz verilişə, arzu etdiyiniz mövzuda qatıla bilırsiniz. Budan sonra neçə illər boyunca Vaqif Aslan departament direktorlarından Füzuli İsmayılov, Natiq Qubadoğlunun-Abdullayevin, redaktorlardan Rafiq Nəbiyevin, Kamil Məmmədovun, gözəl şair Əli Aslanoğlunun təşəbbüsü ilə "Ovqat" və "Sovqat" verilişlərinə, Yusif Günaydının "Qərib axşamlar"ına, ənənəvi olan "Novruz bayramı şənliklərinə" və başqa elitar verilişlərə dəfələrlə dəvət edildi. Hər dəfə də televiziyanın ümumi toplantılarında Vaqif Aslanın iştirak etdiyi verilişlərin yüksək səviyyədə alındığı xüsusi qeyd edilirdi.

O illərdə böyük şair Bəxtiyar Vahabzadə hər ilin yay aylarında Şəkiyə gəlirdi. Mən onunla görüşə və televiziya üçün çəkilişlər aparmağa Vaqif Aslanla birlikdə gedirdim. Onların söhbətləri çox maraqlı olurdu. 1997-ci il idi. Belə görüşlərin birində mən Bəxtiyar müəllimə dedim ki, Vaqif Aslanın 1992-1994-cü illərdə qələmə aldığı "Ruhlarla söhbət" əsəri artıq çap edilmişdir. Söhbətimiz boyük şair Bəxtiyar Vahabzadənin diqqətini çox çəkdi. Biz bir gün sonra yenə Bəxtiyar müəllimin evinə gəldik və Vaqif Aslanın "Ruhlarla söhbət" əsərini ona verdik. Növbəti görüşümüzdə böyük şair Bəxtiyar Vahabzadə Vaqif Aslanı köksünə sıxmış və fikirlərini söyləmişdi. Bu əsərdə tarixi şəxsiyyətlər olan dövlət başçılarının qarşı-qarşıya gəlməsindən, onların mənəm – mənəmliyi ucbatından ölkəyə və millətə vurulan ziyanlıqlardan, bunun qarşılığı olaraq düşmənlərin qələbəsindən, sonrakı peşimançılıqdan danışılırdı. Bəxtiyar müəllim bu əsər haqqında mərkəzi mətbuatda öz fikrini bildirəcəyini dedi. Biz salamatlaşıb ayrıldıq. Bəxtiyar müəllim bir neçə gündən sonra Bakıya qayıtdı, bizim növbəti görüşümüz bir ildən sonra, Bəxtiyar müəllim Şəkiyə gələndə baş tutdu. Yenə hə-

mişəki kimi səmimi görüşlər oldu, elitar söhbətlər edildi, ölkəmizdə və dünya ədəbiyyatındakı yeniliklərdən danışıldı. Mövzunun davamı kimi "Ruhlarla söhbət" əsərini mən yada salanda Bəxtiyar müəllim çox qətiyyətlə cavab verdi ki, Vaqif Aslanın bu əsəri aktual mövzudur, hər dövr üçün gərəkli, tövsiyyəvidir. Bu əsər böyük teatrlarda səhnəyə qoyulmalıdır, film şəklində dünyaya yayılmalıdır ki, ölkə başçıları bu əsərdəki hadisələrin təsirindən faydalansınlar, birinci şəxslərin ambisiyasından xalqın, dövlətin nə qədər fəlakətlərlə qarşı-qarşıya qaldığının şahidi olsunlar.

Mən ötən il bu əsəri oxudum və uzun müddət onun təsirindən çıxa bilmədim. Çox düşündüm və həmin mövzuda "Özümüzü kəsən qılınc" pyesini yazdım.

Vaqif Aslanla Bəxtiyar Vahabzadənin görüşləri həmişə mənim üçün çox maraqlı olrdu. Uca dağların zirvəsindən başqa zirvənin görünməsi nə qədər maraqlı olursa, onların görüşü və yüksək səviyyəli, ədəbi-bədii söhbətləri də mənim üçün bir o qədər maraqlı olurdu. Həm də mən bu görüşlədən maraqlı verilişlər hazırlayırdım.

**P.S.** Yer gəlmişkən deyim ki, Bəxtiyar Vahabzadədən sonuncu müsahibəni mən almışam. O zaman mən İctimai Televiziyanın Şəki-İsmayıllı rayonlarında bölgə müxbiri işləyirdim və həmin görüşə də Vaqif Aslanla birlikdə getmişdik. Həmin görüşün video görüntüləri mənim şəxsi arxivimdə vardır. Orada yadda qalan bir hadisə də oldu. 83 yaşı bitməsi ilə əlaqədar olaraq Bəxtiyar müəllimi təbrik etməyə getmişdik. Şəkidən və Ağdaşdan gələn qonaqlar var idi. Bəxtiyar müəllimin qızı Güzar xanım gözəl bir tort hazırlamışdı. Zəngin şirniyyat süfrəsi açılmışdı. Hamının utanıb sakit oturduğunu görən Güzar xanım tortu kəsib qonaqlara payladı. Bəxtiyar müəllim qonaqlara dedi ki, çayınızı soyutmayın, tortdan, başqa şirniyyatdan yeyin. Ancaq heç kim süfrəyə əl uzatmırdı. Bəxtiyar müəllim bir də bizə təklif edəndə mən onun boşqabındakı tortu əlimdəki çəngəllə bölüb bir ağızlıq götürdüm və ona tərəf uzadıb dedim:

– Bu tort sizin şərəfinizə hazırlanıb, birinci siz yeməlisiniz, sonra biz. Əgər siz yeməsəniz, biz bu tortdan yeyə bilmərik, ona görə də ağzınızı açın, mən bu tortu sizə yedirmək şərəfinə nail olum.

Bu ərkyana zarafata hamı güldü, Bəxtiyar müəllim mənim təkidimlə ağzını acdı və mən tortu ona verdim. Yenə hamı güldü. Bəxtiyar müəllim tortu yeyib çayını içdi və üzünü mənə tutub dedi:

– Çingiz, sən elə iş elədin ki, mən ömrüm boyu sənin üzünə qayıda bilmərəm!

Mən ona cavab olaraq dedim:

– Allah eləməsin, biz bri-brimizin üzünə qayıdaq! Bu heç vaxt ola bilməz, amma mənim sizdən bir xahişim var. Mən sizə zəng edəndə, sizə çəkilişə gəlirəm deyəndə mənə deməyin ki, 2-3 gündən sonra gələrsən. Bax, bu mənim üçün heç kimdə olmayan ən böyük səlahiyyət olar. Bəxtiyar müəllim dedi: "Sən bu səlahiyyəti qazandın"! Mən də Bəxtiyar müəllimin mənə verdiyi föqəlqdə səlahiyyətdən istifadə edib bu yazını yazdım!

## II

İndi mən Vaqif Aslanın şeirlərinin necə ərsəyə gəldiyinə şahid olduğum məqamlardan danışacağam. 2006-cı ilin axırıncı ayında biz gözəl ziyalı dostumuz Səyyarə xanım Səyyafın toyuna dəvət edildik. Vaqif Aslanla görüşüb həmin toya necə, nə vaxt getməyi müzakirə edirdik. Birdən ağlıma belə bir fikir gəldi. Dedim ki, şair, Səyyarə xanım çox talantlı, xüsusi istedadı olan ədəbiyyat adamıdır, şeir xridarıdır, onun məclisinə məxsusi şeir yazsan, çox əla olar. Vaqif Aslan mənə dedi ki, mən ömrümdə bir dəfə də olsa sifarişlə şeir yazmamışam. Mən dedim: "Şair, bu sifariş deyil, dost görüşünə şeirlə getsək, daha yaxşı olar." Bir neçə gün bu mövzuda söhbətimiz davam etdi. Çətini Vaqif Aslanı bu mövzuya cəlb etmək idi və buuna nail olmuşdum. Yenə gecənin yarısı telefon zənginə ayıldım. Zəng edən adəti üzrə Vaqif Aslan idi. Dedi: "Sən deyən şeri yazdım." Dedim: "Oxu!" O, telefonda bu şeri mənə oxudu:

Bu körpünü quran qurdu…
Mən də ondan keçər oldum
Küsmə məndən, atam yurdu!
Özümə yurd seçər oldum.

Qızıl idi qızlıq çağım
Şahidimdir bağçam,bağım.
Xınalandı əl-ayağım,
Gəlin olub köçər oldum.

Mən gedərəm, anam ağlar…
Ey dalımca baxan dağlar.
Qurumasın buz bulaqlar,
Bəlkə, bir də içər oldum.

Bacısından doyan qardaş!
Özgələrə uyan qardaş!
Taleyimə qıyan qardaş!
Di gəl, səni qucar oldum!

Salamat qal, bar ağacım,
Alma, armud, nar ağacım.
Böyüdükcə yar ağacım,
Uçurtdular, uçar oldum.

Sağlıq olsun, çiçəklərim,
Tənəklərim, dibçəklərim,
Yalanlarım, gerçəklərim,
Sizə könül açar oldum.

Ev işlərim, əl işlərim…
Adətlərim, vərdişlərim…
Kürlüklərim, gərdişlərim…
Ayrılığa düçar oldum.

Bu körpünü quran qurdu…
Mən də ondan keçər oldum.
Salamat qal, atam yurdu!
Özümə yurd seçər oldum!

Bakıda böyük şadlıq saraylarından birində möhtəşəm bur toy şənliyi təşkil edilmişdi. Rayonlardan, qonşu dövlətlərdən toya sanballı ziyalılar gəlmişdi. Çoxları yeyib-içib şənlənmişdi. Gecə saat 12-yə bir neçə dəqiqə qalmış Vaqif Aslana söz verildi. Mən çox narahat idim ki, bu haray-həşirli zalda adamlar necə sakitləşəcək, şeirə kim qulaq asacaq. Vaif Aslan öz təmkini və xüsusi intonasiyası ilə təbrikinə başladı. Onun məntiqli və məzmunlu danışığı tezliklə adamların diqqətini cəlb etdi, həmin şeir deyilində zalda inanılmaz bir sakitlik hokum sürürdü. İnsanlar sakitlik olsun deyə sanki nəfəs almırdılar. Uzun illər iştirak etdiyim Bakı toylarından fərqli olaraq, məclisin ab-havası məndə əminlik yaratdı ki, bu toyda iştirak edənlər həqiqətən sözə qiymət verən, söz qədri bilən adamlardır. Şair şeiri deyib qurtaranda zalda gurultulu alqış səsləri yüksəldi. Bu alqış sədaları altında Səyyarə xanımın valideyinləri və tanımadığım bir çox insanlar yaxınlaşıb Vaqif Aslanla görüşüb ona təşəkkür etdilər. Alqış sədaları altında biz bəylə gəlinin oturduğu səhnəyə yaxınlaşanda Səyyarə xanım ayağa qalxıb Vaqif Aslanı hörmət və ehtiramla qarşıladı, məclisdə iştirak etdiyimizə görə bizə təşəkkür etdi. Biz həmin toydan çıxanda gecə saat 2 olardı. Biz gecəni Bakıda qalıb səhər xoş təəssüratlarla Şəkiyə qayıtdıq.

Bir dəfə mən Vaqif Aslanla onun iş otağında görüşdüm. Şəhərin mərkəzində, Nakam adına kitabxananın ikinci mərtəbəsində olan bu geniş otaqdakı kitab şkaflarında çoxlu kitablar-xüsusilə də bədii ədəbiyyat nümunələri var idi. Azərbaycan Yazıçılar Birliyinin bölgədəki üzvləri rayonlar üzrə müəyyən edilmiş günlərdə, təyin edilmiş saatlarda həmin otağa toplaşır, yazdıqları yeni şeirləri, hekayələri, məqalələri oxuyur, onları müzakirə edirdilər. Mən onların belə toplantılarında tez-tez iştirak edirdim. Vaqif Aslan onları çox böyük diqqətlə dinləyib öz iradlarını, təkliflərini, məsləhətlərini verirdi. Hərdən qonşu bölgələrdən qonaqlar gəlirdi və Şəki yazarları ilə onların görüşləri təşkil edilirdi. Qazaxdan – gözəl insan, böyük şair Barat Vüsalla, Mingəçevirdən İsmayıl İmanzadə ilə, Gəncədən Məmməd Alimlə, Ağstafadan Qara Əhmədovla olan əlaqələr genişlənir, Qarabağ şairləri və ən çox da Bakıdan gələn ziyalılarla, söz-

qələm sahibləri ilə görüşlər təşkil edilirdi. Hətta həmyerlimiz gözəl şair Bəxtiyar Vahabzadə hər il yay aylarında Şəkiyə gələndə həmin otaqda yerli və müxtəlif rayonlardan gələn yazarlarla görüşürdü. Orada demək olar ki, böyük bir ədəbi məclis, yaradıcılıq mərkəzi fəaliyyt göstərirdi. Çox təəssüf ki, həmin bina əsaslı təmir edildikdən sonra Azərbaycan Yazıçılar Birliyi Şəki bölməsinə deyil, başqa qurumlara verildi. Böyük bir ziyalı dəstə, gənc şairlər, həvəskar yazıçılar, folklor həvəsksrları bir müddət çayxanalarda görüşməli oldular və sonra bu görüşlər azaldı, yaradıcı adamlar biri-birlərindən uzaq düşdülər.

2007-ci ilin yazı idi, mən Vaqif Aslanla həmin məkəzdə görüşdüm. Gələn-gedən çox olsa da, biz maraqlı bir mövzuda söhbət edirdik. Həmin vaxt Vaqif Aslan Şəki xanı Hüseyn xan Müştaq haqqında böyük bir əsər yazmaq üçün hazırlaşırdı və onunla bağlı tarixi faktları toplayırdı. Bu çox çətin və məsuliyyətli bir iş idi. Onu da deyim ki, Vaqif Aslanın bir çox əsərlərində istifadə etdiyi və araşdırdığı mənbələrdən topladığı faktlar bir neçə doktorluq dissertasiyası üçün kifayət edən materiallardan geniş və samballı olur. Bütün bunları gördükdən sonra məndə belə bir fikir yarandı ki, Vaqif Aslan bu zəka, bu kamillik, bu istedad və işgüzarlıqla Bakıda yaşasa idi, ölkə rəhbərləri onu dərindən tanıyardı və o çoxdan həm elm adamı, həm də böyük şair kimi daha da məşhur olardı. Biz otaqdan çıxıb pillələrlə aşağı endik və gedə-gedə söhbətimizi davam etdik. Mən bu məqsədlə Vaqif Aslana dedim:

– Allah sənə kömək olsun, sən bu savadla, bu istedadla Bakıda yaşasaydın, həyatın daha firavan, yolun daha işıqlı, taleyin tam başqa olardı. Nə var idi rayonda? Niyə gəlib burda yaşadın? Ataların belə bir sözü var: “Balıq dəryada böyüyər”. Sən gəlib bu bataqlıqda ilişib qaldın.

Vaqif Aslan, elə bil, dərin xəyallara daldı. Mən gördüm onun hətta addımlarının ahəngi pozuldu. Belə qəribə, xüsusi istedadlı insanlarla dostluq etmək çox çətin məsələdir. Gərək belə vaxtlarda sakitlik yaradıb onu ətrafdakılardan qoruyasan, qeyri-adi hərəkətlərinə mane olmayasan və onu öz düşüncələrindən ayımıyasan. Yıxıl-

masın deyə mən sakitcə onun qolundan tutdum və biz bir neçə addım belə getdik. Vaqif Aslan özü-özünə mənim sualımı təkrar edirdi:

Qarşıdan şairin kənd tanışlarından bir nəfər gəlirdi. O, yaxınlaşanda mən ona işarə etdim ki, sakit dur, danışma və biz yenə ahəngi pozulan addımlarla bir az da getdik. Həmin adam bir neçə addım gedib geri qayıtdı. Mən yenə ona işarə etdim ki, danışma, sakit dur. Həmin vaxt Vaqif Aslan bədahətən dediyi bu şeirlə mənim sualıma cavab verdi:

Mən bu kənddə qalmaz idim...
Yazıyla aldatdı məni.
Boynuma yük almaz idim...
Nazıyla aldatdı məni.

İşım-işım işıltısı…
Xışım-xışım xışıltısı…
Pıçıl-pıçıl pıçıltısı…
Sözüylə aldatdı məni.

Ey gedəri, ey gələri!
Sayım sənə mən nələri?
Qayım-qayım çeşmələri
Gözüylə aldatdı məni.

Qalasının daşı ilə…
Qayasının qaşı ilə…
Böyüklüyü, yaşı ilə…
Özüylə aldatdı məni.

Bax, yenə də yaşıl doudu…
Məndən ötrü daha sondu.
Zirvəsinə quşum qondu…
Düzüylə aldatdı məni.

Dilə tutdu axşam-səhər...
O – füsünkar, mən birtəhər...
Gördü məni çəkir şəhər…
Qızıyla aldatdı məni.

O, "Qızıyla aldatdı məni" deyəndə mən anladım ki, şair öz kəndindan aldığı, ailə qurduğu həyat yodaşını nəzərdə tutur. Deməli şair yaşadığı böyük bir sevginin kəməndinə düşüb kəddə qalıb.

Çoxlarından fərqli olaraq öz sevgisini mala, mülkə, var-dövlətə, vəziyfəyə, mənsəbə dəyişməyib. Bu isə onun həm şəxsiyyətinin, həm əxlaqının göstəricisidir.

Söhbətlərimizin birində mən Azərbaycanın böyük şairi Şəhriyarın "Getmə, tərsa balası, mən də sənə sayə gəlim. Damənindən yapışım, mən də kəlisaya gəlim" mətləli qəzəlindən "Nənə qarnında da sənlə əkiz olsaydım əgər, İstəməzdim doğulub, bir də bu dünyaya gəlim", "...Allahından sən əgər qorxmayıb olsan tərsa, Qorxuram mən də dönüb dini-Məsihaya gəlim. Şeyx Sənan kimi donquz otarıb illərcə, Səni bir görmək üçün məbədi-tərsaya gəlim" misralarını əzbərdən dedim və soruşdum: "Necədir?"

O dedi: "Maraqlıdır. Amma unutma ki, bu qəzəlin birinci və ikinci beyti Seyid Əzim Şirvaniyə məxsusdur. Deyilənlərə görə, Şəhriyar bunları anasından eşitmişdir". Günlərin birində gecənin yarısı, Vaqif Aslan mənə zəng etdi və dedi ki, ürəyin sakit olsun, mən Şəhriyarın həmin qəzəlinə bir nəzirə yazmışam. Oxuyum, qulaq as!

Sən özün hay elə ki, məndə durum haya gəlim.
Ölsəm, çağır, dirilim, bir də bu dünyaya gəlim!

Qoy gəlinlik donunu qalxım, öz əlimlə alım.
Bəzəsinlər səni hey, mən də tamaşaya gəlim.

Geyinim bəy libası, əl uzadım əllərinə.
Salınan gərdəyinə eşqi tutum qayə gəlim.

“Üz görümçək” əvəzi canımı qiymət eləyim.
Üstünə salmaq üçün bir əbədi sayə gəlim.

Təyin et vaxtı özün, seç saatı, saniyəni.
Üz tutum mən o günə, xoşladığın aya gəlim.

Bir nişan ver ki mənə, yerdə hara xoşdu sənə.
Yerdə yoxdursa yerin, yüksəlim səmaya gəlim.

Dilimiz bir, dinimiz bir, nə şikayət, nə giley?
Yaraşarmı mənə heç əfvə, təmənnaya gəlim?

Şirsə də Şəhriyarın şeiri əlində şəmşir,
İstəyirsən, belə bir şir ilə davaya gəlim!

Vaqif Aslana olub qəsdi səni xəlq edənin...
Hökm edibdir Yaradan, eşq ilə mənaya gəlim.

Sonralar bu qəzəl dəfələrlə böyük konsert zallarında, televiziya, radio proqramlarında səsləndirilib və bir çox ziyalı insanlar tərəfindən yüksək qiymətləndirilibdir.

Hörmətli oxucularım, mən bu yazımda tarixılik baxımından yerdəyişmələr olsa da, bunu təbii qəbul edin. Ona görə ki, bu yazı əvvəlcədən hazırlanmış ssenari əsasında yazılmayıb, bu yazı mənim Vaqif Aslan haqqında gödüklərim, bildiklərim, yadda qalan xatirələrimdir və onu indi yazdım ki, şair özü də oxusun səhvlərim olsa, iradını bildirsin.

*Şəki, 2018-ci il*

**Mayis Səlim**
***(1962-2019)***

# POEZİYAMIZIN DAHA BİR VAQİFİ – VAQİF ASLAN

Ədəbiyyat tariximizdə həm özü, həm də adı və ya təxəllüsü Vaqif olan sənətkarlarımız az deyildir: Molla Pənah Vaqif, Vaqif Səmədoğlu, Vaqif Bayatlı, Vaqif İbrahim... Şəki rayonunun Kiş kəndində yaşayıb-yaradan, on beş ilə yaxındır ki, AYB-nin Şəki bölməsinə rəhbərlik edən istedadlı qələm sahibi Vaqif Aslanı da cəsarətlə bu sıraya əlavə etmək olar. Özü mərkəzdən uzaqda olsa da, necə deyərlər, sözü həmişə poeziyamızın mərkəzində səslənən şair bu dünyaya arxalandığı Böyük Qafqaz dağlarının ucalığından baxır və həyat haqqında öz fəlsəfi-poetik qənaətlərini fikir süzgəcindən keçirərək obrazlı şəkildə oxucularına çatdırır. Vaqif Aslanın yaradıcılığı çoxşaxəlidir – elmi əsərləri, bədii tərcümələri, pyes və ssenariləri müəllifin hərtərəfli bədii təfəkkür və düşüncə sahibi olmasından xəbər verir, ancaq onun parlaq istedadı özünü daha çox poeziyasında göstərir – desək, yanılmarıq. Elə buradaca vaxtı ilə mərhum tənqidçi-alim Aydın Məmmədovun Vaqif Aslan poeziyasının əsas məziyyətləri haqqında yazdığı məqaləsindən kiçik bir parçanı misal gətirmək yerinə düşər: “Vaqifin şeirlərinin mərkəzində həmişə insan, onun hiss və həyəcanları durur. Səmimiyyət onun şeirlərində nəzər-diqqəti cəlb edən əsas xüsusiyyətdir. Toxunduğu mövzudan asılı olmayaraq, onun yazıları dağ çeşməsi kimi saf, uşaq gülüşü qədər səmimidir”.

Onu da qeyd etmək yerinə düşər ki, Vaqif Aslan Türkiyə və İran mətbuatında da dəfələrlə çap edilmiş, İranda ötən il şeirlər kitabı oxucuların ixtiyarına verilmişdir.

Hər dəfə gözəl şairimiz Vaqif Aslanın poeziyası haqqında düşünəndə yaddaşımda dərhal onun “Səndə şair olmamaq da günahdır” şeiri canlanır. Düzdür, bu şeir şairin doğma kəndinə müraciətlə yazılıb, ancaq şübhə yoxdur ki, müəllifin xoş yazını, sərt qışını, qə-

rənfilini, laləsini, nəğməkar bulaqlarını öydüyü, kol-kosuna, qanqalına belə vurulduğu bu yurd yeri, əslində, bütöv Azərbaycanımızın poetik obrazıdır:

Şair sənsən, şeir deyən dilin – mən,
Sərkərdəsən, qılınc vuran əlin – mən.
Gözəl sənsən, sevgilin – mən, dəlin – mən,
Bilmirsənmi, oğlun Kərəmsayaqdır,
Səndə şair olmamaq da günahdır.

Bu şeir düz otuz il bundan qabaq qələmə alınıb. Vaqif Aslan bu gün də ilk sevgisinə sadiq bir aşiq kimi o dağların qoynunda yaşayır, yazda güllərin-çiçəklərin xoş nəfəsini, bülbüllərin cəh-cəh səsini, qışda boy-boya dayanan, dümağ libasa bürünən dağların əzəmətini, bəzən haylı-haraylı, bəzən sakit-sakit axan

Kiş çayının səsini-sədasını özünəməxsus poetik deyimlərlə, maraqlı bənzətmələrlə

ifadə edərək varaqlara köçürür. Görün, özünü oxucusuna necə tanıdır:

Tanımaq istəsən məni dünyada,
Dolaş səhər-səhər bağçanı, bağı.
Lalə bitməyirmi sizin bağçada?
Şair sinəsindən tanınar axı!

Vaqif Aslan poeziyasında özünü qabarıq şəkildə göstərən cəhətlərdən biri də onun tariximizə möhkəm tellərlə bağlı olmasıdır. Bu bağlılıq heç də ayrı-ayrı tarixi hadisələri quru, sxematik bir şəkildə təsvir etməkdən ibarət deyildir. Tarixilik bu poeziyanın ruhunda, mayasındadır.

"Daş əlifba", "Saxsı qırığı üstdə yazı", "Qılınc", "Qalalar", "Kişilər", "Kərbəla faciəsi" və bu tipli başqa şeirlər müəllifin keçmişimizə üz tutaraq gələcəyimizi görməsinə, müxtəlif tarixi faktlara məhz şair gözü ilə baxaraq onları poetik deyimlə oxucusuna çatdırmasına əyani misaldır. Bir saxsı qırığı üstündə yazılmış tariximi-

zi Qobustanla – Azərbaycanın daşlaşan əlifbası ilə oxuyan şairi ikiyə parçalanmış torpağımızın yaraları göynədir, "Diriykən ayrılıq ölümdən acı, bizim başımıza tale salıb daş", – deyir. Təsəllisi isə bu olur ki, "Keşik çəkər ulu Azərbaycana, Əsrləri yara-yara qalalar, Daş köynəyi para-para qalalar!" Şair üstümüzə ayaq alanları, bizi arxadan vurmaq üçün girəvə gözləyənləri görəndə hayqırır, əlini qəhrəman babalarımızın yadigarı olan qılınca uzadır:

Sən ulu babamın yadigarısan,
Səbrin illər yorub, əsrlər yorub.
Nənəmin sehirli nağıllarısan,
Adın cinlər qovub, tilsimlər qırıb.

Matəm paltarındır bu qın, soyun, çıx!
Sinəmin qanıyla silim pasını.
Göynəyən əlimlə bir zərbə çalım,
Doğra, tök Vətənin qəm libasını!

Dədəmiz Qorquda üz tutaraq yazdığı şeirlərində də müəllifin soy-kökümüzə, milli adət-ənənələrimizə möhkəm bağlarla bağlandığının əyani sübutunu görürük. Gəlin, onun ağban evli, qızıl otaqlı, kafirlərə baş əyməyən igid oğuz bəylərinə, döyüşdə at minən, qılınc oynadan vəfalı oğuz xatunlarına verdiyi salamı eşidək:

Salam, ağban evləri qızılı tağlı bəylər,
Qızıl dirəkli bəylər, qızıl otaqlı bəylər!...
Salam, Burla xatunlar, salam, analar, salam,
Nağılları şipşirin noğul nənələr, salam!

Poeziyamızın əzəli və əbədi mövzularından olan məhəbbət mövzusundan Vaqif Aslan da yan keçməmiş və çoxlu gözəl sevgi şeirləri yaratmağa müvəffəq olmuşdur. Bu şeirlərdə tərənnüm olunan sevgi safdır, təmizdir, lirik qəhrəmanın ilk dəfə heyrətdən çatılan qaşıdır, haqq yolçusunun arxası-dayağıdır, ancaq neyləyəsən ki, ağrısı-acısı da boldur onun, çox vaxt gözdə yaşa, üzə çırpılan şillə-

yə çevrilməyi də var. Bütün bu əzablarına, sitəmlərinə baxmayaraq şair belə qənaətə gəlir:

Mən Cumayoğluyam, qandığım budur,
İnsanın başına tacdır məhəbbət.

Şairin şeirlərini oxuyanda elə bilirsən ki, onunla üz-üzə oturub söhbət edirsən. Və bu söhbət o qədər axıcı, maraqlı olur ki, onun uzandıqca uzanmasını istəyirsən. Bu da ondan irəli gəlir ki, Vaqif Aslan Azərbaycan ədəbi dilinin zəngin ənənələrindən bol-bol və yerli-yerində bəhrələnməklə yanaşı, yeri gəldikcə doğma Şəki ləhcəsinin şəhdi-şirəsindən, duzundan da öz poetik dilinə qatır, bu da onun şeirlərinə məxsusi bir üslub, xoş ahəng vermiş olur. Rüstəm Kamal demişkən: "V.Aslanın şair xoşbəxtliyi ondadır ki, onun həyatı, ömrü-günü canlı folklorun, şirin-şəkər ləhcənin içindədir, onun bir hissəsidir. Şəki ləhcəsinin yaratdığı magik çevrədən kənara çıxa bilmir. Dil oyunları, söz oynatmaları, ləhcənin zarafat-kinayə enerjisi V.Aslan lirikasına ayrı bir rəng, ayrı bir dad verir".

V.Aslan həm də pedaqoji fəaliyyətlə məşğul olur – ADPU-nun Şəki filialında baş müəllimdir. Gələcəyin filoloqlarına ədəbiyyat tariximizi tədris edir. Keçmiş tələbələri arasında respublikamızın müxtəlif mətbuat orqanlarında bədii yazılarla çıxış edənlər, kitab müəllifi olanlar da az deyil.

Əlbəttə, kiçik bir qəzet yazısında Vaqif Aslan yaradıcılığının özünəməxsus cəhətlərini, əlvan bədii-poetik çalarlarını, mövzu-ideya xüsusiyyətlərini ətraflı, dolğun şəkildə təhlil etmək mümkün deyildir. İndiyə qədər onun haqqında bir çox görkəmli alim-tənqidçilərimiz – Yaşar Qarayev, Tofiq Hacıyev, Aydın Məmmədov, Hüseyn İsmayılov, Rüstəm Kamal və başqaları irili-xırdalı məqalələr yazıb çap etdirmişlər. İnanırıq ki, bundan sonra da Vaqif Aslan yaradıcılığına geniş elmi-tənqidi aspektdən yanaşanlar çox olacaqdır. Mənim məqsədim isə qələm dostum Vaqif Aslan haqqında öz ürək sözlərimi, səmimi duyğularımı ifadə etmək cəhdindən başqa bir şey deyildir.

*"Ədalət" qəzeti. 2016. -16 iyul. – Səh.14.*

**Musa Həşimov**
**Böyüklük**
*(Əziz dostum, qardaşım, hörmətli şair-dramaturq Vaqif Aslana sonsuz hörmətlə)*

***Böyük-Böyük fikir, böyük ürəkdir,***
***Haqq özü səs verir onun səsinə.***
***Dünya, Vaqif Aslan, baş əyəcəkdir,***
***Daim böyüklüyün təntənəsinə.***
***Vaqif Aslan***

Böyüklük – insanda İlahi nurdur,
Böyüklük insanın gözəl qisməti.
Heç kəs əyə bilməz böyük olanı,
İlahi ucaldan, yüksəldən kəsi.

Böyüklük ən ülvi bir varlıq kimi,
Başını heç zaman əyməyəcəkdir.
Böyüklük nur saçan bir günəş kimi,
Qüruba ensə də, sönməyəcəkdir.

Cılız ürəklilər böyük olmayır,
Yatırlar bir sönük ad kölgəsində.
Sən isə ağlınla, ləyaqətinlə,
Yer tutdun böyüklük mərtəbəsində.

Böyüklük – varlığın, vuran ürəyin,
Böyüklük – damarda axan qanındır.
Böyüklük – amalın, arzun, diləyin,
Böyüklük – həyatda üz ağlığındır.

Yaşa, yaşa, var ol, sən Vaqif Aslan,
Vurğunuq şeirinin hər kəlməsinə.
Hələ neçə gözəl şeir qoşacaqsan,
Özün böyüklüyün təntənəsinə.

*17 dekabr 2019-cu il*

## Fəxrəddin Teyyub

### Nə yaxşı

*("Ovqat" verilişində istedadlı şair Vaqif Aslanı dinləyərkən)*

Dağların başını duman oxşadı
Qəlbimi bir arzu, güman oxşadı.
"Ovqat" ovqatımı yaman oxşadı
Ruhumun sazını demə çalan var.

Hər misran qartalın qanadı kimi.
Təbin dağ çayının inadı kimi.
Sözün şəhdi şəkər, bal dadı kimi.
Səni min sevən var, yada salan var.

Bəzən fağır-fağır boynunu buran...
Bəzən də qəlbində min xəyal quran...
Sözün keşiyində əsgərtək duran
Sənin qız balan var, oğul balan var.

Adamın üzünə baxtı gülsə də...
Alışıb göy yansa, yer sökülsə də
Şəhərin dilindən bal tökülsə də
Çəkib el dərdini yurdda qalan var.

Arxasız adamı bada verirlər
Qabağa özgəni, yadı verirlər.
Görmüşük adama adı verirlər...
Utanmaz-utanmaz neçə alan var.

Düzün düz,.. əyrinin öz adamları
Zaman qamçılayıb düz adamları.
Kimə üz tutardı söz adamları
Nə yaxşı Şəkidə Vaqif Aslan var.

*21 fevral 2017-ci il*

## Dr.Prof. Mahir Rəsulov. Təşəkkür məktubu

Vagif müellim, selam.

Kitabı (Söhbət "Hər şey zaman içində – Akademik Məcid Rəsulov" kitabından gedir) okudukca senin bir Allah vergisi olduğun kanaetine gelirem. Allah seni var etsin.

Eline, kalbine sağlıklar olsun.Bir daha teşekkür edirem. Allah seni korusun. Hörmetle: Mahir Rəsulov.Texnika elmləri doktoru. İstanbul. 18 oktyabr 2016.

## Məmməd Alim

*(16.03.1949, Goranboy, Xınalı k. – 28.08.2014, Gəncə)*

## Mən Gəncədə, Vaqif Aslan Şəkidə

Sənət ocağının başında durduq...
Mən Gəncədə, Vaqif Aslan Şəkidə.
Yazında, yayında, qışında durduq...
Mən Gəncədə, Vaqif Aslan Şəkidə.

Yarı aran, yarı dağlar oğluyuq...
Şeirimizin gülər, ağlar oğluyuq.
Çağımızın çılğın, çağlar oğluyuq
Mən Gəncədə, Vaqif Aslan Şəkidə.

Həm qulu, həm ağasıyıq biz sözün.
Saflığına sığasıyıq düz sözün.
Gecəsindən doğulduq gündüz sözün
Mən Gəncədə, Vaqif Aslan Şəkidə.

Tanrımız Göy, əcdadımız Oğuzdu.
Bəxtimizi alnımıza O yazdı.
Qazancımız bir qələm, bir kağızdı...
Mən Gəncədə, Vaqif Aslan Şəkidə.

Bilirikmi ayın neçəsindəyik?
Hansı ilin, fəslin qönçəsindəyik?
Nizami, Fətəli küçəsindəyik...
Mən Gəncədə, Vaqif Aslan Şəkidə.

Yüz arzu-istəkdə, min diləkdəyik...
Uğursuza uğur diləməkdəyik.
Səmimi səsləri dinləməkdəyik...
Mən Gəncədə, Vaqif Aslan Şəkidə.

Məmməd Alim, qəlbində qəm qırışıq...
Külək qara, qar küləyə qarışıq...
İki fərdik, fərqli qələm – qardaşıq.
Mən Gəncədə, Vaqif Aslan Şəkidə.

*Gəncə, 8 oktyabr 2012-ci il*

## Məmməd Mərzili
## Vaqif Aslana

Dava-dərman atmaq belə köməyinə çatmadı.
Uzaqlaşdım, əlim sənin kürəyinə çatmadı.
Ona görə dözmür ürək, harayına çatmadı.
Okeanda batıb gedir Qarabağtək bir gəmin.

Dərd birdimi, ikidimi dayanasan, a qardaş.
Bəlalardan, axı, hara yayınasan, a qardaş.
Zalımlarla durub necə öyünəsən, a qardaş.
Ürəyinə yük olubdur bu fikirlər, bu qəmin.

Çalış, onun yükün azalt, kədərlənmə bu qədər.
Salma kökdən bərkiməmiş budaqları dərbədər.
Dünyamızın düzəlməyi çətinsə də bu təhər.
Kişi olan boyun əyməz qabağında heç kimin.

Vaqif Aslan, Kiçik Qafqaz sinə dağım, düyünüm.
Həsrətində qaldım Dərbənd, Qırxbulağın suyunun.
Hamı bilir qurbanıyıq sirlər dolu oyunun.
Mənim üçün təsəllidi tərəqqisi ölkəmin.

*Dekabr, 2009-cu il*

## Qurtuluş Süleymanlı

*(1942-2018)*

## İçində

Şair oldun, Vaqif Aslan!
Yaradanlar içində.
Yaşayırsan yaxşı-yaman
"Ölü canlar" içində.

Dağ dayanar torpaq üstə.
Yuva qurma yarpaq üstə.
Bu dünya baş-ayaq üstə...
Asimanlar içində.

Bədbin olma, gəz şux kimi.
Bu dünyadır quyruq kimi.
Gəl, birləşək yumruq kimi
Biz insanlar içində.

Ucalt eşqinin xətrini.
Qoru şerinin sətrini.
Çiçək görsən, al ətrini.
Gəz cavanlar içində.

Gör, ürəyin nələr deyir.
İnsanlara gətir xeyir.

Layiq kəsə söylə şeir
Sözqananlar içində.

Cır meyvədə iri yoxdur.
“Ölülər” çox, diri yoxdur.
Namərdlərin yeri yoxdur
Müsəlmanlar içində.

Cır nəsildən nər tapılmaz.
Zəhmətsizdə tər tapılmaz.
Hər deyəndə zər tapılmaz
Bil, ümmanlar içində.

Kiş dağında qara bənzə.
Qızıl simli tara bənzə.
Şirin-şəkər bara bənzə
Yaşa canlar içində.

Qarşımızsa Çin sədləri...
Kimə deyək bu dərdləri?
Lənətləyib namərdləri
Boğaq qanlar içində.

Elimizin gur səsisən.
Kimsəsizin kimsəsisən.
Sən Aslanın nəvəsisən...
Ol aslanlar içində!

*Şəki, 14 iyun 1997-ci il*

## Səməd Salmanov
*(17. XI.1927-30.XII.2001)*

## Ədalət zəfəri
*Şair Vaqif Aslanın "Oğuz elinə salam" kitabını oxudum, həyəcanımı aşağıdakı misralarlaqeyd etməli oldum*

Mənəvi haq saysaq şöhrəti, şanı
Zirvədə görərik Vaqif Aslanı.
Biliyə qiyməti bilikli verər...
Aqillər tanıyar aqil insanı.

Gördüyüm zamandan duymuşdum, hamı
Bir gün tanıyacaq bu "Yanar şam"ı.
Zəhmətlə istedad onda birləşib.
Tanrı töhfəsidir çoşqun ilhamı.

Neynək ki, aqillər çölə atılır.
Fəxri ad Şəkidə pula satılır.
Ziyası olmayan ziyalı olur...
Ziyalı ələnib külə qatılır.

Biz nadan deyilik, baxırıq belə...
Əlləşir, əlləşsin şələynən lələ.
Günəşdən işıq, nur alan xalqımın
Ədələt zəfəri öndədir hələ.

*8 may 1999-cu il*
*Şəki, Orta Zəyzid*

## Həbillah Kamil
## Mənə baxma, sən yeri

Kitabını oxudum.
Gül nəfəsi qoxudum.

Düzü, bir az utandım...
Üzü yumuşağam mən.
Oxuyan kimi qandım
Bu yolda uşağam mən.
Şerimdə yeni-yeni
İşıqlanır dan yeri.

Özünü ucuz tutma!
Bir də məni unutma.

Dostların vəfalısı
Dar gündə olar, axı.
Ürək istər, əl çatmaz
Gözlərin dolar, axı.
Qırxında öyrənənlər
Gorunda çalar, axı.
Saqqalımda dən yeri.

Heç ağlıma gəlməyən
Diləklərdən yazırsan.
Adını bilmədiyim
Mələklərdən yazırsan.
Allahlardan yazırsan.
Fələklərdən yazırsan.
Sən göyü bilən kimi
Bilməyirəm mən yeri.

Sənin şeirlərindən
Güllərin iyi gəlir.
Kərəmi kül eyləyən

Tellərin iyi gəlir.
Qərinələr dalından
İllərin iyi gəlir.
Mənim şeirlərimdə
Duman yeri, çən yeri.

Gözümdə yox, maşallah.
Sənin yerin bu yolda
Vəzir yeri, xan yeri.

Hardan, nədən yazırsan...
Göynən gedən yazırsan.
Duz-çörəkdən yazırsan.
Lap ürəkdən yazırsan.
Yalan qata bilmərəm...
Yazan əlin var olsun!
Sənə çata bilmərəm...
Sənə uğurlar olsun!
Mənə baxma, sən yeri!

*1998-ci il.*
*Şəki, Orta Zəyzid kəndi*

## Ələhməd Əziz oğlu
## Vaqif Aslan sağ olsun

*İnsanın üzü bir olar...*
*Olsa, dünya düz olar.*
*Gecəsi elə gecə,*
*Gündüzü gündüz olar.*
***Vaqif Aslan***

Vaqif Aslan bəstədir.
Qələmi döş üstədir.
Kişin dolanbac yolu
Soyuq bulaq üstədir.

Məryəm oğlu İsanın
həvarisi Yelisey
bir vaxt Şəkiyə gəldi.
Onu bəyəndi, hey-hey!
Kişdə dayandı hey-hey!

Əzizim, inci-inci...
Nə küs məndən, nə inci.
Şəki gözəl pəridir,
Kiş boynunda bir inci.

Vaqif Aslan sağ olsun.
Qələmi iti olsun.
Onu sevməyən kəslər
Qapımda itim olsun.

*Qəbələ, Nic kəndi. 2016-cı il*

## Telman Həmidli

*(Fotoqraf-jurnalist, Beynəlxalq "Qran-Pri" mükafatı laureatı)*

## Vaqif Aslan – 70

İslam övladıdır, "Quran"ın ətri
Vaqifin gördüyü işlərdən gəlir.
Bu Odlar Yurdunun jurnalist oğlu
Onu alqışlayır, təbrikə gəlir..

Yanaşıb hər kəsə dost-qardaş kimi.
Artıbdır hörməti duz-çörək kimi.
Hara qəd əm bassam, ondan deyirlər.
Qeyrətli, namuslu, mərd söyləyirlər.

Gələnlər-gedənlər çoxdur dünyada.
Gül açır, sonra da solub tökülür.
Yaxşılar olsa da az-çox həyatda,
Vaqifin həmişə yeri görünür.

Ömürlər yayından çıxan ox kimi...
Həyatdan ad-sansız köçən çox oldu.
O elə keçdi ki, çətin sədləri
Ad-sanı dillərdə lap əzbər oldu.

Qalxdı pillə-pillə yetmişə doğru.
Dünyada layiqli bir iz də qoydu.
Var-dövlət toplayan bir simic deyil,
Əl tutan, xeyirxah bir insan oldu.

İnsanlar birlikdə ömür sürürlər...
Çalışıb-vuruşub, axır köçürlər.
Birisi həyatda yaxşı ad alır.
Birinin həyatda adı bəd qalır.

Hər iki dünyada halal payı var.
Göylərə ucalan adı-sanı var.
Hörməti böyükdür xalqın içində.

Yer salıb qəlblərin dərinliyində.
Bax, budur diləyim, istəyim, düzü:
Vaqifi qorusun Tanrının özü!

*Şəki şəhəri, 6 oktyabr 2020-ci il*



*"Şəki fəhləsi" qəzetinin foto-müxbiri Telman Həmidli tərəfindən çəkilən foto-şəklim. Şəki, 1975-ci il*

**Akif Salamoğlu**
**Şeir**

Canında bu qədər fəlsəfə hardan?
Yəqin ki, verilib lap yuxarıdan.
Elə yazırsan ki, sevgidən, yardan
Sevgiyə bürünüb qərq olur insan.
Dövlətə yox ehtiyacı yurdumun
Sən Şəkinin dövləti, həm varısan.
Vaqif Aslan, səni Allah saxlasın!
Böyük Bəxtiyarın yadigarısan!

*12 aprel 2011-ci il*

*(Bax Akif Salamoğlu. Oralar necədir? Səh.68. Bakı, "Elm və təhsil", 2015)*




*20 iyun 2015-ci il. Vaqif Aslan və Akif Salamoğlu bir-birinə öz kitablarını bağışlayarkən*

## Sakit Köçəri

*(Oktyabr, 1946, Dağıstan, Axtı rayonu, Xınov kəndi –*
*20 aprel 2010, Dağıstan, Dərbənd şəhəri. Dəfn yeri – Şəki)*

**Şair Vaqif Aslana**

Tarixi şərəfli məzlum xalqların
Dərdləri köksümdə çaxır, ay Vaqif.
Bal yesə də ağa əsarətində,
Nökər fağır olur, fağır, ay Vaqif.

Bu bazar arsızın, dələduzundu.
Burda oğru, əyri dilizundu.
İsti yer çox zaman qəlbi buzundu.
Yalquzağa qalıb naxır, ay Vaqif.

Yurdun nəhəngləri qalıb qıraqda.
Cırtdan dağ başında, baxta bax, baxta.
Alçaq zəmanədə şərəfli taxta
Bəzən şərəfsizlər çıxır, ay Vaqif.

Daşlaşıb ürəklər sal daşdan betər.
Ağırdır ömr adlı yol – daşdan betər.
İnsanı alovdan, ataşdan betər
Ehtiyac yandırıb yaxır, ay Vaqif.

Tərsə Allahdanmı dönüb hesab, san?
Arsızlıq, irsizlik edilir şayan.
Vətəni yesə də gözüdoymayan,
Analar satqınlar doğur, ay Vaqif.

Bezibdi Köçəri “söyüd barından”.
Minnətli çörəyin loxmalarından.
Doğmalıq görməsən doğmalarından,
Vətən də adamı sıxır, ay Vaqif.

*Şəki. May, 2009-cu il*



*Aşıq Sakit Köçəri, Rəsul İkməddinoğlu və Vaqif Aslan. Şəki, 2008-ci il*

**Niyazi İdrisli**

**Kitabın**

*(Hörmətli şairimiz Vaqif Aslana müzakirələr vaxtı)*

Çörəyi ver çörəkçiyə dedilər
Qıl verəndi ələkçiyə dedilər.
Bişmişi də çiyə qatıb yedilər.
Nəql eylədi hesabdarı kitabın.

Quzğun kimi töküldülər üstünə.
Mən ortağam başdan çıxan tüstünə.
Döndərdilər "Molla Cuma çustu"na.
Bircəsini saxla, barı, kitabın.

Görüm kitabının cildi sökülsün.
Əl-əl gəzsin, vərəqləri tökülsün.
Oxunduqca ləzzət ilə bükülsün.
Üzü dönsün mənə sarı kitabın.

Təzəsinin qalmasa da, qalığı...
Razıyam ki, mənə çatsın lalığı.

Nə vaxt tutsan təptəzədir balığı.
Bəsdir mənə tək buxarı kitabın.

Niyaziyəm, hər bir işə çataram.
Alanları bir-birinə qataram.
Axıtsan da çay aşağı, tutaram
Mənasını çay yuxarı kitabın.

*15 dekabr 1997-ci il*

## Vəliş Zirvəli
## Olanda

*(Vaqif Aslana)*

Şair hökm eləyər sözə şah kimi...
Qələmin, vərəqin qulu olanda.
Sayılar, seçilər ağsaqqal kimi
Müqəddəs olanda, ulu olanda.

Xəyal sərhədləri aşarmış demə.
Hər sözdə min hikmət yaşarmış demə.
İnsan dəniz kimi coşarmış demə
Sinəsi söz ilə dolu olanda.

Hər şeir sayılmaz inci, gövhər, ləl...
Vəliş, elə söz de, sözünlə yüksəl.
Vaqif Aslan dedi: – Olur mükəmməl
Şair öz imzası, qolu olanda.

*Şəki, 22 aprel 2014-cü il*

***P.S. Hal-hazırda Şəkidə məskunlaşan Vəliş Zirvəlini İkinci Qarabağ müharibəsində (27 sentyabr – 10 noyabr 2020-cil) çaldığımız qələbə münasibəti ilə təbrik edirəm. Azad edilmiş torpaqlarımız sırasında Vəliş Zirvəlinin dünyaya göz açdığı Laçın rayonu Oğuldərə kəndi də vardır.***

## Mehman Şaban oğlu Salamov

Çox hörmətli Vaqif Aslana ən səmimi salamlarımı çatdırıram. **“Qanımdan rəng alan gül”** kitabınınızı çox sevdim. Mən Sizinlə əsla söz deyişməsinə, şairlik yarışına girişmək düşüncəsində deyiləm. Sadəcə, necə oldusa, özümdən asılı olmayaraq, qəfildən Sizə bildirəcək dərin təşəkkür və minnətdarlığım bir söz düzümünə çevrildi. Hörmət və ehtiramla.

## Qalıbmış

Bir “gül” bağışladılar – rəngi Aslan qanından...
Güllər padişahıymış, xəbərim yox adından.
Uçmaq dilədim sanki quşların qanadından.
Nikbinlik dalğaları keçdi dərhal canımdan.

Sanki ayıltdı məni qəflətin yuxusundan.
Çox ümidlər duydum mən bu “gül”ün qoxusundan.

Sən demə, min dərdin də min bir əlacı varmış.
Bədbinliyə qapılan qəfildən ayılarmış.

Bu ruhu canlandıran qandan gələn qoxuymuş.
Əcdad ruhun varisi, əsil millət oğluymuş.

Millətin bu gününə bir Aslanı qalıbmış.
Aslanların əlindən qızıl bir tac alıbmış.

*Şəki, 14 may 2002-ci il*

## Elmir Şeyxzadə
## Qardaşım

Yazdığın o "Oğuz elinə salam"
Tanıtdırdı səni bütün dünyaya.
Vətən, torpaqdan, eldən güc alan
Belə əsərlərin gələrmi saya?

Geridə qoyduğun o əlli yaşın
Hər bir keçən günü bir ömrə dəyər.
Demə qocalmışam, demə, qardaşım!
Yoxsa ki, qocalıq qəddini əyər.

Tükənməz ilhamın bir az da coşsun!
Qələminə qüvvət, şeyrinə qüvvət!
Dostların sevinsin, düşmənin çaşsın!
Sənə doğru gəlsin insaf, mürüvvət!

Sadə bir insansan, böyük bir düha.
Bu gün qiymətini, kaş, biləydik biz.
Özüm də bilmirəm nə deyim daha...
Səni dərk etməyə çatmır elmimiz.

Şerinin zamanı, vaxtı gələcək.
Hirslənib özündən çıxma, qardaşım.
Sənin qiymətini tarix verəcək.
Qəlbini qətiyyən sıxma qardaşım.

*Şəki, 24 oktyabr 2000-ci il*

# MƏKTUBLAR...
# TƏBRİKLƏR...
# TELEQRAMLAR...



*Məzun oldum. Bakı, iyun, 1973*

# İSTEDADLI ŞAİR VƏ BÖYÜK TƏBİƏTLİ İNSAN

**Etibar Etibarlı**

Bu gün çağdaş Azərbayan ədəbiyyatının görkəmli nümayəndəsi, istedadlı şair, böyük təbiətli insan Vaqif ASLANIN ad günüdür.

Əvvəlcə istədim bu münasibətlə şair dostuma beş-altı kəlmə ürək sözümü ünvanlayım, lakin xatirələr məni 47 il əvvələ, qaynar gəncliyimin qayğı dolu tələbəlik illərinə apardı ...

...O, çılğın təbiətli bir gənc idi. Duyğuları aşıb-daşırdı, sanki bulaq kimi qaynayırdı. İlhamla yoğrulmuş misraları onu dinləyənləri ovsunlayırdı. Mövzu dairəsi geniş idi. Öz nəfəsi, öz yazı üslubu vardı. Hamı onun gələcəkdə böyük şair olacağıa inanırdı, o cümlədən mən də. Vaqif çılğın təbiətli olduğu qədər də təvazökar idi. Çox danışmağı sevməzdi. Bəzən tələbə yoldaşlarının baş alıb gedən çənə söhbətlərindən qaçardı...və öz dünyasına qapılardı...

...İllər keçdi. Ədəbiyyatımızda Vaqif ASLAN imzası öz sözünü dedi. Şəki dağlarının əzəməti, doğma yurdun təkrarasız gözəlliyi hopdu şeirlərinə. Yorulmadan yazd, yaratdı.. İndi Vaqif ASLAN istedadlı bir şair-dramaturq kimi tanınır. Mövzu dairəsi daha da genişlənib. Onun yaradıcılığında tarixi mövzular da geniş yer alıb. İxtisası olduğu üçün farnsız dilini də kifayət qədər yaxşı bilir.Vaqif həm də gözəl tərcüməçidir. Vaqif ASLANIN 4-cildlik seçilmiş əsərləri çoxdan oxucuların ixtiyarındadır. Şair poeziyanın bütün formalarında qələmini sınamış, həmçinin pyesləri tamaşaya qoyulmuşdur.

Ömrün 67-ci pilləsinə qədəm qoyan şair artıq müdrik çağlarını yaşayır. Mən şair dostumu ürəkdən təbrik edir, ona möhkəm can sağlığı və yeni-yeni yaradıcılıq uğurları arzulayıram!

*Bakı, 5 iyul 2017-ci il*

# Ağasəlim Hacıyevin məktubu

## I

Vaqif, salam!

Necəsən? Vəziyyətin, dolanışığın səni təmin edirmi? Yaradıcılığın necədir?

Təbrik edirəm. Mənə oxuduğun şeiri ("Qış düşüncələri") oxudum "Azərbaycan müəllimi"ndə. Amma yaman qısaldıblar. Yenə də pis deyildi.

Qardaş, xəcalətliyəm yanında, bağışla, toyuna gəlməyə imkanım olmadı. ...

İki ay əvvəl Şəkiyə gəlmişdim, dostum İsrafili, bəlkə, tanıyasan. Sizə gəlməliydik, dedik gedək Balakənə, qayıdanda dönərik. Qayıdanbaş gecəyə düşdük. Onunçün narahat etmədik səni.

Şəki yaxşı şəhərdir, xoşuma gəldi.

İnanıram ki, ailə sarıdan xoşbəxtsən.

*06 dekabr 1978-ci il*
*İmişli, Kirov küçəsi, 23.*

## II

Salam, Vaqif!

Necəsən, qaqaş. İndi sənin şe'rini oxudum. "Bulaq" şe'rin ləzzət elədi mənə.

"Ulduz" jurnalında şəklini gördüm və şe'rini də oxudum. Bütün dostlara salam de!

*09 dekabr 1978-ci il*
*İmişli, Kirov küçəsi, 23.*

## Nizami Sadıqovun məktubu

*(Quba rayon polis şöbəsinin rəisi, polis polkovniki)*

Hörmətli Vaqif müəllim, salam!

Sizin "525-ci qəzet"in səhifəsində çap olunmuş şeirinizi oxudum.

"Öldür məni", "Var", "Qəm yemə", "Oxu mənimçün, gözəl" adlı şeirləriniz mənim o qədər xoşuma gəldi ki, ömrümdə birinci dəfə şairə məktub yazmaq qərarına gəldim.

Şerlərinizi təhlil edib, ona layiq söz tapıb sizə qaytarmaq mənim üçün çətindir. Ancaq onu bilirəm ki, şeirləriniz ürəyimə, elə bil, sərinlik gətirdi. Rəhmətlik Şahmar Əkbərzadənin söz səltənətini yad etdim. Şe'rlərinizin ruhu necə də Şahmarın şe'rləri ilə uyğunlaşır. Etiraf edim ki, sizin şeirlərinizi birinci dəfədir ki, oxuyuram. Ola bilsin ki, mən pis oxucuyam, sizin şeirlərinizə rast gəlməmişəm.

Bilmirəm, sizin şeir kitablarınız var, ya yox, ancaq bir şeyi bilirəm ki, oxuduğum şeirləriniz barədə fikirləşərkən qənaətə gəlirəm ki, siz böyük şairsiniz.

Vaqif müəllim, sizi münasib vaxtda Qubaya dəvət edirəm.

Məktubuma cavab versəniz, bir neçə şeirinizi də mənə göndərməyinizi xahiş edirəm.

Əvvəlcədən minnətdarlığımı bildirirəm.

Hörmətlə...

**Nizami Sadıqov.** Quba rayon polis şöbəsinin rəisi, polis polkovniki.

*27 mart 2001-ci il*

## Firqə müəllimənin məktubu

*(Tələbə yoldaşım)*

Çox hörmətli Vaqif müəllim, səmimi salamlarımı qəbul etməyinizi rica edirəm!

Nə var, nə yox? Ailədə və işdə vəziyyət necədir? Səni tez-tez televiziya ekranlarında görürük və fəxrlə dinləyirik.

Vaqif müəllim, mən təsadüfən instituta getmişdim. Ruhəngizlə görüşdüm.

O mənə belə bir sual verdi:

– Firqə, gör, kim haqlıdır? Vaqifi çağırmışdıq görüşə. Getdik kababxanaya. Yedik-içdik. Hiss etdik ki, o bizdən razı qalmadı.

Mən də dedim ki, Vaqif haqlıdır. Şairə maddi yox, mənəvi qida lazımdır.

Ruhəngiz dedi ki, ay sağ ol, mən səhvmizi indi başa düşdüm.

Yenə də təsadüfən Xaliq müəllimlə görüşdüm. O da mənə ikibaşlı sual verdi:

– Siz də gəlmişdiniz Vaqif müəllimlə görüşə?

Dedim: "Xeyr. Məni dəvət etməmişdilər.

Xaliq müəllim dedi ki, yaradıcı tələbələri yığmışdım akt zalına gül dəstələriilə.

Video-operator, fotoqraf da dəvət etmişdim.Özüm də Vaqif müəllimin yaradıcılığı haqqında çıxış etməyə hazırlaşmışdım. Nə qədər gözlədik, gəlmədi. Mən tələbələr qarşısında pərt oldum. Sonra öyrəndim ki, bir neçə nəfərin təşkilatçılığı ilə onlar kafedə əylənməyi daha münasib hesab ediblər. İndi mən nə Ruhəngiz xanımla, nə də Aliyə xanımla salamlaşıram.

Mən də dedim: "Düz edirsən"!

Vaqif müəllim, mən bunları yazmağı özümə borc bildim. Sən biləsən ki, Xaliq müəllimin ("Poliqlot" qəzetinin əməkdaşının) təşəbbüsü və bilavasitə zəhməti ilə şair Vaqif Aslanla yaradıcı tələbələrin yüksək səviyyəli görüşü təşkil edilibmiş. Təəssüf ki, kimlərinsə günahı üzündən belə gözəl tədbir baş tutmamış və Xaliq müəllim bundan çox əsəbiləşmiş imiş...

Vaqif qardaş, bizlər əyalət adamlarıyıq. Ona görə də, mənəviyyatımız da əyalət havası kimi safdır. Və bu saflığın nəticəsində biz (sən, mən, Sabir, Nabat, Salman və başqaları) bir-birimizi daha yaxşı başa düşürük.

İndi isə, qardaşım, hansı yeni şe'rləri yazmısan, hansı kitabların çap olunub? Mümkünsə, mənə də göndər. Mən isə yavaş-yavaş qocalıram, lakin işləyirəm. Elə bir yenilik yoxdur. Elçin də hələlik

evlənmir. Elə bir iş olsa, Allah qoysa, sizi də dəvət edəcəyik. Sağ və salamat ol. Şöhrət müəllim və Elçin də sizə çoxlu-çoxlu salamlar göndərirlər.

*Füzuli rayonu, 01 noyabr 2007-ci il*

## Həmzə Vəliməmmədovun məktubu

*(1938, Lerik, Təlbəyaq kəndi – 05.05.2020. Lerik rayonu)*

Hörmətli Vaqif müəllim!

Sizə respublikamızın cənub bölgəsinin səfalı diyarı Lerikin ağsaqqalları və ziyalılarından salamlar göndərirəm.

Sizə iki il bundan əvvəl “Ovqat” verilişində qulaq asıb yaradıcılığınıza vurulmuşdum. Görüşməkdən ötrü Şəkiyə gəlmək istəyirdim. Təəssüf olsun ki, səhhətim buna imkan vermədi.

Dünən Təbrizdən qayıtmışam. Müalicə olunduğum müddətdə Şəhriyarın məzarını ziyarət etmək, ev-muzeyində iki saat oturub çay içmək, ölməz şairin yatdığı yorğan-döşəyə əl vurmaq mənə nəsib oldu.

Bu gün səhər tezdən nəvəm məni yuxudan oyatdı. – Baba, sevdiyin Şəkili Vaqif Aslan yenə “Ovqatın qonağıdır, – dedi.

Böyük maraqla, acgözlüklə Sizə qulaq asdım, şeirlərinizi və söhbətinizi dinlədim. Allah Sizi qorusun.

Şəkini görmək arzusundayam. Qismət olsa, əlinizi sıxaram, həmsöhbət olaram.

Uğurlar, cansağlığı arzulayıram.

Dərin hörmətlə.

*Həmzə Ruhulla oğlu Vəliməmmədov,*
*Lerik rayon Ağsaqqallar Şurasının sədri, əməkdar*
*jurnalist, “Qızıl qələm” mükafatı aureatı.*
*09 noyabr 2008-ci il*

## Lerik rayon Ağsaqqallar Şurasının məktubu

Hörmətli Vaqif Aslan!

Qarşıdan gələn baharda, may ayında el ağsaqqalı, Əməkdar jurnalist, yaradıcı ziyalı Həmzə Ruhulla oğlu Vəlimәmmədovun 75 yaşı tamam olur.

Yubilyarın dostu kimi Sizin arzu və ürək sözlərinizi çapa hazırlanan "Ömrün ixtiyar çağı" kitabında oxumaq bizə xoş olar.

*29 yanvar 2013-cü il*

## NURLU ADAM

*(Lerik ağsaqqallarına və ziyalılarına dərin hörmət və minnətdarlıq hissindən doğan salamlar və ehtiramlarla!)*



*Həmzə Ruhulla oğlu Vəlimәmmədov*
*(1938, Lerik, Təlbəyəq kəndi – 05 may 2020, Lerik rayonu)*

Qarşımda bir məktub vardır. O, müdriklər, uzunömürlülər və ağsaqqllar diyarı Lerikdən gəlmişdir. Lerik rayon Ağsaqqallar Şurası tərəfindən mənim adıma ünvanlanan bu məktubda əməkdar jurnalist, "Qızıl qələm"li yaradıcı ziyalı Həmzə Ruhulla oğlu Vəliməmmədovun qarşıdan gələn baharda 75 yaşının tamam olacağını xəbər verir, çapa hazırlanan "ömrün ixtiyar çağı" kitabında yubilyarın dostu kimi mənim də ürək sözlərimi oxumaq istədiklərini bildirirdilər.

Nədənsə dərin bir fikrə getdim və bu məqamda Lerikdən mənə ünvanlanan 09 noyabr 2008-ci il tarixli bir məktub gəlib gözlərimin önündə durdu. Hüsn-xətlə yazılmış, məzmunu dolğun, sözləri səmimi məktubun müəllifi Həmzə Ruhulla oğlu Vəliməmmədov idi. O məni Lerikin ağsaqqalları və ziyalıları adından salamlayır, iki il əvvəl "Ovqat" verilişində mənə qulaq asdığını, mənimlə görüşmək üçün Şəkiyə gəlmək istəsə də, səhhətinin buna imkan vermədiyini yazırdı. Məktubunun hər bir sətrində Həmzə müəllimin özünə, ətrafına və dünyasına qarşı hörmət və məhəbbətlə vuran ürəyinin döyüntüləri hiss edilirdi. "Dünən Təbrizdən qayıtdığını, müalicə olunduğu müddətdə Şəhriyarın məzarını ziyarət etdiyini, ev-muzeyində isə iki saat oturub çay içdiyini" fəxarət və məmnunluqla mənim diqqətimə çatdıran Həmzə müəllimin məktubu bu sözlərlə qurtarırdı: "Bu gün səhər tezdən nəvəm məni yuxudan oyatdı: "Baba, sevdiyin Şəkili Vaqif Aslan yenə "Ovqat"ın qonağıdır" dedi. Böyük maraqla, acgözlüklə sizə qulaq asdım, şeirlərinizi və söhbətinizi dinlədim. Allah Sizi qorusun. Şəkini görmək arzusundayam. Qismət olsa, əlinizi sıxaram, həmsöhbət olaram. Uğurlar, cansağlığı arzulayıram. Dərin hörmətlə".

Bu hadisədən sonra vaxtaşırı telefonlaşdıq və bir bahar günü Həmzə müəllimi Şəkidə qarşılamaq şərəfinə layiq görüldüm. Qarşımda qarayanız, ortaboylu, dolubədənli, ürəyindən doğan Günəşin şəfəqləri sanki üz-gözündə şölə verən, təbəssümü ulduz-ulduz sayrışan nurlu bir insan dayanmışdı. Amma bu nurlu insanın çöhrəsində kölgə kimi görünən kədər də var idi. Oturuşu və duruşundakı ağırlıq, yerişindəkiləngər, danışığındakı kəsəlik onun klassik Azər-

baycan kişisi olmasından xəbər verirdi. Həmzə müəllimi Şəkiyə qədər, səhv etmirəmsə, birisi gənc, ikisi yaşlı olmaqla üç nəfər müşayiət etmişdi. O ləyaqətli gəncin adı yadımda qalmasa da, o iki yaşlı adamdan birinin adının Novruz, digərinin adının isə Hidayət olduğunu xatırlayıram. Onların Həmzə müəllimə necə bir qayğıkeşliklə yanaşdıqlarını gördükcə insan səmimiyyətinin böyüklüyünə heyran qalırdım. Novruz müəllim də, Hidayət müəllim də ondan çox nigaran idilər. Ayrılıq məqamında onlar mənə dedilər: "Həmzə müəllim sənə əmanətdir, sən də Allaha".

Mənim yanımda dostum və qələm dostum Rəsul İlməddinoğlu var idi. Daha dəbdə olmasa da, onun köhnəlmiş "QAZ-24"-ü ilə gəzəcəkdik. Həmzə müəllim hər addımda Şəki ilə Lerik arasında bir oxşarlıq görürdü. Bizim Kiş kəndini üç tərəfdən əhatə edən dağların əzəməti və hündürlüyü ona qəribə təsir bağışlayırdı. Onun evimizə gəlişi bizim üçün unudulmaz bir xatirəyə çevrildi. Keşməkeşli həyatı, valideynləri, qohumları, dostları haqqında etdiyi söhbətləri yaddaşımıza köçürdük. Həmzə müəllim övladlarından elə bir fəxrlə danışdı ki, bizim də ürəyimiz dağa döndü. Və birdən... onun o nurlu simasında həmin o kölgəli kədər göründü. Mən isə nədənini bilməsəm də, o kədəri görən kimi tanıdım. Vaxtsız itirdiyi ömür-gün yoldaşı Səlminaz xanım haqqında danışmaq onun üçün çox çətin idi. Özünü tox tutan, şaxını sındırmayan Həmzə müəllim çiynində saxladığı göylərin ağırlığından dizə qədər torpağa batan Antey təsiri bağışlayırdı.

Olduğu qısa müddətdə Həmzə müəllim kəndimizin və Şəkimizin görkəmli yerləri ilə tanış oldu. Ancaq o hələ əvvəlcədən məndən xahiş etmişdi ki, kimliyi və Şəkiyə gəlişi barədə heç bir rəsmi şəxsə məlumat verməyim. Bu da mənim ürəyimdən olmuşdu.

Çox təəssüflər olsun ki, Həmzə müəllim Şəkiyə çox az müddətə gəlmişdi. Bəlkə də, o məni çox sevindirməkdən qorxmuşdu. Qorxmuşdu ki, Vaqif Aslan sevincin çoxluğuna davam gətirməz.

Bundan sonra Həmzə müəllimlə daha bir dəfə də görüşmək qismətim oldu. O, Balakənə yaxın bir qohumunu görməyə gedirdi, mənimlə görüşmək üçün yolüstü Şəkidə əylənmişdi. Amma bu dəfə

şəhərdə mənim dostlarım və qələm dostlarımla – Rəsul İlməddinoğlu, Ramiz Orsər və Çingiz Nağıyevlə birlikdə çay süfrəsi arxasında əyləşməli olduq. Bu bir saatlıq görüş Həmzə müəllimi Balakənə yola salmaqla başa çatdı.

Yenə də vaxtaşırı telefonlaşırıq. Dünyanın və özümüzün ovqatı necə olursa, biz də elə oluruq – Şəkinin və Lerikin, onların da fonunda dünyanın taleyini yaşayırıq. Biz də Həmzə müəllimlə birlikdə üzü bahara doğru gedirik.

Dostdan yazmaq da çətin, dosta yazmaq da çətin...
Kökü Allahdan gəlir insana məhəbbətin.
Atabir, anabirlər çoxsa da bu dünyada,
Dar gündə, dar ayaqda həm də dost düşür yada.
Müqəddəsdir ocaqlar, ziyarətlər və pirlər...
Bununçün dost olurlar hər yerdə ruhubirlər.
Ruh kimi yaranışdan hamımız bir yaşdayıq,
Harda, hayanda olsaq, dost yanında başdayıq.
Rəvadırmı ki, dostlar arabir görüşməsin?
Dost sayılan kimsələr dost gözündən düşməsin.
Dost hər deyəndə olmur, olursa-başa tacdır.
Çünki dost insan üçün daim halal qazancdır.
Bir qarından çıxmadan, bir beldən gəlmədən də
Doğmalaşmaq olarmuş, olsan Allaha bəndə.
Dostluq halal qazancdır, bərəkəti bol olsun!
Gələcək nəsillərə xeyirli bir yol olsun!
75-in mübarək, əcəb şans düşüb mənə.
Yaşa deyir dostların, Həmzə müəllim, sənə.

*Şəki, Kiş kəndi.*
*20 fevral 2013-cü il.*

***Bax. "Ədalət" qəzeti, 15 may 2013-cü il.***
***Bax. Həmzə Vəliməmmədov – 75. İllərin söz yaddaşı. Bakı, "Apostrof", 2013. Səh.112-115.***
***Bax. Vaqif Aslan. Zaman və ədəbiyyat dilemması qarşısında. Bakı, "Mütərcim", 2021. Səh.284-287.***

## Zarıslı Süleymanın məktubu

Sənətinin, şe'riyyatının vurğunu olduğum gözəl insan, qiyabi dostum Vaqif müəllimə çoxlu-çoxlu salamlar.

Əvvəlcə diqqətinizə, sonra isə göndərdiyiniz kitablara görə Sizə təşəkkür edirəm. Çox sağ olun.

Mən Sizi ilk dəfə "Ovqat" verilişinin qonağı olarkən sevdim. Sizin şeirlərinizə vuruldum.

Ən çox xoşuma gələn isə "Kədərim mənim" və "Alın yazısı" şeirləri oldu. Sonra bu verilişi təkrar verilərkən lentə yazdım və seçmə şeirlər yazdığım dəftərə köçürdüm. Daha bir "Ovqat" verilişindən sonra isə mən özümə söz vermişdim ki, nə vaxtsa Şəkiyə ayağım düşsə, sizinlə görüşüb tanış olacağam.

... Mən Şuşa rayonunun Zarıslı kəndində doğulmuşam. ... İndi xarabalıqları qalıb. 1992-ci ildən 2005-ci ilə qədər hər gün bir formada yuxuma girib. Mən çox çalışdım ki, ... hansısa bir yolla Şuşaya, öz kəndimə bir səfər edim, ... ancaq bu mümkün olmadı. ...İşğal altındakı kəndimizə aid bir kasset əldə edəndən sonra mənim yuxularıma son qoyuldu.

...Kənd Girs dağının ətəyində yerləşir. Güney tərəfi "Qızıl qaya, "Quzey tərəfi isə "Buğa daşı" adlanır. Kəndin "Topgörməz", "Baharbənd", "Tirtökülən", "Ələm ağacı", Əskər dərəsi" və s. kimi məşhur yerləri vardır.

Vaqif müəllim, ... saatın bir xoş vaxtında, təbiniz, ilhamınız dilə gələndə bu kəndə bir şe'r həsr edin. Bu şer sizin "Kədərim mənim" şeriniz kimi kədərli, nisgilli olsun. Mən və dostlarım Həsənağa, Məzahir və Yaşar bu şe'ri oxuyarkən qəmlənək, kədərlənək, gözyaşı tökək. ... İndi köçkün kimi Bakıda yaşayıram. ...

*Məmmədov Süleyman Heydər oğlu.*
*Bakı şəhəri, 12 dekabr 2008-ci il.*

## Zarıslı Süleymana cavab

**İndi 11 füvral 2021-ci ildir. Aradan 13 il 2 ay keçir. Artıq Şuşa da, onun Zarıslı kəndi də azaddır. Mən Zarıslı Süleymana kədərli şeir yaza bilmədim. Niyəsini heç özüm də bilmirəm. Görünür ki, şeirin də yaranmasında nə isə bir hikmət vardır.**

### Gözün aydın, Süleyman!

Əsən küləklər dedi
Bu səhər Girs dağından:
– Qurtarıbdır Zarıslı
Erməni tapdağından.
Gözün aydın, Süleyman!
Bağlayıb əhdü peyman
Görüşərik Şuşada.
Qoy sevinsin Şuşa da.

Topgörməzin topundan
Düşmən titrədi zağ-zağ.
Zəfər nəğməsi ötdü
Məcman bulaq, Göy bulaq.

Düşmən elə sandı ki,
“Baharbənd” bəndə düşdü.
Sonda yağı-düşmənin
Özü kəməndə düşdü.

Sinəndə ovunmayan
Ağrın da, acın da var.
Zəfər himnin, bayrağın,
“Ələm ağacı”n da var.

Güneyin Qızıl qaya...
Quzeyin Buğa daşı...

Yerlərin yol gözləyib
Gözlərində göz yaşı.

Tirtökülən tərəfdə
Tirlər tökülüb qalıb.
Pəncərələr gözü kor...
Evlər sökülüb qalıb.

Əsən küləklər dedi
Bu səhər Girs dağından:
– Qurtarıbdır Zarıslı
Erməni tapdağından.
Gözün aydın, Süleyman!
Bağlayıb əhdü peyman
Görüşərik Şuşada.
Qoy sevinsin Şuşa da.

*11 fevral 2021-ci il*

## Rejissor Mirbala Səlimlinin məktubu

Salam. Hər vaxtınız xeyir olsun, Vaqif Müəllim!

Xatirə mənə yazanda ki, sizi görüb və söhbət eləyib, çox sevindim. Məni ən çox sevindirən bu oldu ki, Siz pyeslərin üzərində işləyirsiz. ... Deməli, gələcəkdə bizi çox maraqlı işlər, çox maraqlı görüşlər gözləyir.

Mən Moskvaya gəlməmişdən əvvəl Sevda ilə Sizə xəbər göndərmişdim. Sizinlə görüşmək istəyirdim. Nə isə,.. alınmadı. Nə olar, Allah qoysa, mən ya iyunun, ya da iyulun axırına ... qayıdacam. Görüşərik. Mənim də Sizə bir təklifim olacaq. ...

*Dostunuz Mirbala. 04 may 1996-cı il.*
*Moskva, I xoreşevskiy proezd, dom 12,*
*korpus 1, kvartira 31.*

## Bəxtiyar həkimin teleqramı

*AYB Şəki bölməsinin şədri Vaqif Aslana*

Eşitdim yubileyiniz keçirilib. Əfsuslar olsun ki, qabaqcadan xəbərdarlıq etməmisiniz. 60 illiyiniz münasibəti ilə sizə qədr-qiyməti olmayan can sağlığı arzu edirəm.

Sən vaxtsız-vədəsiz əymə dizləri.
Qoy gəzib dolanaq doğma düzləri.
Hələ neçə övlad toyu qabaqda...
Elə bu məqamda, elə bu çağda
60-ı aşmağa, şair, hazır ol!
100-də dolaşmağa, şair, hazır ol!
Sizə hörmətlə.

*Bəxtiyar həkim. 06 may 2010-cu il*
*Bakı, Semaşko adına xəstəxananın*
*təcili yardım şöbəsi*

## Asif Rüstəmli və Abdulla Yusiflinin təbrik məktubu – Teleqram

Vaqif Aslan çağdaş Azərbaycan poeziyasının qüdrətli nümayəndələrindən biri, Bəxtiyar Vahabzadə ədəbi məktəbinin görkəmli yetirməsi, söz ustasıdır! Onun “Oğuz bəylərinə və xatunlarına salam”, “Qanlı Qoca”, “Dəli Domrul”, “Qazan Xanın yuxusu”, “Dəli Ozan”, “Təpəgöz”, “Aruz qoca”, “Dirsə Xan”, “Yalıncıq”, “Oğuz alqışı” və b. əsərlərində “Qamus və namus kitabımız” (Prof.Y.V.Qarayev) olan “Kitabi-Dədə Qorqud”un tarixi-etnoqrafiq mənzərəsini, mənəvi-əxlaqi meyarlar sistemini poetik düşüncə müstəvisində obyektiv qiymətləndirməyi bacarmış, tədqiqatçı-şair statusunda layiqli mövqeyini daha da möhkəmləndirmişdir.

Vaqif Aslanın görkəmli tənqidçi-alim, türkoloq və ictimai xadim Aydın Məmmədova həsr etdiyi "Aydın", təfəkkür tariximizin dərin qatlarından söz açan "Ruhlarla söhbət" poemaları, "Qan üzərində rəqs", "Kötük" pyesləri, *"*Hüseyn Xan Müştaq*"* tarixi dramı, çoxsaylı elmi-tənqidi əsərləri, XVII əsr fransız səyyahı Jan Şardənin ("Parisdən İsfahana səyahət"), Pol Verlenin, Erve Bazənin, Öjen Potyenin irsindən – birbaşa orijinaldan bədii tərcümələri, səmərəli pedaqoji fəaliyyəti etiraf edək ki, Azərbaycan ədəbiyyatına və mədəniyyətinə misilsiz xidmətlərdir.

Bu gün əzizimiz Vaqif Aslanı – bütöv Azərbaycanın, türk dünyasının vətənpərvər oğlunu, böyük şəxsiyyətini, görkəmli şairini, fədakar araşdırıcısını və mütərcimini, səmimi hisslər, saf duyğular tərənnümçüsünü, mənəvi ucalıq örnəyini - 65 illik yubileyi münasibətilə təbrik edir, həyat və yaradıcılığında uğurlar arzulayırıq.

*Asif Rüstəmli*
*AMEA Nizami adına Ədəbiyyat İnstitutunun*
*şöbə müdiri, Dr/Prof, professor*

*Abdulla Yusifli*
*Ədliyyə polkovniki*
*5 dekabr 2015-ci il*

## **Böyük şair Bəxtiyar Vahabzadənin məktubu**



Б. Вахабзаде

Hörmətli Vaqif!

Şəkidən, təxminən, 1 həftə əvvəl mənə bir nəfər zəng edib xahiş etdi ki, son kitablarımdan bir neçəsini, həm də xarici dillərdə çıxan kitablarımdan bir neçə kitabımı Moskvada yaşayan şəkili rəssam Rəhman Şıxəliyevə çatdırmaq lazımdır. Onu da əlavə elədi ki, mən kitabları Vaqif Aslana gındərim. O özü Rəhman Şıxəliyevə çatdıracaq. Buna görə Hikmətlə sənə deyilən kitabları göndərdim.

Sənə bütün işlərində uğurlar diləyirəm.

*Hörmətlə, 21.03.2001*

## Xəlilov Məmməd Məcid oğlunun məktubu

*(Müharibə və əmək veteranı, SSRİ Təhsil Əlaçısı)*

*Məktub*

Hörmətli Vaqif müəllim, salamlar!

Mən Sizi neçə illər bundan qabaq tanıyıram. Mətbuatda neçə-neçə şerlərinizi oxumuş, radioda neçə-neçə şeirlərinizi dinləmişəm. "Ulduz" jurnalında şəklinizlə birlikdə verilmiş şe'rinizi oxumuşam, həmin jurnalı indi də saxlayıram.

Özüm tarix müəllimi olsam da, ədəbiyyat vurğunuyam. ... Gənclik illərimdə bir neçə şerim "Nuxa fəhləsi", "Gənc işçi" (indiki "Azərbaycan gəncləri") qəzetlərində verilmişdir.

... Sizin tələbəniz, mənim qız nəvəm Pərvanə Məmmədovaya avtiqrafla bağışladığınız **"Oğuz elinə salam"** kitabınızı düşünə-düşünə oxudum.

İstedadınıza, şeir dili ilə insan qəlbinə dərindən nüfuz etdiyinizə heyran qaldım. Sevindim ki, klassik Şəki ədiblərinin Sizin kimi şair davamçıları var.

... Şeirlərinizi qiymətli edən bir də odur ki, hər sözünüzə həyatda nümunə tapılır, doğruluğu təsdiq olunur. Tanınmış təşkilatçı və təsərrüfatçı, xoşxasiyyət insan, komsomolda birlikdə fəaliyyət göstərdiyim Əhməd Əbdürrəhimova həsr etdiyiniz "Söz" şe'rində Əhməd müəllim haqqında

Beş kişinin yanında bir kişisən.
Mərdanəsən, lap hələ şir kişisən.
Qəlbiyumşaq, xoşqılıq. pir kişisən.

dediyiniz sözləri inanıram ki, onu tanıyan ... minlərlə adam təsdiq edə bilər.

Bəli, Əhməd müəllimhəqiqətən həm nər, həm pir, həm də nur kişidir.

Sizin filosof Fərman müəllimə, professor Qulamrza Səbri Təbriziyə, tələbəniz Mehriban İmamverdiyevaya həsr etdiyiniz şeirlər də ürəyəyatandır.

Dövlət televiziyasının redaktorlarından biri – Gülsəfa Əhmədova Şəkidə olarkən mənə dedi: “Deyirlər ki, şeir yazırsan. Bəs nə üçün yazdığını danırsan?”

İndi bu mövzuda yazdığım yazını Sizə təqdim edirəm:

Ruhum tərpənəndə coşan dəniztək
İnsanlıq oduna yanmayımmı bəs?
Şe'rə güləndə hər ağzı göyçək
Şe'r yazmağımı danmayımmı bəs?
.........................................................
Elə düşünməyin, mən duyğusuzam.
Bilməyin, şöləsiz, zəif ulduzam.
İstiyə istiyəm, soyuğa buzam.
Şaxtaya düşəndə donmayımmı bəs?
..........................................................
Məmmədəm, qəm üçün doğulmamışam.
Ağzımı yumublar, boğulmamışam.
Qaynama suyutək sovrulmamışam...
Hərdən damcı-damcı dammayımmı bəs?

Hörmətli Vaqif müəllim, mənim yaxın qohumlarım, ər-arvad coğrafiya elmləri namizədləri – Qalib və Almas Rüstəmovlar nəvəm Pərvanəyə bəxş etdiyiniz kitabı dönə-dönə oxudular. “Kitabda

avtoqraf olmasaydı, özümüzlə aparardıq" dedilər. Kitabdan bir neçə şeiri köçürərək apardılar.

Sevinirəm ki, nəvəm Pərvanə Sizin kimi haqqa dost olan müəllimlərin qayğısı ilə mənim ümidlərimi doğruldur.

Ay şair qardaşım, çox yarat, yaşa.
Yüz il yaşayasan şe'rinlə qoşa.
Nəfəsin gur olsun, qələmin iti...
Möhtac olmayasan dosta, yoldaşa.

*Hörmətlə: Şəki, 12 oktyabr 2000-ci il*



*Şəki, 1998-ci il. Şəki rayonu Oxud kənd orta məktəbində, 1965/66 – 1966/67-ci tədris ilində Vaqif Aslanın sinif yoldaşı olmuş rəssam İmam Mustafayev tərəfindən çəkilən portret*



*Bakı. 04.11.2011-ci il. Yusif Günaydının "Aylı gecələr" teleproqramında rəssam Yavər Əsədov tərəfindən dostluq şarjı kimi çəkilmişdir*



*Şəkili Rəssam Tahir Həmidlinin çəkdiyi dostluq şarjları.*
*Şəki, 2000-ci il*

## AZƏRTACIN MƏLUMATI

*Şəki, 5 dekabr 2015, Mustafa Dadaşov, AZƏRTAC*

Azərbaycan Yazıçılar Birliyi Şəki bölməsinin sədri, şair-publisist Vaqif Aslanın 65 yaşı tamam olur.

AZƏRTAC xəbər verir ki, dekabrın 5-də şairin yubileyi Şəkidə şəhər rəhbərliyinin, ziyalıların, elm, mədəniyyət və incəsənət xadimlərinin iştirakı ilə qeyd edilib.

Yubiley tədbirini Şəki Şəhər İcra Hakimiyyəti başçısının birinci müavini Həsən Həsənov açaraq Vaqif Aslanı şəhər ictimaiyyətinin adından təbrik edib, ona yaradıcılıq uğurları arzulayıb.

Sonra şairin həyat və yaradıcılığından söhbət açılıb. Qeyd olunub ki, XX əsrin 70-ci illərində ədəbiyyata gələn Vaqif Aslan 90-cı illərin ortalarından Şəkidə ədəbi prosesə rəhbərlik etməyə başlayıb. O, məhsuldar və istedadlı qələm ustası kimi tanınıb. Vaqif Aslan bənzərsiz poetik üslubu ilə nəinki Azərbaycanda, həmçinin

qonşu Türkiyədə də sevilir. Müxtəlif illərdə nəşr olunan “Ruhlarla söhbət”, “Oğuz elinə salam”, “Qanımdan rəng alan gül”, “Aydın”, “Hüseyn xan Müştaq” adlı kitablarla yanaşı, publisistik yazıların, tərcümələrin də müəllifidir.

Yubilyarı təbrik edən Yazıçılar Birliyinin katibi İlqar Fəhmi bildirib ki, Şəki ədəbi mühitinin son 20-30 illik dövrünə nəzər salanda, ilk növbədə, Vaqif Aslan yada düşür.

Azərbaycan Yazıçılar Birliyinin sədri Anarın yubilyara ünvanladığı təbrik məktubu oxunub.

Şair Vaqif Aslan çıxış edərək yubiley tədbirinin təşkilinə görə şəhər rəhbərliyinə minnətdarlığını bildirib.

Yubiley tədbirində şairin şeirləri və sözlərinə bəstələnən mahnılar səslənib.

## Hasan Kallimçi ilə məktublaşma

**Hasan Kallimci:** Horoz gazetesinde çıkan Aydın Mehmet hakkındaki yazımı, bu defa Türkiye ve Türk dünyası okusun ve Aydın Mehmet ile Vaqif Aslan tanınsın diye Avrasya Yazarlar Birliğinin KARDEŞ KALEMLER dergisine gönderdim. Ocak veya Şubat ayında dergide yer alacak.

**Vaqif Aslan:** Qardaşım! Sizə çox-çox təşəkkürlər edirəm. Sizlərə hörmətlər!

**Hasan Kallimci:** Türk Dünyası Kültür Başkenti ŞEKİ olduğuna göre, Türk dünyasına hitap eden dergide Vaqif ASLAN, Vaqif ASLAN'ın AYDIN şiirinde anlatılan Aydın Mehmet de Türk dünyasında tanınsın istedim.

Azerbaycan'ın güçlü, Türkçü yazar ve şairi size hürmet ben de hürmet ediyorum.

**Vaqif Aslan:** Çox sağ olun! Təşəkkürlər!

**Hasan Kallimci:** Tercüme-i Hâlinizi e-posta ile göndermeniz iyi oldu. Gönderdiğiniz e-posta oğlum, Muğla Üniversitesi Edebiyat Faültes, Çağdaş Türk Lehçeleri ve Edebiyatlarında Yard. Doç. olarak müellimlik yapan İSMAİL TURAN KALLİMCİ'YE ait.

Oğlum bana gönderdi. Eserrleriniz Muğla Üniversitesinde öğretim üyeleri tarafından okumacak, yüksek lisans tezi yapılacak inşallah.

**Vaqif Aslan:** Sizə və oğlunuza sağlıqlar diləyirəm. Türk xalqı qarşısındakı xidmətləriniz danılmazdır. Siz BÖYÜK TÜRKSÜNÜZ! Mən siziinlə qürur duyuram.

*25 dekabr 2015*

AZƏRBAYCAN RESPUBLİKASI

AZƏRBAYCAN YAZIÇILAR BİRLİYİ

AZ 0000, Bakı şəhəri, Xaqani küç., 53, Telefon: (++99412) 493-29-41, Faks (++99412) 493-52-25

№ 1K-15/120 «22» 04 2016 -ci il

Türkiyədə fəaliyyət göstərən Avrasiya Sənət, Kültür və Ədəbiyyat Federasyonu Azərbaycan xalqına və əsgərinə dəstək proqramı çərçivəsində may ayının 24-də yazıçı, bələdiyyə başçısı, musiqiçi və televiziya işçilərinin də daxil olduğu əlli nəfərdən ibarət bir heyətlə ölkəmizə gələcək. İyun ayının 1-dək davam edəcək səfər zamanı Azərbaycan yazıçılarının da yaxından iştirakı ilə ölkəmizin bir çox bölgəsində müvafiq tədbirlərin keçirilməsi nəzərdə tutulur.

Qonaqlarımızın rəhbərlik etdiyiniz bölgənin ictimaiyyətilə görüşünün keçirilməsinə köməklik göstərmənizi xahiş edirik.

*Hörmətlə,* *ANAR*

*Azərbaycan Yazıçılar Birliyinin sədri*

## Səmra Rasulovanın elektron məktubları

### I məktub

Bu kitab mənə təxminən 3 ay qabaq kitabın yazarı Vaqif Aslan tərəfindən imzalanaraq hədiyyə verilib. Vaqif Aslan, ilk olaraq sizə Rəsulov ailəsinin yeni nümayəndələri adından dərin təşəkkürümü və minnətdarlıgımı bildirirəm!

*11 may 2021*





*Hacı Kamran Əjdər oğlu Məmmədov*
*(Qafqaz Müsəlmanları İdarəsinin*
*Şəki-Oğuz bölgəsi üzrə qazısı)*

## Ömrünü vətənə, millətə xidmətə, şeirə-sənətə sərf edən sevimli şairimiz

*“...Şübhəsiz ki, lütf Allahın əlindədir,*
*onu istədiyinə bəxş edər.*
*Allah çox böyük kərəm sahibidir!”*
*Hədid surəsi, ayə 29.*

Allahın təqdiri ilə müxtəlif tarixi dövrlərdə hər bir ölkədə, eldə, obada qeyri-adi insanlar dünyaya gəlir. Yaşadıqları ömrün ən parlaq dövründə cəmiyyətə ilahi nur saçır və Rəbbimizin sevgisindən pay aldıqları istedadları, yaradıcılıqları, ağıl və zəkaları ilə mənsub olduqları xalqlara, bəzən bütün insanlığa, bəşəriyyətə xidmət göstərirlər. Onların dünyaya gəlişi də insan zəkasının qavraya bilmədiyi qeyri-adi əlamətlər və hadisələrlə tarixin səhifəsinə yazılır. Əvvəl ailəsinə, doğma kəndimizə sonra isə xalqına və millətinə şərəf gətirən hörmətli şairimiz, sevimli müəllimim Vaqif Aslanın dünyaya gəlişi məhz belə gəlişlərdən biridir. Elə bu məqamda böyük Hüseyn Cavidin “Qız məktəbində” şeirindəki mükalimədən aşağıdakı sətirlər yadıma düşür:

– ... Bu dünyada sənin ən çox sevdiyin
Kimdir, quzum, söylərmisən?
– Ən çox sevdiyim ilkin
O Allah ki, yeri-göyü, insanları xəlq eylər.
– Sonra kimlər?
– Sonra onun göndərdiyi elçilər.
– Başqa sevdiklərin nasıl, yoxmu?
– Var...
– Kimdir onlar?
– Anam, babam, müəlliməm,
bir də bütün insanlar..

Ömrünü vətənə, millətə xidmətə, şeirə-sənətə sərf edən sevimli şairimiz Allahın təqdiri ilə müxtəlif tarixi dövrlərdə hər bir ölkədə, eldə, obada qeyri-adi insanlar dünyaya gəlir. Yaşadıqları ömrün ən parlaq dövründə cəmiyyətə ilahi nur saçır və Rəbbimizin sevgisindən pay aldıqları istedadları, yaradıcılıqları, ağıl və zəkaları ilə mənsub olduqları xalqlara, bəzən bütün insanlığa, bəşəriyyətə xidmət göstərirlər. Onların dünyaya gəlişi də insan zəkasının qavraya bilmədiyi qeyri-adi əlamətlər və hadisələrlə tarixin səhifəsinə yazılır. Əvvəl ailəsinə, doğma kəndimizə sonra isə xalqına və millətinə şərəf gətirən Hörmətli Şairimiz, sevimli müəllimim Vaqif Aslanın dünyaya gəlişi belə gəlişlərdəndir.

Hörmətli şairimizin ölkəmizin dilbər ğuşəsində dünyaya gəlişinə, həyat yoluna yaradıcılığına, xidmətlərinə, qəlbinə nəzər saldıqda, tam əminliklə deyə bilərik ki,

Allah-Təala ona ilahi eşq, xüsusilə vətən, millət sevgisi sayəsində ilham bəxş etmiş, öz lütfü ilə şərəfləndirmişdir.

Gözəl Vətən!
Xoşbəxtəm ki, qucağında
doğuldum mən.
Bilən bilir dünya – geniş...
Ömrün yolu yoxuş – eniş...
Hər qartala öz yuvası...

Hər körpəyə öz anası...
Mənim yuvam, anamsan, Kiş!

Şairimiz çox müdrik insandır. O, bir həyat məktəbidir, hörmətli müəllimdir, böyük şəxsiyyətdir. Yanlışı olmayan, hər zaman düzgün mövqe tutan dürüst bir ziyalıdır. Onun şağirdi olmaq özü şərəfdir.

Böyük Şairimiz bizim ədəbiyyat, Azərbaycan dili, həm də Fransız dili müəllimimiz idi. O, bizə dahi şair və yazıçılarımızla yanaşı,dünya ədəbiyyatının dühalatını da tanıtdırırdı. Sovet dövründə islamın insanlara bəxş etdiklərini Nizami, Füzuli, Nəsimi, Vaqif, Seyid Əzim və sair klassiklərin, aşıq ədəbiyyatının banilərinin şeirləri ilə çatdırırdı. O vaxtlar məktəbimizdə ayrı-ayrı fənlərin sevilərək öyrədilməsi üçün "Kimya", "Coğrafiya" və başqa bədii gecələr keçirilərdi. Şair müəllimimiz şagirdlərini o qədər poetik yetişdirnişdi ki, komanda rəhbərləri şagirdlər gecənin açılışında yarışmaya ona yazdırdıqları şier bəndləri ilə başlayardılar.

"Zirvə" əzəmətli, zirvə vüqarlı,
Zirvə möhtəşəmdir, gəlsə də yüz qış
Elmi, bilikləri, fəth eyləyəcək
"Zirvə" komandası, "Zirvə"yə alqış!

"Bilik" komandası isə belə bir bənd ilə çıxış edirdi:

"Bilik" komandası yatmayıb hələ
Hazırdır zirvəni fəth eyləməyə.
"Biliy"in gücünü siz bilə-bilə
Çoxda öyünməyin "Zirvə"yik deyə.

1941-1945-ci il müharibəsinin acıları, qanlı-qadalı illəri kəndimizdən də yan keçməmişdi. Neçə həmyerlimiz o müharibədə həlak olmuş, yaralanaraq xəsarət almışdı. Bir dəfə məktəb illərində keçirdiyimiz "Veteranlarla görüş" gecəsində adətimiz üzrə kəndimizdəki veteranlar tədbirə dəvət olunmuşdu. Tədbirdə mən şairin o

illərə həsr etdiyi “Sona bülbüllər” şeirini muğam ifaları altında söylədim. Şairin şeirdə toy sahibi Nəzər kişinin dilindən deyilən:



*8 may1976-cı il.*
*Veteranlarla görüş.*
*Mikrofonda Vaqif Aslan*

Dərdi gözəl çalırsan
Həsrəti ondan gözəl.
Qurban olum: – Çal – dedi.
O sevdalı illəri,
Qan qadalı illəri
Birdə yada sal dedi.
Çal ki,birdə sonalar
Yanıq ğörməsin, Usta
Göz yolda, qulaq səsdə
Ömür sürməsin, Usta
Çal, bir də bülbüllərin
Sinəsi qan olmasın.
Bu dərdi biz duymuşuq,
Bir də duyan olmasın.
Baxma əl ağacım var,
Sirlərim də var, nə qəm!
Ayaqlarım bir yana,
Mən sevda itirmişəm.
Məhəbbətin naminə!
Səadətin naminə
Çal “sona bülbüllər”i
Qurban olum, çal yenə!
Çal ki, açlıq qəhətlik
Sonaları əyməsin.
Çal ki, birdə güllələr
Məhəbbətə dəyməsin.

Çal bidə bülbüllərin
sinəsi qan olmasın.

Bu dərdi biz duymuşuq
Birdə duyan olasın.
Mən ağlayan tərzdə çal
Çal, bir az ahəstə çal.
Sevdalı cavanların,
Gözəllərin xətrinə
Çal sona bülbülləri.
Dərdin alım, çal – yenə!

Şeir yüksək rəğbətlə qarşılandı. Qəlbləri sızlatdı. Veteranları çox kövrətdi.

Veteran Soltan dayı, Məsim dayı, Qurbanəli müəllim şeirin müəllifinə, təsirli söylədiyimə görə mənə çox təşəkkür etdilər.

Hörmətli müəllimim! Sizi 70 yaşınızın tamam olması münasibəti ilə təbrik edirəm. Sizə bu şərəfli ömürdə səmimi qəlbdən möhkəm can sağlığı, dünya və axirət səadəti arzulayıram. Qadir Allahdan təmənna edirəm ki, sizin müdrikliyiniz, qəlbinizin paklığı, türkçülüyə məhəbbətiniz, bütün insanlara həmrəylik arzularınız, dərin poeziyanız ölkəmizin vətəndaşlarının, sizin yazdıqlarınızdan bəhrələnən hər kəsin kamilləşməsinə vəsilə olsun! Uca Yaradanın lütvü və mərhəməti heç vaxt üzərinizdən əskik olmasın!

Amin!

Hörmətlə.

***Hicri: 09 məhərrəm 1443-cü il – Miladi: 18 avqust 2021-ci il***

# TURAN RUHLU ŞAİR – VAQİF ASLAN






#TURAN_RUHLU_ŞAİR --- *VAQİF ASLAN*

Vaqif Aslan müəllim mənim həyatımda, dünyagörüşümdə, şəxsi inkişafımda, TURANÇILIQ və türkçülük ideologiyamın formalaşmasında böyük rol oynamış USTAD-ımdır! Bütün bunlara görə Vaqif müəllimə SONSUZ TƏŞƏKKÜR-lərimi bildirirəm.

SALAM OLSUN TURAN RUHLU ŞAİRƏ! YAŞAYIN! VAR OLUN!

BİZ – TƏLƏBƏLƏRİNİZ SİZİNLƏ FƏXR EDİRİK VƏ DAİM TƏLƏBƏNİZİK!

*Azərbaycan, Şirvan şəhəri. 19 may 2016-cı il*

Sizə Vaqif müəllimin tələbələrinə müraciətlə yazdığı, mən deyərdim ki, HİMNİ təqdim edirəm.

## Tələbələrimə

**I**

Dörd dəfə dünyanın qışından çıxıb,
Dörd dəfə birlikdə yaz yaşamışıq.
Bizləri hər dəfə vaxtsızlıq sıxıb,
Hər dəfə yazları az yaşamışıq.

Dayandım xitabət kürsüsündə mən,
Məni dinlədiniz partalarda siz.
İndi bildinizmi nə üçün, nədən
Siz mənim döyünən ürəyimsiniz.

Bir vaxt sual verdik bir-birimizə,
Haçandan oxunub birinci nəğmə?
Söz-söz, kəlmə-kəlmə deyirəm sizə,
Sevgiylə toxunub birinci nəğmə.

Bizim otaqların pəncərəsindən
Dağlar görünürdü, baxırdınız siz.
Gənc qəlbin şövq ilə titrəməsindən
Nur kimi düzlərə axırdınız siz.

Ey Bamsı Beyrəklər, Salur Qazanlar!
O – Burla xatundur, bu – Banu Çicək.
Dastan söyləyənlər, yazı yazanlar
Söyləyiblər doğru, yazıblar gerçək.

Sizə Bilqamısdan söz açanda mən,
Yaman yaşayırdım haqqı, düzlüyü.
Nur kimi yağırdı gözlərinizdən
Öləri olanın ölümsüzlüyü.

Gördüm, baxışınız təzədir, tərdir,
Mən də yaddaşımın tozunu sildim.
Sandım ki, oğlanlar Füzulilərdir,
Qızlar da Şirindən şirindir, bildim.

Haçan söhbət açdım Yusif Vəzirdən,
Yaş olub yanaqda gilələndiniz.
Sanki qaldırdınız Cavidi yerdən,
Müşfiqlə birlikdə güllələndiniz.

Çox mətni oxuyub gözlərinizdən,
Sizə mühazirə söyləmişəm mən.

Sizin üzünüzdə yanan işıqlar,
Bu rənglər, naxışlar, bu yaraşıqlar
titrədib məni.
İçimdə oxunan dəli nəğməni
Şəhriyar diliylə demişəm sizə.
Bəxtiyar diliylə demişəm sizə.

Məmməd Araz deyib Arazlaşmışam,
Gəncləşib sizinlə tarazlaşmışam.
O qədər öymüşəm Dədə Qorqudu
Danışa-danışa Qanturalıdan.
Min dəfə demişəm yaşamaq budu
Tutsan, sevgini tut, tutma xalıdan.

Gözümü yandırıb qəlbimin odu,
Misal gətirmişəm Aşıq Alıdan.
Demişəm boş şeydir əlli də, yüz də,
Yoxsa səadətin şöləsi üzdə.

Sevinc bəxş etmişəm sevincinizə,
Qəminiz üstündən qəm götürmüşəm.
Duyunca güc gəlir kövrəklik sizə,
Baxıb gözünüzdən nəm götürmüşəm.

Sizsiniz ən böyük dövlətim, varım,
Mənim əzizlərim, tələbələrim.
Siz mənim bugünkü fəxrim,vüqarım,
Siz mənim sabahkı qələbələrim.

Dörd dəfə dünyanın qışından çıxıb,
Dörd dəfə birlikdə yaz yaşamışıq.
Hər dəfə bizləri vaxtsızlıq sıxıb,
Hər dəfə yazları az yaşamışıq.

Bu nəğmə ayrılıq nəğməsi deyil,
Müəllim-tələbə ənənəsidir.
Bu nəğmə ayrılıq nəğməsi deyil,
Bitməz görüşlərin təntənəsidir.
Mənim əzizlərim,tələbələrim,
Mənim fatehlərim, qələbələrim.

*20 may 2007-ci il*



*Vaqif Aslan müəllim 2-ci kurs. tələbələri ilə.*
*Soldan sağa: Alovsat Ahmadov, Vaqif Aslan, Elçin Bəylərov, Mehman İbadov (Mehman Turan)... Şəki..12 may 1995-ci il...*

## Mehmanım

*(Tələbəm Mehman İbadova)*

Ömür deyilən şey axar bir sudur.
Sudan da saf, şəffaf olan Mehmanım.
Mənim diləyim bu, istəyim budur.
Dünyanı sevərək dolan, Mehmanım.

Ömr elə o ki var, yaşa o ki var.
Vurul bu torpağa, daşa o ki var.
Gəl bu sevgin ilə xoşa o ki var.
Bu dünya deyildir yalan, Mehmanım.

Süd də var, sümük də... Hamısı haqdır.
Təpələr təpədir, dağ, axı, dağdır.
Sağdır o kimsə ki, sözü də sağdır.
Məndən söz olacaq qalan, Mehmanım.

Sən ki, unutmadın Vaqif Aslanı.
Ürüyüb artasan ulduzlar sanı.
Mübarək üzünə gələn hər anı
Tanrı töhfəsitək alan Mehmanım.

*27 yanvar 2018-ci il*

*P.S.* ***20.05.2007-ci ildən 14 il sonra yenə də tələbələrimin təkidi ilə "Tələbələrimə" adlı şeir yazdım. Onu da oxucularıma təqdim edirəm. Boynuma alıram ki, bu çox çətin və şərəfli mövzudur.***

## Tələbələrimə

**II**

Siz mənim sabaha baxan gözlərim....
Siz mənim açılan dan yerimsiniz.
Siz mənim deyəcək olan sözlərim...
Şərəf yerimsiniz, şan yerimsiniz.

Siz həyat eşqiylə döyünən, vuran
Ürək yerimsiniz, can yerimsiniz.
Tələbələrim!

Sizlər Zaman adlı bu kəhkəşanda
Parlayan, bərq vuran ulduzlarsınız.
Yoxsa qaralardı dünya bir anda...
Nə yaxşı, nə yaxşı, Sizlər varsınız.
Məni yadınızda, yaddaşınızda
O xoşbəxt günlərə apararsınız

Tələbələrim!
Siz məndən, bilirəm, söz umursunuz...
İlahi sayaraq, sözü ilahi.
Mən söz adamıyam, düz umursunuz...
Hər yerdə qoruyur düzü ilahi.
Buna şəkmi vardır, şübhəmi vardır?
İlahi yaradıb sizi İlahi.
Tələbələrim!

Mən sizə fikrimi, ağlımı verdim...
Olsun, artıq olsun ağlınız Sizin.
Sözümü, sovumu, nağlımı verdim...
Qoy şipşirin olsun nağlınız Sizin.
Məndən söz düşəndə şipşirin olsun
Körpə balalara noğlunuz Sizin.
Tələbələrim!

Mən Sizdən heç nəyi əsirgəmədim...
Varmı əsirgəyər varı olanlar?
Yaşıl çəmənində gülü, çiçəyi...
Qarlı dağlarında qarı olanlar?
Bugünkü gününü basar bağrına
Üzü sabahına sarı olanlar.
Tələbələrim!

Bu dünya gözəldir, yaşamaq gözəl...
Şərdən uzaq olun, yalandan uzaq.
Salam verəndə də doğruya verin.
Salamı minnətlə alandan uzaq.
Çoxbilən quş kimi öz dimdiyindən
Özünü tələyə salandan uzaq.
Tələbələrim!

Xeyrə qənşər gedin, ürəklə gedin!
Gedin, yollarınız olsun işıqlı!
Göylərə, yerlərə dualar edin!
Yaşayın Tanrılı, ocaqlı, şıxlı!
Deyin: – Vaqif Aslan, nə gözəl dedin!
Ömür gözəl olsun, gün yaraşıqlı!
Tələbələrim!
Görəsən, mən sizə nələri dedim?
Hələ deyiləsi qaldı nələrim?
Tələbələrim!

*12 aprel 2021-ci il*

**Əhəd Salamov**

Vaqif müəllim ədəbiyyatımızin Aslanıdır. Onu tanıyan hər bir kəsin sevdiyi şəxsiyyət və filosofdur. Kişin Danaveçi ilə İsveçi, Norveçi müqayisə edə bilən və türklərin böyük kökünü təsdiq edə bilən şairidir. Könüllər şairi, var olun. Sizin hər bir uğurunuz bizim sevincimizdir.

*19 may 2016-cı il*

**Sahilə Dəniz**

Mənim sevimli muellimim! İnsanlıgın ən dərin qatlarını sizdən öyrəndik, soy-kokümüzə daha six baglandiq Sizin anlatdıqlarınızdan.

Vaqif Aslan böyük bir məktəbdir. Ne xosbəxt bizlərə ki, bu mektebin zərrələri olduq....

*24 dekabr 2016-cı il*

**Ülviyye İsmayılova**

Kiş kəndi haqqında söhbətlərini videodan dinləyərkən Vaqif muəllimin gozel sohbetleri, muhazirələri ucun lap darıxdım. Zamanı geri getirmek olsaydi, o gozel institut illərimi yeniden yaşamaq istəyərdim.

*22 yanvar 2017-ci il*

**İlahə Məmmədova**

Vaqif müəllim hər şeirinizin mənası bir dünyadır. “Yazmışam” seiriniz necə gozəlmis. Bir gözün bu qədər İlham verəcəyini bilməzdim. Xoş o göz sahibinin halına.

*17 yanvar 2018-ci il*

**Əjdər Baltalı**

Bilirsinizmi Şəki ərazisində niyə aslan yaşamır? Çünki orada poeziya aslanı V A Q İ F ASLAN yaşayır!!! Eşq olsunbu gözəl insana! Şəxsiyyətinə və yaradıcılığına böyük hörmətlə.

*19 may 2016-cı il*

## Akəm Xaqan

*(Şair, tənqidçı, “Vətəndaş rəyi” qəzetinin və rəsmi saytının təsisçisi)*

## Nə oxşarsan?

*(V.Aslanın “Ruhlarla söhbət kitabını oxuyarkən)*

Nə oxşarsan bu qaraca daşı sən?
O qəlblərin sal daşıdı, yaşam az.
Ha silkələ bu qəflətdə, qaşı sən.
Qiymət olsa, vallah, o qız ağlamaz.

Daş görmüsən, daşın gözü yaşlıdı.
Tarixin də, qardaş, başı daşlıdı.

Gördüm dərdin sənin yeddibaşlıdı
Nalən ərşdə, göy də bunu saxlamaz.

Kəsik bilək saz olduqca, hayın "ox".
Şahmar qılınc kəsən başın sayı yox.
Bu dünyanın xətasından yenə qorx.
Od olmasa dəmir qızmaz, dağlamaz.

Hər məzara yan almısan cuş gəlib.
Ruhlar ilə söhbətinə huş gəlib.
Dünya "qafa gülüşü"nə tuş gəlib.
Bu türk yasdan çıxdı, şivən bağlamaz.

Qoca şair, sinədəftər sinəsən.
Bəxtəvərsən, sevgilərə binəsən.
Akəmə də töhmət ilə dinəsən:
– Arxaya bax, önünü gör, ağla az!

*Şəki, 24 dekabr 1997-ci il*

## Mərhəmət
## Ustadım

*(Müəllimim Vaqif Aslana)*

Dedin parça-parça olub ürəyin,
Basıldı sinəmə köz, ay ustadım.
Neyləyək, taleyin vəfası budur...
Əyilmə qədərə, döz, ay ustadım.

Bu dünya həmişə üz qaralayıb.
Qovuşan qəlbləri tez aralayıb
Yəqin ürəyini söz yaralayıb
Xəncərdən betərdi söz, ay ustadım.

Fələk qova-qova çoxların yordu.
Yorulub qalandan haqq-hesab sordu.
Bu həyat dolaşıq, düyünlü tordu
Bu da bir düyündü, çöz, ay ustadım.

*23 dekabr 2019-cu il*



*Qiyabi tələbələrimlə birlikdə M.F.Axundovun Şəkidəki ev-muzeyini ziyarət edərkən: soldan Mübariz (Ucar r-nu, Bərgüşad kəndi), Fidan Sarıbəyli (Yevlax r-nu, malbinəsi kəndi), Leyla Zeynallı (İsmayıllı r-nu, Gideyli kəndi), Gülüstan Hüseynova (İsmayıllı r-nu, Hacıhətəmli kəndi), Vaqif Aslan, Cəmilə Fərzəliyeva (Yevlax r-nu, Əcəmi kəndi), Nübar Muradova (Balakən r-nu, Yenişərif kəndi), Mərhəmət Əliyev (Şuşalıdır, Şəkinin Turan qəsəbəsində məskunlaşmışdır)*

## Vəfa Məmmədova
*(Şəki 9 saylı orta məktəbin rus dili və ədəbiyyatı müəllimi)*

## Şəkili şair Vaqif Aslana

Şair xəyallarım yenə göydədir
Deyirlər hər kəsin öz dünyası var.
Gör necə xoşbəxtəm, çünki qarşımda
Vaqif Aslanın da söz dünyası var.

Alıb qanadına apardı məni
Ruhlar dünyasına "Ruhlarla söhbət".
Öləni, gedəni yada salmağa
Çox çətin tapılar hamıda qeyrət.

İstərəm zirvələr fəth etsin səsin.
Heç vaxt tükənməsin yazmaq həvəsin.
Haqqı var öyünsün söz dünyasında
Sənintək istedadı olan bir kəsin.

*Şəki , 17 may 2002-ci il*

## Tural ADIŞİRİN
## Vaqif Aslan yaradıcılığında ictimai və tarixi motivlər

XX yüzil sonu – XXI yüzil (önləri) Şəki ədəbi mühitinin görkəmli nümayəndələrindən biri, istedadlı şair Vaqif Aslandır.

Vaqif Cumay oğlu Aslanov 1950-ci ildə Şəki rayonunun Kiş kəndində yoxsul kəndli ailəsində anadan olub. Ata məhəbbəti, ana şəfqəti, nənə nağılı-noğulu ilə böyüyən şair daim müəllimlərinin də qayğısı ilə ədəbi ədəbiyyata vəsiqə alıb. Hələ ədəbiyyata kiçik yaşlarından maraq göstərən şair VII sinifdə oxuyarkən "Mən sizə vu-

ruldum, a qarlı dağlar" adlı ilk şeirini yazır. Orta məktəbi Şəkinin Oxud kəndində bitirən Vaqif Aslan kəndin tanınmış müəllimləri olan, el ağsaqqalları Nurpaşa Hümmətovdan və Qəni Abdullayevdən dərs alıb.

1968-ci ildə ADXDİ-nun (indiki AzDDU) "Fransız və Azərbaycan dilləri" fakultəsinə daxil olaraq Allahverdi Tağızadə, Fərman İsmayılov, Zeydulla Ağayev, Nəbi Saniyev, Abbas Hacıyev və başqa görkəmli alimlərin təsiri ilə elmləri mənimsəyib. Sonralar Rəşid Göyüşov, Seyidağa Onullahi kimi tarixçilərlə, Yaşar Qarayev kimi görkəmli ədəbiyyatşünasla tanışlıq onun fikir dünyasını, dünyagörüşünü zənginləşdirib. Xüsusən də, Y.Qarayev, B.Nəbiyev, T.Hacıyev kimi görkəmli ədəbiyyatşünaslar onun ədəbiyyata, şeirə, sənətə olan marağını daha da artırıb, onun AYB-nə üzv olması üçün tam mənəvi dəstək olublar. 1973-cü ildə oxuduğu fakültəni bitirən V.Aslan doğma elinə, obasına qayıdaraq nəcib müəllimlik peşəsi ilə məşğul olub. 1994-cü ildə şair AYB-nə üzv qəbul olubdur. 1993-1995-ci illərdə Azərbaycan MEA Folklor İnstitutunun Şəki sektorunun rəhbəri olmuş, 1998-ci ildə AYB-nin Şəki bölməsinin sədri seçilibdir. Zəngin elmi və bədii yaradıcılıq yolu keçən Vaqif Aslanın bir-birinin ardınca elmi və bədii əsərləri çap olubdur. Onun "Aydın" (1993), XVII əsr fransız səyyahı Şardendən tərcümə etdiyi "Səyahətnamə" (1994), "Ruhlarla söhbət" (1997), "Oğuz elinə salam" (2000), "Qanımdam rəng alan gül" (2004) adlı kitabları nəşr olunubdur. "Türk xalqları ədəbiyyatının antolojisi"nin V cildində şeirlərindən nümunələr verilibdir.

Hazırda geniş bədii yaradıcılıqla məşğul olan V.Aslan həm müəllim, həm də şair ömrü yaşayır. O, AMİ-nin Şəki filialında "Azərbaycan ədəbiyyatı tarixi" fənnini tədris edir, nəcib müəllimlik peşəsi ilə məşğul olur.

Filialda professor-müəllim, tələbə kollektivinin sevimlisinə çevrilmiş şairin əsərləri maraqla, sevilə-sevilə oxunur. Şəkinin elmi-mədəni həyatında öz bədii-elmi fəaliyyəti ilə geniş iştirak edir. Vaqif Aslan poeziyası düşündürücü, xəlqi poeziyadır. O, ədəbiyyatımızın xalq şeirinin qoşma, gəraylı, klassik üslubun qəzəl

janrlarında, dramatik növün pyes janrında qələmini sınamışdır. Onun qoşma, gəraylı və qəzəlləri hissin, duyğunun, ağlın süzgəcindən süzülüb gəlir. Heca vəznində yazmış olduğu şeirlərində Q.Zakir, M.Vaqif ənənələri özünü göstərir.

V.Aslan həyat şairidir. Yazmış olduğu şeirlərinin hər misrasında həyat həqiqətləri, qarşılaşdığı, şahid olduğu həyati motivlər öz əksini tapır. Görkəmli alim Y.Qarayev şair haqqında yazır: "V.Aslanın ədəbi yaradıcılığının əsas spesifikasının "folklor konteksti" təşkil edir". Həqiqətən də onun əsərlərində folklor ənənələri öz əksini geniş şəkildə tapır. Xüsusilə, onun xalq mahnılarına yazdığı şeirləri diqqətəlayiqdir. "Ağlama ceyran balası, ağlama, Ağlama gözüm qarası ağlama" xalq mahnısına yazdığı "Ağlama" şeiri məzmun və poetik cəhətdən fərqlənir.

Üsyan edib taleyəmi ağladın
Ağlama, ceyran balası, ağlama.
Dağ-dağ idim, məni bir də dağladın
Göynədi köksüm yarası ağlama.

V.Aslan elinə, obasına, torpağına bağlı olan vətənpərvər şairdir. Vətəninin dağlarının, bağlarının, çiçəklərinin vəsfindən doymayan şair qürur hissi ilə həm vətənini, həm də doğulub, boya-başa çatdığı doğma kəndini "Anam Kiş" şeirində gözəl poetik ifadələrlə təsvir edir.

Gözəl Vətən!
Xoşbəxtəm ki, qucağında
doğuldum mən

Bilən bilir dünya – geniş
Ömrün yolu yoxuş – eniş...

Hər qartala öz yuvası
Hər körpəyə öz anası
Mənim yuvam, anamsan, Kiş!

– deyən şair qucağında doğulduğu üçün özünü xoşbəxt sayır, doğma kəndinə “anamsan”, “yuvamsan” – deyə müraciət edir. Bundan başqa şairin “Yaşamaram” şeiri diqqəti xüsusilə cəlb edir. Anasız, yarsız belə yaşamağın mümkün olduğunu, lakin Vətənsiz yaşamağın mümkün olmadığını dönə-dönə vurğulayır.

Eşitdinmi, a sevgilim
Deyən sənsiz yaşamaram
Mən sənsiz də yaşayaram –
Mən Vətənsiz yaşamaram!

Şairin təbiət, məhəbbət mövzusunda yazdığı lirik şeirlərlə yanaşı ictimai motivli şeirləri də rəngarəngdir. Onun ictimai motivli şeirlərinin mövzusu canlı, həyatdan şahidi olduğu hadisələrdən götürülübdür. Bu mövzulu şeirlərdə Vətən həsrəti, rüşvətxorluq, dərəbəylik, Vətən torpaqlarının işğalından doğan dərin kədər hissi öz əksini tapır. Şairin ictimai mövzulu şeirləri içərisində “Ocaq” şeiri diqqəti cəlb edir. Şeirdə 1828-ci ildə Türkmənçay müqaviləsi ilə Vətən torpaqlarının ikiyə bölünməsindən doğan dərin kədər hissi yüksək sənətkarlıqla verilibdir.

Bir ocaq qaladı o tayda bacı,
Bir ocaq qaladı bu tayda qardaş
Diyirkən ayrılıq ölümdən acı
Bizim başımıza tale salıb daş
Tüstümüz görüşür Arazın üstə.

1990-cı illərdə ölkədə baş verən hadisələr, Vətən torpaqlarının bir-birinin ardınca işğalı, qaçqın-köçkünlük həyatı şairi ürəkdən sarsıtmış, yazmış olduğu “Qaçqın mahnısı” şeirində bu sarsıntını ürək ağrısı ilə qeyd edibdir.

Bu dərdi atammırıq
Alan yox satammırıq

Gecə-gündüz qaçırıq
Yurd qaçır, biz qaçırıq
Yenə də çatammırıq.

Getdi gedən yerimiz
Ölüb-itən yerimiz
İtib-bitən yerimiz
Göydən asılı qaldıq
Qəbri qazılı qaldıq
Haray, Vətən yerimiz.

Şairin digər ictimai mövzulu şeiri olan "Kərbəla faciəsi" diqqəti xüsusilə cəlb edir. Şeirdə başımıza gətirilən müsibətlərin əsasını şair sapı özümüzdən olan baltalarda, bir qarından ötrü özgənin qabından artıq yalayıb milləti nəfsinə satanlarda görür. Şair şeirdə demək istəyir ki, əsil "Kərbəla faciəsi" məhz başımıza gətirilən bu müsibətlərdir.

Kəlbəcər inildəyir
Xankəndimiz can verir
Zəngilan, Füizulinin
Yaraları qan verir
Budurmu al-qırmızı
Tökülən qan – əvəzi
Budursa, elə budur
Kərbəla faciəsi.

Şeirin son bəndində şair başı bəlalı, cəfakeş xalqının qəflət yuxusundan oyanmasını artıq bu müsibətlərə, bu bölünmələrə son verilməsini istəyir.

Erməni – ermənidir
İtdir – qurddur, hər nədir.
Axı onnan bizimki
Açıq müharibədir.

Bəs sən hansı ağılla
Öz-özünü bölürsən?
Böləndükcə ölürsən

Yatmısan oyan daha
Oyaqsan silkələn qalx
Mən səni and verirəm
O bir olan Allaha
Öz-özünü yeməkdir
Kərbəla faciəsi
Bildinmi nə deməkdir
Kərbəla faciəsi.

V.Aslan hər şeydən əvvəl tarixini, soy-kökünü dərindən bilən şairdir. O, Vətənin hər bir daşında, torpağında min-min tarixin yatdığını qeyd edir. Bu cəhətdən onun silsilə şeirləri içərisində "Daş əlifba", "Saxsı qırığı üstə yazı" şeirləri diqqəti cəlb edir. "Daş əlifba" şeirində şair Azərbaycanın canlı tarix yaddaşı olan – Qobustan abidəsindən söz açır.

Qobustan – zamanın kəsilən qolu.
Tapdanıb nə zaman, ot bitib haçan
Qobustan – Vətənin quruyan qolu
Donub damarında daşa dönüb qan.

Şeirin son bəndi məzmun cəhətdən daha rəngarəngdir. Buradakı yatan tarixə heyran olan şair bir anlıq daşlarla danışa bilmək üçün dönüb daş olmasını, hətta anasından Qobustanın dilini öyrətməsini istəyir və sonda yurdunun bu şərəfli tarixinə heyran qalaraq Qobustanı Azərbaycanın daşlaşan imzası adlandırır.

Hay sallam, yayılar səsim hər yana
Daşlar səda verər, danışmaz fəqət
Ey mənə əzəldən dil verən anam
Mənə Qobustanın dilini öyrət.

Bilim, o yurdumun şərəfi, şanı
Bilim, o yurdumun dərdi, yasıdır.
Oxuyum – Qobustan – Azərbaycanın
Daşlaşmış imzası, əlifbasıdır.

Şairin bundan başqa "Yaşamağın sirri", "Qılınc", "Ay səni" və başqa şeirləri tarixi mövzuda yazılıbdır. V.Aslanın tarixi mövzuda, tarixi motivlər əsasında yazdığı əsərləri içərisində "Ruhlarla söhbət" poeması xüsusilə fərqlənir. Poemanı şairin yaradıcılığının şah əsəri də hesab etmək olar. Poema Abdulla Əfəndizadənin "Hər ürəkdə zəbt olubdur, Ya ölüm, ya Türkiyə" mənzumələr toplusu ilə səsləşir. Əsər 28 fəsildən ibarətdir. Məzmun və forma cəhətdən bitgin və olduqca rəngarəngdir. Fəlsəfi-tarixi aspektdə qələmə alınmış "Ruhlarla söhbət" poeması adından göründüyü kimi tarixi şəxsiyyətlərin ruhlarının söhbəti üzərində qurulub.

Əsərin yazılmasında böyük məsuliyyət hissi duyan şair poemanın "Xeyir və dua" bölməsində ana və atasının ruhlarının dilindən bu şərəfli işi xüsusilə vurğulayır.

Oğlum, gəl bu daşı ətəyindən tök
Türk qoca palıddır yer üzərində
Başı göylərdədir, kökü dərində
Allaha çatarsan, yuxarı qalxsan
Gözlərin qaralar aşağı baxsan.

Altına girmisən çox ağır yükün
Birinci qatdadır kökləri türkün.
Nə vaxt ki, edilib bu dünya bina
Türk qövmü ilk sakin olubdur ona.

Poemanın "Haqq da var, divan da" adlı bölməsi daha maraqlıdır. Bu bölmədə tariximizdə qanlı izlər buraxan, türk xalqının amansız, qəddar düşməni olan Stalin, Qarbaçov kimi başıboşların haqq divanında hesab verməsi, öz bəd əməllərini boynuna alması haqqın qələbəsi kimi götürülür.

Stalindir – hər sorğudan sonra onu yandırırlar
Nəfəs verib dindirirlər.
Məni görüb diz çökdü o,
Gildir-gildir yaş tökdü o.
Sizi qırdım bağışlayın
Türk qövmünü Axalsıxdan qovlamışam.

Yerevandan köçürmüşəm bağışlayın
Bir türk məni bağışlasa rahat olar ruhum bir az.
Ulu ruhdan səda gəldi – en aşağı dinmək olmaz.

Poemanın "Şəhid ruhlar" adlanan bölməsində şair tarixi şəxsiyyətlərlə yanaşı zəmanəsinin böyük ədiblərini də yaddan çıxartmır. "Bu dünyadan mən əl çəkə bilmərəm" ifadəsi ilə M.Müşfiqin "Bu gözəl dünyadan necə əl çəkim" misrasına, "Yerə yatın kazaklardır atanlar" ifadəsi ilə görkəmli dramaturq C.Cabbarlının "1905-ci il" əsərinə, "Demədinmi qalxan bayraq enəmməz" ifadəsi ilə M.Rəsulzadənin "Bir kərə yüksələn bayraq bir daha enməz" sözlərinə işarəsi ilə poemanı daha da rəngarəngləşdirir. Şair poemanın "Qonuşma, yaxud əhvalpürsanlıq" bölməsində ulu Sabirin ruhi deyişməsində çağdaş dövrdə elmə, biliyə qiymət verilmədiyini, müəllimlərin, ziyalıların daima hörmət-izzətə möhtac olduğunu ürək yanğısı ilə verir.

Dedi – orda yatanmı çox, oyaqmı çoxdur?
Dedim – eləsi var ayılan deyil.
Dedi – uçitellər yenə acdımı,
Hörmətə – izzətə mör-möhtacdımı?
Dedim – oxuyanlar adam sayılmaz.
Dedi – bu səbəbdən millət ayılmaz.
Dedim – çox görürlər dincliyi bizə.
Dedi – daha sözün qalmayıb sizə.

Əsərin "Faciə", "İnkir-Minkir" və "I Şah Abbas" bölmələri daha maraqlıdır. "Faciə" bölməsində – xanlar xanı olmaq istəyən millətini, torpağını quruca bir ad, vəzifə üçün satan, özgə himayə-

sində yaşamağı özünə fəxr hesab edən Qubalı Fətəli xanın rüsvayçı əməllərindən söhbət açılır. Şair milləti birləşdirib özgəyə itaət edən, bu xalqı nəsil-nəsil xəcalətə salan insanın ellər gülüncü, aylar-illər gülüncü olmasını istəyir. Eynən də "İnkir-Minkir", "Şah I Abbas" bölməsində də öz soyunun qənimi kəsilən, türkü-türkə qırdıran, türkü öz yurd-yuvasından didərgin salan, erməni kimi qaniçəni, bəşəriyyətin bəlası olan bu murdar xalqı türkün başına bəla eləyən Şah I Abbasın əməllərindən bəhs edilir. Poemanın "Giley", "Umu-küsü", "Sual-cavab" bölmələri də mövzu cəhətdən rəngarəngdir. "Giley" bölməsində qardaş qanı axıtmaqla fəxr edən, 1514-cü il tarixin türklük, türk milləti üçün səfalət səhifəsi olan Çaldıran döyüşü və onun qurbanları olan Şah İsmayıl və Sultan Səlim fenomenləri qarşılaşdırılır. Şair Şah İsmayılın dilindən xalqının başına gələn müsibətə, qardaş qırğınına ürək yanğısı ilə cavab verir.

Mənə bir dərs oldu Çaldıran
Bu döyüşdür türkü atdan saldıran
Bir qılınc ki, kəsib türkün başını,
Paralayıb torpağını, daşını.
Öyülməyə dəyərmi:
Bir qılınc ki, məni məndən eləyib
Qanı-qandan, canı-candan eləyib.
Mənimkidir deyilməyə dəyərmi?

"Umu-küsü" bölməsində Əmir Teymurun və İldırım Bəyazidin etirafları da düşündürücü və səmimidir. Əsərin "Ulu ruhun cavabı" bölməsində Ozanlar ozanı Dədə Qorquddan danışılır, qılıncla saz qarşılaşdırılır. Qılıncı olmayan millətin boy atmadığını, qılıncın ad-san, şöhrət olduğunu yazan şair namərdin, yaltağın əlində alçaldığını, pas tutduğunu da vurğulayır. Şair sazın da qüdrətindən, böyüklüyündən hələ "Dədə Qorqud elindən gələn" ucalığından, müqəddəsliyindən söhbət açır.

Sazın da, sözün də sirri var balam,
Qılınc da ad alır mərdin əlində
Namərdin əlində alçalar balam

Sazsa inildəyər dərdin əlində
Yaltağın əlində pas atar qılınc
Ölən şöhrətinə yas tutar qılınc
Yaltaq nə utanar nə də ar eylər
Qılıncı hörmətdən salıb xar eylər.

Poemanın "Novruz bayramı və Məlikşahın giley-güzarı" bölməsində əsrlər boyu tarixi, yaddaşı, bayramı, toyu-düyünü unutdurulan, lakin Məlikşah Cəlaləddin və II Şah Abbas kimi tarixi şəxsiyyətlərin sayəsi nəticəsində özününkünü özünə qaytaran bir xalqın taleyindən söhbət açılır. Şair poemanın "Məndən söyləməkdir, səndən eşitmək" bölməsində maraqlı faktlar verir. Yunan və türk xalqlarının adət-ənənələrindən yazır. Şair əsərdə dəfn etmə yas mərasimini gözəl izah edir, Yunanların dəfn etmə zamanı ölünü yandırmağını, türklərin isə torpağa basdırıldığını göstərir. Şair türkün sayəsində geyinməyi, çimməyi, daranmağı öyrənən, türkə "barbar" deyib onun var-yoxunu mənimsəyən, özününkü olmayanı öz adına çıxan qeyri-əxlaqi dəyərlərdən söhbət açır.

Şair yazır:

Bir xalqın tarixini silməyə cəhd edən xalq
Xalq adlanır nədən xalq
Şərqlə Qərb arasında əlaqə olmasaydı
Türk körpü salmasaydı
Heç ola bilərdimi yunan mədəniyyəti

Geci, tezi var, oğlum,
Hər kəsin öz başında çatlayacaq niyyəti.

Əsərin "Sual-cavab", "Ruhların məhkəməsi" bölməsi daha maraqlı və təsirlidir. II Göytürk imperatoru Bilgə Xaqanın ruhu ilə söhbətləşən şair söhbət əsnasında xalqının başına gətirilən müsibətlərdən, türk xalqları arasında birlik və bütövlüyün olmaması nəticəsində boyunduruğ altında yaşamasından, öz torpağında qul olan, qaçqın olan, öz torpağında özünə yad olan, bölgə-bölgə paralanan,

nəsil-nəsil qaralanan xalqların müasir taleyindən ürək ağrısı ilə danışır. Şair bölmənin sonunda xalqının başına gətirilən bu müsübətlərin bitməsini "Sən Türksən", "Sən Türksən" deyə titrəyib özünə dönməsini istəyir və bu an Bilgə Xaqanın timsalında düşdüyü mənzərənin təsiri nəticəsində şairin gözləri yaşarır.

Əsərdə Bizans imperatoru Qustinyanı qadın şücaəti ilə diz çökdürən Bur-Arıq və öz ağlı, zəkası ilə iki xalqı qırğından qurtaran Çiçək Xatun kimi qadın obrazların verilməsi təsadüfü deyil. Şair göstərmək istəyir ki, öz ağlı, zəkası, şücaətiylə kişiləri geridə qoyan, "Aslanın erkəyi, dişisi olmayan" dünyanın qadın fatehləri də vardır. Şair qadının böyüklüyünü, ucalığını "Qadın" şeirində də poetik ifadələrlə verir.

Qadın – ömrümüzün bəzəyi, naxışı
Həmişə müqəddəs sanmışıq onu
İnsan sevə bilir, sevir, nə yaxşı
Yoxsa verəmməzdik onun borcunu…

Ümumiyyətlə, V.Aslan bizi türk azmanlarının bütöv bir silsiləsilə görüşdürür. Şair Məlik Şah, Alp Arslan, Bilgə Xaqan, Atilla, Mete xan, Alp Ər Tonqa kimi tarixi şəxsiyyətləri türkün böyüklüyünü, qüdrətini göstərən şəxsiyyətlər kimi təqdim edir. V.Aslan poemada tarixi dərindən bilən gözəl bir tarixçiylə yanaşı həm də ana dilini, ana dilinin qayda-qanunlarını, fonetik xüsusiyyətlərini mükəmməl bilən bir dilçi kimi də nəzərimizi cəlb edir. Bu cəhətdən onun Şumer, Akkad, Assur, Babil, Manna, Midiya sivilizasiyalarının türk mədəniyyəti ilə təmasından, həmin sözlərin etimologiyasından bəhs etdiyi fikirlər maraqlıdır. Şairin "Gilqamış", "Enlil", "Moday" "Çiçi" sözlərinin etimoloji araşdırmaları göstərir ki, şair ana dilinə, onun qayda və qanunlarına dərindən bələddir. Şair "Çiçi" sözünü müasir şəkililərin demək olar ki, qanında olduğu, hava-su kimi işlətdikləri "Çiyi" sözü ilə bağlayır və maraqlı izahını verir.

Bir Subir şahının adı "Kikiydi"
Neçə il sonra da taleyə bir bax

Hunların Xaqanı Tanhu Çiçiy di
Bu gün də anaya “çiyi” deyirik
Cici söyləyirik “çiçi” deyirik
İnsanın tanrısı, göyüdür ana
Elə buna görə “çiyi”dir ana.

Ümumiyyətlə, Şairin istər lirik (qəzəl, qoşma, bayatı, gəraylı, poema), istərsə də dramatik (pyes) janrlarda olan əsərləri sanballı, dəyərli və müasir dövrümüz üçün aktual əsərlərdir. V.Aslan poeziyası dərin, mənalı, özünü oxucusuna sevdirən poeziyadır və bu poeziyanın geniş elmi-tədqiqata ehtiyacı vardır.

**Qaynaqlar:**
***1. Vaqif Aslan. Qanımdan rəng alan gül. Bakı: Ağrıdağ, 2002, 221 s***
***2. Vaqif Aslan: Ruhlarla söhbət. Bakı: Ozan, 1997, 256 s.***
***3. Vaqif Aslan. Oğuz elinə salam. Bakı: Mütərcim, 1999, 148 s.***
***4. Söz, söz,… söz!: birinci buraxılış. Şəki: Master, 2006, 288 s.***
***5. Vaqif Aslan. “Kiş kəndi və onun məbədi”. Bakı: Çaşıoğlu, 2003.***

***(ŞƏKİ), 19 dekabr 2013-cü il.***

## Tələbələrimin xeyir-duası

Əziz, Vaqif Aslan müəllim!
Sizi bu millətə bəxş etdiyinə görə Allahımıza şükürlüyük.
Sizi sevən tələbələriniz:
Natəvan Əzizova,
Kəmalə Qəribova,
Qoşqar Salmanlı,
Murad Muradov,
Şücaət Qaffarova.

*5 iyul 2020-ci il*

## Vaqif Aslanın tələbələrinə təşəkkürü

Sağ olun, Sizlər mənə göylərdən uzanan əl kimi görünürsünüz. Sizlərə qucaq-qucaq təşəkkürlər!

*5 iyul 2020-ci il*

## Tural ADIŞİRİNİN HƏDİYYƏSİ


Воқиф АСЛАН,
Озарбойжон шоири

ЯШОЛМАЙМАН

ТОШ

Тушимда бир тош кўрдим,

Тошдан бир садо кўпди,

Огир бир фарёд кўпди:

– Кошки тилим бўлсайди,
Тилим бўлса эди, кош...

Тушимда бир тош кўрдим,

Мен Ватансиз яшолмайман!

Мен Ватансиз яшолмайман!

* * *

Сен нега бу қадар гўзалсан, сўйла?

Сен нега бу қадар гўзалсан, сўйла?

Сен нега бу қадар гўзалсан, сўйла?

Мен нега бу қадар севаман сени,
Сен нега бу қадар гўзалсан, сўйла?

ДУНЁМ

Мен шоир бўлмас эдим, ахир сен бўлмасайдинг.

Мен шоир бўлмас эдим, ахир сен бўлмасайдинг.

Мен шоир бўлмас эдим, ахир сен бўлмасайдинг.

Озарбойжон тилидан
Раҳмат БОБОЖОН
таржимаси

**Əziz Vaqif müəlim, 70 illiyinizə bir hədiyyəm olacağını demişdim. Özbəkistanın nüfuzlu "Kitab dünyası" qəzetində Raxmat Bobojanın tərcüməsində "Mən vətənsiz yaşamaram", "Daş", "Dünyam", "Sən niyə bu qədər gözəlsən, axı", "Dünyam" şeirləriniz çap olunub. Yubileyiniz bir daha mübarək. 19 avqust 2020-ci il.**

## Elsever Mehdiyev
## Təbrik məktubu

Cox hörmətli Vaqif müəllim! Sizi 65 yaşınız münasibəti ilə səmimi qəlbdən təbrik edir ən gözəl hisslərimi bildirirəm! Sizin kimi gözəl şairlərə hər zaman ehtiyacımız var. Sizin hər kəlməniz

gənclərdə dillər əzbəri olub. Hətta inanın ki, tələbəlikdə əksər yoldaşlarımız öz sevgisini sevdiyi bir qıza sizin şeirlərinizlə yazaraq sevgi elan edirdi.

Sevdalı könlümün ilham pərisi
Sən niyə bu qədər gözəlsən axı?!
Ey qanım hərisi, canım hərisi
Sən niyə bu qədər gözəlsən axı?!

Sizin həyat və yaradıcılığınızda yeni ilham mənbəyi arzulamağı mən deyə bilmirəm, ona görə ki, sizin seirləriniz milyonlarla insanların ilham mənbəyidir. Sizin yaradıcılığınızla, ümumiyyətlə, sizlə tanışlıqdan bəxtəvərəm desəm, tam semimi olaram. Sizə can sağlığı arzulayıram! İnşaallah ki, sizin 70 illiyinizi respublika səviyyəli qeyd edərək, canlı-canlı təbriklərimizlə sizi qucaq dolu sevgimizlə bağrımıza basarıq! Biz sizinlə fəxr edirik! Yaxşı ki varsınız!

Hörmətlə, Elsevər Mehdiyev, 1999-2003-cü illərdə BDU-Şəki filialında tələbə, Tələbə Şurasının sədri

*09 dekabr 2015-ci il*

## Mustafayeva Mətanət Eldar qızı

*(Magistr, müəllim. Azərbaycan Müəllimlər İnstitutunun Şəki filialı)*

## Vaqif Aslan yaradıcılığında türkçülük problemi

Şair, müəllim, dramaturq, pedaqoq, tərcüməçi, publisit, ictimaiyyətçi, əvəzsiz mühazirəçi – Vaqif Cumay oğlu Aslanov haqqında söz demək şəxsən mənə çətin olduğu qədər məsuliyyətli, məsuliyyətli olduğu qədərincə də şərəflidir. Görən nə qədər insana nəsib olur həmyerlisi, sevimli şairi, unudulmaz müəllimi haqda söz demək? Biz tələbələr özümüzü Vaqif müəllimin mühazirələrində sehrə qapılmış, başqa bir aləmə keçmiş kimi hiss edər, həmin sehrdən bizi zəng səsi güclə ayırardı. Acgözlüklə onu dinləyər, dünya, insan haqqında düşüncələrini heç bir düzəlişsiz qebul edərdik. Da-

nışıq ədası, nitqindəki bənzətmə və köçürmələri 80 dəqiqəlik dərs ərzində dəfələrlə haldan-hala keçmiş müəllimizin fərqliliyindən, özünəməxsusluğundandı. Mənə elə gəlirdi ki, Azərbaycan ədəbi dilinin fonemlər sistemi də sanki onun nitqində, tələffüzündə başqa şəkil və rəng alır. Bu gün keçmişə qayıtmaq şansı bizə verilmiş olsaydı, onun mühazirələrində dinləyici olub saatlarla oturmaq istərdik. Zaman bizi gözləmədi, bu gün Vaqif müəllimin dərsinə tələsən tələbələrimə həsədlə baxmadan dayana bilmirəm.

Azərbaycan ədəbiyyat tarixində öz yolu, öz sözü, öz izi, öz düşüncəsi olan nadir müasir şairlərdəndir Vaqif Aslan. Müxtəlif janrlarda, müxtəlif mövzularda olan hər bir əsər bir-birindən üstün, bir-birində mənalıdır. Öz üslubu, orijinal anlatma forması, əsrarəngiz söz qəlibləri.. bütün bunlar Vaqif Aslanı bizdən üstün, şairlik zirvəsinə qaldıran məqamlardır. Vaqif Aslanı tanıyanlar, ən çox da tələbələri bilir, o düşündüyü kimi danışır, danışdığı kimi yazır. Onun həyat, yaşam, yaradıcılıq tərzi birdir, vahiddir. Vaqif müəllim yazdığı şeirlər sərhəddindədir, o özyazdığını öz əməli ilə inkar edənlərdən deyil. Vaqif düşündüyü kimi danışır, ən dərin sirli məqamlarını bütün aşikarlığı ilə dilə gətirir, fikirini boyamağa ehtiyac görmür, fikrinə süni bəzək vermək bir şəxsiyyət kimi özünə və yaradıcılığına yaddır. Ona görə Vaqif Aslan səmimi insandır, səmimi vətəndaşdır, səmimi müəllimdir, ən əsası səmimi şairdir, dramaturqdur. … Vaqif Aslan xalqın içindən çıxan, xalqın şairidir. Onun ifadə tərzi də xalqın dilinə yaxın deyil, elə xalqın dilidir. “Hayandasa...” deyə mühazirəyə başlayan sevimli müəllimimizin yaradıcılıq dili ilə gündəlik danışıq tərzi nə qədər eyniyyət təşkil edir. Ya V.Aslan bir şəkili kimi yazır, ya da məncə doğru olanı, V.Aslan bir şəkili olaraq daim şair kimi danışır. …Dərin lirik, fəlsəfi, tarixi fikirlərə Şair V.Aslanın da yaradıcığı boyu rast gəlirik. Onun yaradıcılığında yersiz pafosa yer yoxdur. Onun hər bir fikri tarixi faktlarla əsaslanır. Əsərlərində göstərilən bu məsələlər mötəbər mənbələrdən əxz olunmuşdur. Bu gün məmləkətimizin düşdüyü siyasi və tarixi proseslər göstərir ki, gen yaddaşımızın tozunu silməyə böyük ehtiyac vardır. Bunu hər bir yolla həyata keçirmək vacibdir. Nəzərə

alsaq ki, ədəbiyyat ən təsirli silahlardan biridir, V.Aslanın ictimai-siyasi və tarixi mövzulara həsr olunmuş əsərləri gününmüzün prioritet məsələlərindəndir.

Müasir Azərbaycan ədəbiyyatının orijinal söz ustadı Vaqif Aslanın yaradıcılığı öz çoxşaxəliliyi ilə seçilir. Onun əsərlərində dərin psixoloji vəziyyətlər, insani duyğular, ən ülvi hisslər, məhəbbət, nakamlıq, həsrət, vüsal, həmçinin vətənpərvərlik, türkçülük, keçmişə sevgi və qayıdış, turançılıq ən axıcı dillə izhar olunur.

Şeir amansızdır, şair qardaşım,
Yaman imansızdır şeir, qardaşım.

– deyən şair öz çiyinlərini bu ağır yükün altın verməkdən, poeziyanın daş-kəsəkli yollarından çəkinmir.

… Ancaq gün birləşmə, birlikdə mübarizə aparma günüdür. Şairin poema yazma qayəsi də elə budur:

Sünnüsən, şiəsən, budda, sufisən,...
İsəvi, Musəvi, ya konfusisən...
Sən – Türksən! Sən – Türksən!!
Sən – Türksən!!! Türk – sən!!!!
Titrə, özunə dön millətim mənim.

Günəşi bayraqtək sancmışıq göyə,
Türkoğlu, bir dikəl, ona dur yiyə.
Ruhu əcdadının şad olsun deyə,
Titrə, özunə dön millətim mənim.

Sənin tarixin var, bəngüdaşın var,
Daşdan da dözümlü qan yaddaşın var.
Hələ qabağında ər savaşın var,
Titrə, özunə dön millətim mənim.

El-el, bölgə-bölgə paralanma gəl,
Qopub buğum-buğum, aralanma gəl,

Ad-ad, nəsil-nəsil qaralanma gəl,
Titrə, özunə dön millətim mənim
Titrə, özunə dön millətim mənim.

Bu misralar Bilgə Xaqanın dilindən, bir nəsihət, bir vəsiyyət xarakterində verilir.

*Şəki, 2016-cı il*

***Bax. Gənc Tədqiqatçıların II Beynəlxalq Elmi Konfransın materialları. Azərbaycan ədəbiyyatı. Səh. 1129 – 1131. Bakı, 27 – 28 aprel 2018-ci il.***

## Sənan Paşa ilə yazışmalar

*(Sənan Paşa tələbəm Biləsuvarlı Natəvan xanım Əzizovanın övladıdır)*

**I**

### Sənan Paşa, min yaşa!

**(Yuxarıda sözügedən şəkli göndərdiyi üçün)**

Salam, ay Sənan Paşa!
Yaşa, yaşa, min yaşa!
Bu nə gözəl şəkildi?
Söylə, haçan çəkildi?

Tanımamaq olurmu
Rüstəm Kamal yoldaşı?
Dəyirman daşı kimi
Fırlanır ömrün daşı.
Dostluqda, etibarda
Oxun dəyməsin daşa.
Mən Vaqif Aslan olum,
Sən də ol Sənan Paşa!

*7 iyul 2016-cı il*



*Şəki, 7 iyun 1997-ci il. Şeir isə 19 ildən sonra yazılmışdır*

## II
## Bir şəklin tarixçəsi

Onda hansı il idi,
hansı aydı, hansı gün?
Mən özüməm şəkildə
ayaq üstə gördüyüm.

Sağımdakı o oğlan,
yəqin, Rüstəm Kamaldır.
Yaddaşı da oyatmaq,
bu məqamda mahaldır.
Gəldikcə yaş Gözümdən
Soruşuram özümdən:
– Dünya belə mürəkkəb,
dünya belə sadəmi?
Bəs mən kimin şəninə
qaldırmışam badəmi?
Bu – dostun ad günüdür.
Ömür, həyat günüdür.



*O zamankı tələbələrimiz*

Təbrik var – deyilməli!
Meyvə var – yeyilməli!

Budur, Ədəm bağında
nə şeytan var, nə iblis!
İnsanlara səadət,
uğur diləyirik biz.

Baxdım, həsəd apardım
yaşanan o dəmlərə.
Eşq olsun bu füsünkar,
bu gözəl aləmlərə!
Eşq olsun Həvvalara,
Eşq olsun Adəmlərə

*7 iyul 2016-cı il*



*Bu dərkənar yuxarıdakı şəklin arxasındadır.*
*İndiki Dr.prof. Rüstəm Kamalın xətti ilə yazılmışdır.*

## III
## Günümüzün həqiqətlərindən danışarkən

Biz nədən qorxuruq axı?
Qorxursa, yad-yalan qorxsun.
Tanrı boyda dostumuz var!
Qoy Tanrısız qalan qorxsun.

Yoxa çıxıb gördüyünü…
Özü söküb hördüyünü.
Sağ əliylə verdiyini
Sol əliylə alan qorxsun.

Yetim qoyub yuvasını
Atıb isti sobasını…
Öz yurdu, öz obasını
Vay-şivənə salan qorxsun.

Vaqif Aslan desin sənə.
Dedikcə fəhm eyləsənə
Qalx, ucadan söyləsənə.
Könül evi talan qorxsun.

*sentyabr 2018-ci il*

# VAQIF ASLAN POEZİYASINDA QARABAĞ MÖVZUSU

**Dr. Prof. Asif Rüstəmli**



*Ədəbiyyat 09:47 / 06.07.2020*

Uzunmüddətli müşahidələrimə sığınaraq belə bir qəti qənaətdəyəm ki, yaradıcılıq palitrasının çoxşaxəliyinə baxmayaraq Vaqif Aslan milli-mənəvi tariximizdən süzülüb gələn qədim adət-ənənələrimizin, deyim və duyum dünyamızın fəlsəfi məqamlarını, əfsanələşmiş və əfsunlaşmış rəmzlərini poeziyaya gətirən incə ruhlu, həssas qəlbli lirik şairdir. Sözün külünü qoyub közü ilə oynayan, oynadıqca könülləri, duyğuları yerindən oynadan, sərt həqiqətləri və zərif duyğuları lirik məcraya yönəltməyi bacaran istedadlı söz ustasının xüsusilə Qarabağ müharibəsi dövründə, insanlığın sınağa çəkildiyi, müqəddəs mənəvi mirasların unudulduğu zamanda yaratdığı əsərlər müsbət və müstəsna məziyyətlərə malikdir. Milli mentalitetə, mənəvi dəyərlərə sayğı hissi ilə yoğrulduğu üçün bu poeziya nümunələri bədii keyfiyyət və sənətkarlıq baxımından çox sanballıdır.

Min illərdən bəri türk insanı üçün dəri papaq əlahiddə anlam kəsb edir, qeyrət, şərəf nişanəsi, kişilik rəmzi sayılır. Vaqif Aslanın 1989-cu ildə qələmə aldığı "Papaq" şeirində isə mövzuya fərqli ya-

naşma var, birbaşa Qarabağ münaqişəsinə toxunulmasa da mühitdəki anti-milli prosesin xarakterinə, insanların mövqeyinə işarələr duyulmaqdadır.

Neyləyim, bu dünya döşümə yatmır,
Könlümü oxşamır, xoşuma yatmır.
Özümə yaraşmır, başıma yatmır,
Tülkü dərisindən tikilən papaq.

Xüsusilə son beyt poetik ifadə tərzinə, dərin, rəmzi məna qatlarına malikdir. Misralardakı gizlinlərə vaqif olmaq üçün ötən əsrin 80-ci illərinin sonunda Azərbaycanda baş verən hadisələri diqqətlə nəzərdən keçirmək zərurudur. Qarabağ münaqişəsinin qızğın çağı... Kremldə M.Qorbaçovun açdığı "Perestroyka" fabrikasında xüsusilə Azərbaycan rəhbərliyi üçün "tülkü dərisindən papaq" istehsalı və istifadəsi üçün təlimatlar... Şeirdə "tülkü dərisindən tikilən" bu baş örtüyü Moskvanın "Baş ideologiya"sının simvoluna çevrilir. Şair belə papağı özünə yaraşdırmayan, başına yatmayan cəsurların meydanlara sığmayan hayqırtısını, etirazlarını göz önündə canlandırır, tülkü papağı altında kişiliyin, mərdliyin, millət qeyrəti çəkməyin mümkünsüzlüyünü vurğulayırdı…

Kişi məfhumunun biçimi, məna qatları, mənəvi-əxlaqi keyfiyyətləri Vaqif Aslanın poeziyasında fərqli rakurslardan dəyərləndirilir. Onun "Kişilər" şeiri birbaşa Qarabağ müharibəsinə həsr edilməsə də həmin dövrdə qələmə alınıb. Şairin bədii ittihamnamə kimi səslənən "Kənd-kənd, şəhər-şəhər axırıq daha, axana qıraqdan baxırıq daha" – misralı suçlamasında əsərin yazıldığı vaxt, zaman haqqında informasiyanın dəqiqliyi şübhə doğurmur. Bu şeirdə çağdaş "kişi" laqeydliyinin, biganəliyinin canlı və unudulmaz obrazı yaradılıb. Keçmişlə indinin, dünənlə bu günün kişilik meyarları şairin haqq tərəzisində, ədalət mizanında müqayisə edilir, mənəvi aşınmanın çağdaş durumuna çox sərt, güzəştsiz qiymət verilir.

Vaqif Aslan əsasən dilimizdə biganə, laqeyd, qayğısız adam haqqında işlədilən "Araz aşığından, Kür topuğundan" xalq frazeo-

logiyasını müstəqim mənada improvizasiya edərək "Kişilər" şeirində öncə ulu babalarımızın uca, möhtəşəm, əzəmətli görkəmi barədə unudulmaz təəssürat yaradır:

"Araz aşığından, Kür topuğundan"olan kişilər!
Nə qədər ucaymış boyunuz sizin,
Əsliniz, kökünüz, soyunuz sizin,
Axıb qanımıza dolan kişilər!

Şairin düşüncələrinə əsasən torpağa sevgisi, vətənə bağlılığı ilə əsli, kökü, soyu uca olan, "Qaya parçasından, daş qopuğundan, nağara düzəldib çalan... Ox kimi şığıyıb Yazı düzündən, düşməni atından salan" bu köhnə kişilərin, ulu babalarımızın bugünkü törəmələri, nəvə-nəticələri ilə müqayisəsi "oddan kül törər" deyimini xatırladır. Nəsillərdən-nəsillərə, əsrlərdən-əsrlərə müqəddəs əmanət kimi qorunub saxlanılan vətən torpağının böyük bir parçasının – milli mədəniyyətimizin beşiyi, musiqi akademiyamız kimi tatınan Qarabağımızın, Şuşamızın bu gün düşmən tapdağı altında inləməsi ilk növbədə çağdaş kişiliyin mağmın və əlacsız vəziyyətinin real mənzərəsidir. Şairin sonda üzünü ulu, müqəddəs ruhlara tutaraq çılğın tonun hakim kəsildiyi acı, ağrıdıcı etirafları itkilərin səbəb və nəticəsi haqqında ciddi düşünməyə əsas verir:

Getdi özünüzlə zorunuz sizin,
Dolur gözümüzə qorunuz sizin,
Çatdam-çatdam olsun gorunuz sizin,
Daşımız qalmadı, daşımız üstə,

Ay yurdu-yuvası talan kişilər!
Olunca, dünyada olmasa yeymiş,
Qalınca, dünyada qalmasa yeymiş,
Sizin yerinizdə qalan kişilər!
İndiki kişilər – yalan kişilər!

Sözün közünün körükləndiyi, düzünün sərgiləndiyi bu misralardakı sərt gerçəkliyin etirafı nə qədər ağır olsa da qaçılmazdır.

Vaqif Aslanın Qarabağ mövzusunda yana-yana yazdığı şeirləri ifadə tərzinin hiss və duyğulara təsir gücü, fikrin, mənanın üzü qarsalayan odu-alovu düşünüldüyündən və gözlənildiyindən daha şiddətli özünü büruzə verir. Onun ürəkləri duyğulandıran, yaddaşlara ağrılı-acılı iz salan Qarabağ qoxulu əsərlərindən "Kərbəla faciəsi", "Gəlmədi", "Ay səni", "Qaçqın mahnısı" və s. şeirlərini ayrıca vurğulamağa ehtiyac duyulyr. Şairin eyni mövzuda yazdığı "Şəhid köynəyi" müharibə dövrünün "arxa cəbhə"sindəki mənəvi-psixoloji, milli-əxlaqi durumun dözülməzliyindən bəhs edən, sarsıdıcı, ironik üslubda qələmə alınmış dəyərli bədii sənət nümunəsidir. Cəmiyyətdəki aşınmalar, baqqal psixologiyasının müqəddəs mənəvi qatlar üzərindəki hökmranlığı, and yerinin alqı-satqı məkanına çevrilməsi, şəhid köynəyinin, şəhid ruhunun bazar məzənnəsi ilə dəyərləndirilməsi itkilərin, məğlubiyyətlərin başlıca səbəblərini və əsas ünvanını nişan verir. Şair "Didərginin tikəsini yeyənlərə", "Qandan baha, candan baha" şəhid köynəyini vəzifə, varidat üçün əldə bəlgə edənlərə üz tutaraq deyir.

Mənsəb gəzən, taxt axtaran taxtabaşlar,
Gəzdiyiniz hal qurtarıb.
Şirin nağıl, yalan vədə,
Heç dəyməyib, kal qurtarıb.

Doğru sözə, düz ilqara qismət olan
Buxov, noxta, nal qurtarıb.
Satılmayan namus, həya,
Satlıq qoyun, mal qurtarıb.
Şor quruyub, yağ tükənib, bal qurtarıb.
Bircə şəhid köynəyi var, o da mənim.
Qalan nə var... Sizin olsun!...

Şeirin nikbin ruhundan, rəmzi məna qatlarından bəlli bir ideya aşılanır; nə qədər ki, şəhid məzarları ziyarətgahlara, şəhid köy-

nəkləri işğal altında inləyən ərazilərin azadlığı uğrunda döyüşə atılan cəsurların, mübarizlərin zəfər bayrağına çevrilməyib mənəvi düşkünlüyün nicat yolu, baqqal psixologiyasının və harınlıq sindromunun qarşısının alınması mümkünsüzdür.

Vaqif Aslanın bütövlükdə ədəbi-bədii yaradıcılığını dünənimizlə bu günümüz, qədim və zəngin keçmişimizlə fikir, düşüncə pürealizminin intişar tapdığı çağdaş zəmanəmiz arasında məntiqi əsaslara dayalı, milli-mənəvi və bədii-estetik ornamentlərlə süslənmiş körpüyə bənzətmək olar. Misralarında tarixin nəhri çırpınan, nəbzi döyünən şeirlərinin mayasında, nüvəsində sirli-sehirli suallar, müəmmalar yuvalanmış, zamanın dumanlığına bürünmüş örtülü mətləblərin ecazkar cazibəsi dünənimizə boylanmağa, keçmişimizdən gələn səsləri dinləməyə vadar edir. Qobustanı Azərbaycanın daşlaşan əlifbasına bənzədən şair "Daş əlifba" şeirində yazır:

"Qaval daş" çalınır nə vaxtdan bəri?
O ana qəlbini necə ovudum?
Bəlkə ası düşən bəy ərənləri,
Qarğışı tutubdur Dədə Qorqudun?

Bu yığcam misraların bələdçiliyi ilə tarixin sübh çağına xəyali səyahət, asiliklə mərdliyin, zərifliklə sərtliyin vəhdətində təcəlla tapan daşlaşmış rəmzlərin məna qapıları önündə düşüncələrə dalmaq məziyyəti Vaqif Aslan poeziyasının vüsətindən, hikmətindən və qüdrətindən qaynaqlanır. Onun oğuz bəylərinə, Dədə Qorqud qəhrəmanlarına həsr etdiyi şeirlərində yalnız tiplərin xarakterinə, mədəni və mənəvi keyfiyyətlərinə deyil, eyni zamanda dövrün, mühitin mürəkkəb, qaranlıq məqamlarına da tam aydınlıq gətirilir, obrazlar fərqli baxış bucağından dəyərləndirilərək yeni təqdimatda poeziyasevərlərə çatdırılır. Vaqif Aslan "Oğuz bəylərinə və xatunlarına salam", "Qanlı Qoca", "Dəli Domrul", "Qazan Xanın yuxusu", "Dəli Ozan", "Təpəgöz", "Aruz qoca", "Dirsə Xan", "Yalıncıq", "Oğuz alqışı" və b. əsərlərində "Qamus və namus kitabımız" (Prof.Y.V.Qarayev) olan "Kitabi-Dədə Qorqu"un tarixi-etnoqrafiq

mənzərəsini, mənəvi-əxlaqi meyarlar sistemini poetik düşüncə müstəvisində obyektiv qiymətləndirməyi bacarmış, tədqiqatçı-şair statusunda layiqli mövqeyini daha da möhkəmləndırmişdir V.Aslanın polemikaya, ciddi təhlilə dayanaqlı, mötəbər poetik düşüncələrinin daşıyı¬cısı olan, məhəbbət, təbiət, sənət və həqiqət mövzusunda yazdığı lirik-fəlsəfi şeirləri yetərincədir. Onun görkəmli tənqidçi, türkoloq və ictimai xadim Aydın Məmmədova həsr etdiyi "Aydın", təfəkkür tariximizin dərin qatlarından söz açan "Ruhlarla söhbət" poemaları, "Qan üzərində rəqs", "Kötük" pyesləri, çoxsaylı elmi-tənqidi əsərləri, XVII əsr fransız səyyahı Jan Şardənin ("Parisdən İsfahana səyahət"), Pol Verlenin, Erve Bazənin, Öjen Potyenin irsindən – birbaşa orijinaldan bədii tərcümələri, səmərəli pedaqoji fəaliyyəti etiraf edək ki, ədəbi tənqidimiz tərəfindən indiyədək həssaslıqla qarşılanmayıb, sənətkarın fədakar və təvazökar əməyi təəssüf ki, müvafiq səlahiyyətli orqanlar tərəfindən layiqincə dəyərləndirilməyib.

**Bununla belə əminliklə vurğulamaq olar ki, çağdaş ədəbi prosesdə fəallığı ilə seçilən, bədii ədəbiyyatımızın barınmasında müstəsna xidmətlər göstərən, mayası istiqlal məfkurəsi ilə yoğrulan milli ruhlu, istedadlı şair Vaqif Aslanın zəngin bədii yaradıcılığı ədəbiyyatşünaslığımızın indiki təkamül mərhələsində ciddi elmi araşdırmaların obyektinə çevriləcək, mənəvi irsimizin təbliğində mötəbər mənbə missiyasını ləyaqətlə daşıyacaqdır.**

*Asif Rüstəmli*
*Bakı, 05 iyul 2020-ci il*

## Dr. Prof. Qurban Bayramov

Vaqif Aslan müasir dövrümüzün çox dəyərli ziyalısıdır və universal yaradıcılıq imkanlarına malikdir... Bütün təbriklərə qoşulur və ona can sağlığı, uğurlar arzulayıram. Çünki onun hər uğuruNU ədəbi CAMEƏmizin UĞURU hesab edirəm! = QURBAN BAYRAMOV, tənqidçi-ədəbiyyatşünas.

## Ehtibar Karimov

Vaqif Aslan yaradıcılığında hər zərif nöqtə isti, ılıq sadə söz çələngi ilə hörülmüsdür. Oxuyanda hər şer oradan sənə açıq şəkildə insanliq, qayğikeşlik, vətənə, insana məhəbbət oyadir.

## Hikmət Əbdülhəlimov

Məşhur şairimiz Məhəmmədhüseyn Şəhriyar yazırdı – Şair ola bilməzsən, anan doğmasa şair... Vaqif anadangəlmə şairdir. Mən onu müqtədir şair kimi yüksək dəyərləndirirəm. Cansağlığı, mənalı ömür arzulayıram.

## Dr. Prof. Əli Shamil

Vaqif bəy, uğur olsun. Sevinirəm ki, şeirlərinizi Təbrizdə, Urmiyada da həvəslə oxuyanların sayı gündən-günə artır.

## Mahir Cavadlı

Dəyərli dostum, gözəl insan, istedadlı şair, yorulmaz tədqiqatçı Vaqif Aslanı ürəkdən təbrik edirəm! Bir dəfə Alman dostlarımla Vaqif müəllimin qonağı olduq.

Almanlar şairin zəngin kitabxanasına heyran qaldılar. Bir evdə bu qədər kitab olmasından şaşırmışdılar. İnişil Keramika Mərkəzinin açılışı ilə bağlı dostalarımla yenə Vaqif müəllimi ziyarət etdik. Vaqif müəllim həyətində bir neçə şeir oxudu. Hamımız feyziyab olduq. Var olun, Vaqif müəllim. Doğum gününüz mübarək!

## Dr. Prof. Ramiz Əskər

Əziz Vaqif! Sənin ulu və mükəmməl sənətindən zövq alıram! Yaşa, var ol Vaqif, şeirlərin dahiyanə şeirlərdir. Hər biri şedevrdir! Eşq olsun sənə!

*14 yanvar 2018-ci il*

## Pərvin

**Azadlığımızın güzgüsü: "Müstəqillik dövrü Azərbaycan ədəbiyyatı" ikicildliyi**

…"Müstəqillik dövrü Azərbaycan ədəbiyyatı" ikicildliyi təkcə ədəbiyyatımıza, ədəbiyyatşünaslıq elmimizə deyil, bütöv tariximizə, millətimizə töhfədir.

Bütöv bir əsər adlandıra biləcəyimiz bu kitabların əsas üstün cəhəti çoxcəhətli, çoxşaxəli olmasıdır. Ümumiləşdirilmiş irihəcmli məqalələrlə yanaşı, dövrü daha dəqiq anlamaq üçün verilən ayrı-ayrı oçerklər də son dərəcə uğurludur. Həmçinin, yalnız paytaxtdakı ədəbi prosesin yox, həm də bölgələrdəki mühitin tədqiqata cəlb edilməsi mühüm məqamdır. Bu baxımdan, professor Asif Rüstəmlinin Vaqif Aslan, Məmməd Alim, professor Vaqif Yusiflinin Ənvər Əhməd, Novruz Nəcəfoğlu, Barat Vüsal, Ramiz Qusarçaylı və digər bölgələrdə yaşayıb-yaradan sənətkarlarla bağlı məqalələri yeni informasiyalar verir.

*06 fevral 2017-ci il*

**Ahmed Kaytançı, Adana, Türkiyə Sevgili Dost VAKİF ASLAN BEY, Bazen kelimeler kifayetsiz kalır. Söyleyecek söz bulamazsınız. Yutkunur yutkunur durursunuz ya... Belki de gözlerinizi bile saklayacak bir yerler ararsınız. Gözlerime baka baka okuduğunuz bu yazıyı hayatım boyu unutmam mümkün değil. Hem sizin sesinizden dinleme, hem de dönüp dönüp okuma imkanı bulduğumda Kafkas Dağlarınında bir kültür hazinesinin olduğunu gördüm. Bu hazineye sahip olan milletin uzun yıllar yaşayacağına, asla ve asla yok edilemeyeceğine inancım bir kat daha arttı. iyi ki varsınız. iyi ki soyumdan,iyi ki kanımdansınız. HÖRMETLERİMLE...**

*Rumuz KAYTANCI*
*24 avqust 2007-ci il*

**Dr.Prof. V.T.Qurbanov, N.R.Ramizzadə**
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

## Məsələyə müasir baxış

Nəticələrimiz: 1) pedaqogika tarixindən hesabat səviyyəli məlumatlar toplamaqdansa, elmi kitabların təhlilini müdafiə mövzularına çevirmək lazımdır. Məsələn akademik A.X.Mirzəcanzadənin "İxtisas kursuna giriş", "Elmin hümanitarlaşdırılması haqqında etüdlər", Z.İ.Qaralovun "Tərbiyə" trilogiyasını, Vaqif Aslanovun (Vaqif Aslanın) səyyahların Azərbaycan haqqında əsərlərinin tərcümələrini, "Azərbaycan pedaqoji ensik lopediyası" (1;2;3;4) və s. kimi mövzuları.

Bu cür əsərlərin öyrənilməsi əsl alim yetişdirməyin optimal yolu sayıla bilər. Çünki adları çəkilən kitablarda dünya elm nəzəriyyəsi, hüququ, qanunu, fəlsəfəsi, məzmunu, metodikası və s. vardır...

***Bax. Pedaqoji Universiotetin XƏBƏRLƏRİ. İSSN 25-20-2014. Hümanitar, ictimai və pedaqoji elmlər seriyası, №4, 2019, c.67, səh.68.***

**Abdullayeva Gülarə Abdurahman qızı**
*(f.e.ü.f.d.ilologiya elmləri namizədi AMİ-nin Şəki filialı)*

## Vaqif Aslanın şeirlərinin dili

Bütün tarixi dövrlərdə bədii ədəbiyyat dilin xarakterik xüsusiyyətlərinin göstəricisi olmaqla yanaşı, həm də onun inkişafında və zənginləşməsində, ədəbi dilin cilalanmasında müstəsna rol oynamışdır. Ayrı-ayrı şair və yazıçıların yaradıcılığını təhlil etməklə, həmin dövr üçün ədəbi dilin müxtəlif səviyyələri haqqında konkret fikir yürütmək mümkündür. Eyni zamanda, ədiblərin yaradıcılığında işlənən onlarla yeni söz və ifadə ədəbi dilə keçərək intensiv işlənmə hüququ qazanır və nəticədə dil zənginləşir. Ədəbi dilin zənginləşməsində, sözlərin yeni-yeni məna çalarları qazanmasında poeziya müstəsna əhəmiyyətə malikdir. İnsanın ən kövrək duyğuları, qəlb çırpıntıları, fikir təlatümləri öz ifadəsini poeziyada tapır.

Poeziya o zaman ölməz olur ki, tükənməz enerjinin və yuxusuz gecələrin birliyindən yaransın və zəngin ifadə vasitələrinə malik olsun, ümumxalq dilinin zənginliklərini üzə çıxarsın, ədəbi dilin hüdudları ilə məhdudlaşmasın. Müasir Azərbaycan ədəbiyyatında öz sözünü deyən, oxucuların dərin rəğbətini qazanan onlarla sənətkarın adını qeyd etmək olar. Belə istedadlı qələm sahiblərindən biri də müasirimiz şair Vaqif Aslandır. "Ruhlarla söhbət", "Oğuz elinə salam", "Qanımdan rəng alan gül" kimi irihəcmli kitablarda toplanmış poema və şeirləri ilə oxucularının sonsuz sevgisini qazanmış şair müasir Azərbaycan ədəbiyyatına gözəl töhfələr verməklə yanaşı, ədəbi dilimizin inkişafında da özünəməxsus rol oynayır.

V.Aslanın şeirlərinin dili onun ümumxalq dilinin müxtəlif laylarına, sözün məna incəliklərinə dərindən bələd olduğunu göstərir. O, gurultulu ifadə və ibarələrə can atmır, fikirlərini çox sadə və təbii bir dildə ifadə edir:

Yaşıl yarpaq, solacaqsan,
Dönüb xəzəl olacaqsan.
Əsən yellər sümüyünü saz eyləyib çalacaq,
Nəm torpağa salacaq.
Mən özüm də sənin kimi!

Verilmiş bu kiçik şeir parçaqsında ümumişlək sözlərdən istifadə etməklə şair, bir yarpağın, bir insanın, bir dünyanın gərdişini, gəliş-gedişini çox böyük ustalıqla, poetik şəkildə ifadə etmişdir.

Rəssam fırçası rənglərlə möcüzələr yaratdığı kimi, şair qələmi də öz fikrini söz və ifadələrlə çox böyük ustalıqla boyayır. V.Aslanın şeirlərinin dili o qədər axıcı, o qədər oynaqdır ki, bir oxunuşda əzbərlənir. Hər söz, hər misra oxucunu öz ardınca çəkib aparır. Müəllif bizim dəfələrlə gördüyümüz, müşahidə etdiyimiz hadisələri elə mənalandırır ki, heyrət dənizinə qərq olmaya bilmirsən:

Ağac gördüm sarmaşıqlar içində,
Alçaq, uca-hamısı da yan-yana.
Ağac gördüm bir boyda bir biçimdə,
Ağaclar da bənzəyirmiş insana.

Vaqif Aslanın şeirlərində boş misra, yersiz işlənmiş söz yox dərəcəsindədir. Güclü maqnit dəmir qırıntılarını çəkən kimi, şairin təbi də hadisələrin mahiyyətinə uyğun ən zərif ifadələri seçir: Geciksən səbrimlə yorram gecəni; Qəlbinazik yaranmısan sən əzəl; Ey mənim bəxtimin uzaq ulduzu; Gün düşüb alnında çiçəkləyib tər; Dünyanın bakirə ilk baharı; Gözünə bax, ulduz-ulduz axır hey; Qızılgülün qız baxışları; Töküb ilhamımın piyləsinə, Baharı içmişəm meyxoş olmuşam; Şair sinəsindən tanınar və s.

V.Aslanın şeirlərinin dli hikmətli söz və ifadələr, atalar sözləri və məsəllərlə zəngindir. Atalar sözləri və məsəllərdən müəllif, fikirlərinin bədi təsdiqi üçün tutarlı vasitə kimi istifadə etmişdir: Niyyətin haradır mənzilin ora; Haram kama yetəmməz, Əkilməsə bitəmməz, Əkinçinin darısı; Halal zəhmət itəmməz; Artıq tamah min ildir ki daş yarır, Para-para olan daşlar baş yarır; Tanıyanlar olar, Gözəl, düzdü bu, kəkliyi ayaqdan, ceyranı gözdən; Yaxşılığa yaxşılıq bir əvəzdir, əvəz verib əvəz ummaq qərəzdir; Verən əldən allah kəsməz deyirlər; Unutma ki, haqq nazilər, üzülməz, düz deyənə durub dodaq büzülməz; Ara yerdə namus gedir, ad batır, ad batırıb yurd itirən naz satır və s.

Vaqif Aslanın şeirləri söz və ifadə baxımından da fərdiləşmişdir. Boya-başa çatdığı Şəki torpağının duzlu-məzəli danışıq tərzi də onun şeirlərində duyulmaqadır. Bədii dili rəngləmək, zənginləşdirmək məqsədi ilə şair şivə sözlərindən xüsusi məharətlə istifadə etmişdir:

Şıtqa vur, ovça çal, döyülsün qaval;
Mənim şeirim Qaraqum konfeti döy
Yeyəsən, pəh-pəh deyəsən,
Qısası, saqqız da döy,
Həfrayı tənqidçi tək ad üçün çeynəyəsəm;
Sınar, oşalanar bu qəlb, bu ürək;
Çəpənnazı baxa-baxa,
Salma məni daşa-dağa;
Çöl üzü tor, iç üzü por;
Cici-mici bir qız ilə evləndirək;
Nə kütə boyun əy, nə hütə alçal və s.

V.Aslanın şeirləri Dədə Qorqud mayası ilə yoğrulub. Əsrlərin arxasından boylanan bu qəhrəmanlıq salnaməsini öz incə, kövrək qələmi ilə bizə qanadlandıran şair dilin bütün potensial imkanlarından istifadə etməyə çalışmışdır. Hətta arxaikləşmiş sözlər də şairin dilində canlanır, gözəlləşir. Məsələn, çal qaraquş ərdəmli, elat, qəlbi; Qalınca dünyada qalmasa yeymiş, apalaca otaq kimi söz və ifadələrin mənası asanlıqla qavranıldığı kimi, şeirin dilinə bir gözəllik də qatır.

Vaqif Aslan öz fikrini qoşa sözlərlə, həmcins, sinonim söz və ifadələrlə qollu-qanadlı ifadə etməyi sevir:

Ey gəlin otaqları, xoşbəxt binalar salam!
Mən haqq yolçusuyam. O mənə yoldur.
Arxadır, dayaqdır, qanaddır, qoldur.
Neynim ki, ağrısı, acısı boldur.
Mən giley dünyası, həsrət yoluyam.
Ürəyi doluyam, qəlbi doluyam.
Gah yazam, gah qışam – Cumayoğluyam.
Belə tanınmışam, get ondan soruş.

V.Aslan dilə yaradıcı yanaşmağı bacarır. Onun poeziyasında ancaq V.Aslan qələminə məxsus söz və ifadələr istənilən qədərdir: qandaşlar, başbilənlər, könlüqırıq gözəl, dərddaşlar, qıyımsızlıq, Açılıb gül kimi gümüşlənərdin, qas-qas gülmək, Qavaldaşı qavaltək gumbur-gumbur çalanlar və s. V.Aslan şeirləri nə qədər axıcıdırsa, bu şeirlərdə sözlər, səslər də bir o qədər həmahəngdir:

Qara-qara qədəhlərdə
Qara şərab içə-içə
Qara qoyun qovurması
Yeyənlərə tost deyirik.

Vaqiv Aslanın şeirlərində təzadlar və qarşılaşdırmalar bədiilik vasitələri sırasında xüsusi yer tutur:

Xoş yazına, sərt qışına vuruldum;
Çoxu çoxdur, azı azdır,

Toyu toydur, yası yasdır,
Qışı qışdır, yazı yazdır,
Bir ilahi sözdür dünya.

Şairin şeirlərinin bədii sintaksisi də diqqəti cəlb edir. Onun şeirlərində istifadə olunan inversiya və parselyasiyalar mənanın daha da dolğunlaşmasına səbəb olur.

Bulaqsan, gözümdən axırsan mənim.
Tüstüsən, təpəmdən çıxırsan mənim.
Dustaqsan, könlümdən baxırsan mənim,
Ay ilk məhəbbətim, ilk məhəbbətim.

Vaqif Aslan şeirlərində bədii dilə xas olan bütün bədii təsvir və ifadə vasitələrinə bol-bol rast gəlmək olur. Onun şeirlərinə məxsus fərdi-üslubi birləşmələrin çoxu metaforlaşdırma yolu ilə yaranmışdır. Şairin müqayisələri ürəyəyatımlıdır:

Sarı simdə çalıb tale sazını,
Həsrətin də xatirini xoş etdin.
Çirin-acı bir şərbəti nuş etdin;
Dərdi yandır, nisgili qov, qəmi sil.
Gözündən nur dolu bir badə içdim;
Gələndə ilk bahar, göy otlar kimi,
İnsanın torpaqdan göyərməyi var;
Məndə dağ ətri var, aran odu var;
Sinə dəftər oldu, dil qələm oldu,
Yazdığım hər şeir bir aləm oldu və s.

Vaqif Aslanın poeziyasında lirizm çox güclüdür.Onun şeirlərində Şəhriyar nəfəsi, Füzuli yanğısı duyulmaqdadır. Füzuli bir ahı ilə min dağı bada verirsə, Vaqif Aslan öz dərdini daha real şəkildə ifadə edir, o, sonsuz məhəbbətlə sevdiyi və tərənnüm etdiyi vətəninin zaman-zaman başına gətirilən müsibətlərə, torpaqların işğalına dözmür, dərdini ürək yanğısı ilə oxucusuna söyləyir:

Tutub qayaların daş yaxasından,
Elə silkələrəm paralanarlar.
Bir ah çəkərəm ki, övlad ahından
Dağlar sinəsindən yaralanarlar.

V.Aslanın bütün lirik şeirləri öz ifadəliliyi ilə diqqəti cəlb edir:

Deyinmərəm əzabımı bol eylə,
İncimərəm, yandır məni kül eylə,
Ağrımaram, sinəm üstən yol eylə,
Amma tənə ağrısı var canımda.

Vaqif Aslanın mübaliğələri də canlı və inandırıcı görünür:

Beşiyimdən yer üzü dar,
Heç bilmədim hara düşdüm.

V.Aslanın şeirləri dil baxımından çox zəngindir. Onun əsərlərinə istinad etməklə müasir dilimizlə bağlı istənilən məsələni asanlıqla araşdırmaq və konkret fikir söyləmək mümkündür. Bu baxımdan Vaqif Aslanın əsərləri bizə və gələcək nəsillərə onun ən səmimi töhfəsidir. Biz də ona uzun ömür, duyğu və düşüncələrini qanadlandıran yeni-yeni əsərlər, daha geniş oxucu kütləsi arzulayırıq.

**İstifadə olunmuş ədəbiyyat:**

1. Qarayev Y. Realizm: sənət və həqiqət. Bakı, 1980
2. Şəmsizadə N. Azərbaycan ədəbiyyatşünaslığı. Bakı, 1997
3. Aslanov V. Ruhlarla söhbət. Bakı,1997
4. Aslanov V. Oğuz elinə salam. Bakı, 2000
5. Aslanov V. Qanımdan rəng alan gül. Bakı, 2003
6. Aslanov V. Seçilmiş əsərləri. I cild, Bakı, 2009

***Qeyd:*** *Məqalə nə həsr edilmiş Ali məktəblərarası məqalələr məcmuəsində çap edilmişdir. Bax. Bakı Slavyan Universiteti. Hümanitar elmlərin öyrənilməsinin aktual problemləri. № 6, 2009-cu il, səh. 94-98.*



*Dərviş Osman Əhmədoğlu (1948-2020)*
*(Gürcüstan, Marneuli r-n, Keşəli kəndi)*
*Gürcüstan Borçalı Aşıqlar Birliyinin sədri*

## Ən böyük bar ağacıdı şairlər
## Vaqif Aslan – 60

Mən elə bilirdim Kiş çayından doğulub Vaqif Aslan. Mən elə bilirdim Kiş çayı dalğalarının daşlara-qayalara çırpdığı anların birində, elə həmən çırpılmanın təlatümünnən dünyaya gəlib doğrusu. Bəlkə də Kişdən doğulmayıb bu şair qardaşımız. Kiş onu kəşf eləyib. Hardansa, yerin hansı qatındansa coşğun suların hayqıran səsinə doğru gəlib bu adam.Və Kişin dağlarına uchar olub.Və həmən dağlar da "caynağına"götürüb çox uzaqlara aparmağa çalışıb. Apara bilməyib.

Deyirlər yazda və yayın ilk həftələrində qarğın oynayanda dağ çayları yoluna nə çıxır, əlinə nə keçirsə götürüb aparır uzaqlara. Səsin eşidilməyən, ünün çata bilməyən yerlərinə.

Mən Kürqırağında böyümüşəm. Və "Dəli Kür" dediyimiz bu ulu nəhr də eləcə əlinə nə keçə aparır, kim keçir "yağmalayır". Kiş çayı də yəqin onun kimi. Deyirlər Kiş çayı qəzəbli anında ağzına

alıb apardığı elə qayalar, daşlar var ki,onların bircəciyini yeddi qatar fil yerindən tərpədə bilməz. Bəlkə bu KişVaqif Aslanı da ağzına alıb ilim-ilim itirmək istəyib. Gücü çatmayıb. Dağ kimi dayanıb, qaya kimi sal durub Vaqif Aslan. Və bəlkə də torpaq buraxmayıb. Yurd sarmaşıb ona. "Əlbəyaxa" olublar torpaqla çay. Və gücsüz olub Kiş. Güclü olub torpaq. Və elə orda-dünyaya gəldiyi yerdə də qol-budaq atıb, doğub-törəyib şair Vaqif

Aslan. Dağ çayının şairə gücü çatmaz. Dağ seli şairi yerindən tərpədə bilməz. Şairə təkcə sözün Gücü çatar. Və söz aparar şairi öz ayağına. Hər misrası Kiş çayının ləpəsindən daha böyük bir ləpə. Hər bəndi Kiş çayının dalğasından daha böyük bir dalğa. Hər şeiri Kişdən böyük bir nehirdi Vaqifin.

Kiş çayı qopara bilməyib, Kiş çayı apara bilməyib onu – dedik.

Və bir addım geri çəkilib bu dəli çay. "Gəl qardaş olaq" deyib şairə.

Bəlkə də "sirdaş olaq" – deyib. Və nəhr olmayıb bu bəy əfəndi,

Bulaq olub! Dumduru nur bulağı!

Kiş nəhri – Vaqif bulağı! Yanbayan axıb-çağlaşıb. Amma bircə fərqi olub onların. Kiş çayı yazda coşar, çağlayar. Şair isə ilin hər fəslində. Bir də Kiş nəhri çiçəklənmir heç zaman. Bar da vermir heç vədə.

Elə uzandıqca uzanır ta...Xəzərə qədər. Və orda bitir, qurtarır. Kim bilir, bəlkə də, Kiş elə Kiş olandan bir muraz üstə köklənib zamandan zamana.

Ayağa qalxmaq!!!

Əslində bütün nəhrlərin ən böyük murazıdı bu. Üzü buluda, üzü göylərə-aya, ulduzlara və ordan daha uzaqlardakı gözəgörünməz ənginliklərə doğru axdıqca axmaq. Ta göyə dirək olana qədər getmək istəyib. Bəlkə onda çiçək də açar, bar da gətirərdi bütün çaylar.

Şairsə çiçəkləyir. Bar gətirir. Çünki üzü göylərə böyüyür. Və böyüdükcə də dadından doyulmayan şeirlərini ərsəyə gətirir. Və ağac bar verdikcə başını aşağı əyər deyirlər. Ən böyük bar ağacıdı şairlər. Ağaca bənzədərək "bar verən palıd" deməliyik şairə. Bar berdikcə boyu daha uzaqlardan görünən meyvə ağacıdır şairlər.

Əslində bir Vaqiflik yaşayır onun ruhunda. Və bütün Vaqifliklərə uzanır onun Vaqifliyi.

Dərdə Vaqif...
Yurda Vaqif...
Soya-kökə Vaqif...
Sevgiyə Vaqif...

Şair hansısa bir işığa doğru getməz. O, ancaq söz işığına yürüyər. Şair – işıq deməkmidi məncə.

Öz işığı var Vaqifin.
Söz işığı var Vaqifin.

Şöhrət peşinə düşüb böyük şəhərlərə üz tutan və orda da bir atımlıq barıtı tez qurtaran bəzi yazıqlar doğurdan da nə yazıqdılar. Üzbəüz Kiş adasında bir şəhərdi Vaqif Aslan. Hər kitabı bir meydan. Məni o "şəhər"ə ilk qədəm basdıran bir könül adamına minnətdaram doğrusu.

Həmən adma: – Nə var – dedim – Şəkidə?
– Ən böyük dünyam var – dedi.
– Analar anası anam var – dedi.
– Xan sarayı var.
– Şəhid türk əsgərlərinin qəbri var, dedi.
– Şair Vaqif Aslan var – dedi. O, Vaqifi nişan verdi.
– Kiş çayını keçməyə nə var?
– Daşdan daşa atıla-atıla keçərsən.
– Vaqifiysə üzüb keçmək çox çətindi.

Və mən onda gördüm "Bu adamı haradasa görmüşəm"

– Sözə təzə şırğa vərəniydimi?
– Öz-özünə bulaq olub axanıydımı?
– Yoxsa qələmiydimi?
– Qələmiydi deyəsən!!!

Bu qələmin mürəkkəbi Kiş çayı.
Bu qələmi bitirən torpaq Şəki.
Bu qələmin yaşı – 60.
Bu qələmin adı Vaqif Aslan.
Və onun Borçalıda bir qardaşı var – **Dərviş Osman Əhmədoğlu**

***Bax.*** *"Meydan" jurnalı. Gürcüstan Azərbaycanlılarının aylıq dərgisi 2(13) Aprel 2011.səh.72.*
***Qeyd:*** *Müəllif "Həmin adam" sözü ilə yazıçı dostumuz Rəsul İlməddin-oğlunu nəzərdə tutur)*



*08 oktyabr 2009-cu il. Baş Zəyzid kəndində. Dərviş Osman və Rəsul İlməddinoğlu 08 oktyabr 2009-cu il. Baş Zəyzid kəndində*

## Ağa Ramazan
## Sözün arifi, zamanların Vaqifi

**Vaqif Aslan – 70**

Bəzən olur ki, cəmiyyətdə insanı daşıdığı adla da mənalandırırlar. Oxuduqlqrımdan, eşitdiklərimdən, mən biləni, "Vaqif" sözünün mənası "bilici" və "agah olan" deməkdir. Bu gün Şəkidə söz sənətinin ən mahir bilicisindən söhbət düşəndə birinci növbədə

Vaqif Aslanın adı çəkilir. Onu tanımağın ən bariz nümunəsi onun şeirlərinə nəzər salmaqdır:

Mənim ürəyimdə aslanlar yatır,
Tərpədib oyatma onları hərdən.
Yəqin sakitliyim səni aldadır,
Neynərsən, hamısı oyansa birdən?

Vaqif Aslan boya-başa çatdığı Kiş kəndini belə xarakterizə edir:

Şair sənsən, şeir deyən dilin mən!
Sərkərdəsən, qılınc vuran əlin-mən!
Gözəl sənsən, sevgilin-mən, dəlin-mən!
Bilmirsənmi, oğlun Kərəmsayaqdır?
Səndə şair olmamaq da günahdır.

Böyük şairlərin hər biri ədəbiyyata yeni bir dil gətirir. Füzuli dili, Sabir dili, Səməd Vurğun dili, Məmməd Araz dili, Bəxtiyar Vahabzadə dili. Daha bir dil də var: Vaqif Aslan dili.

Dedim: – Gözəl, nədən kürsən belə sən?
Dedi: – Mənə lay-lay çalıb ana Kür.
Dedim: – Onda, nə bilirsən elə sən!
Dedi: – Bəyəm, necə olur ayrı cür?

XXI əsrin ən mahir futbolçularından biri sayılan Messi topu necə rəqs etdirirsə, Vaqif Aslan da sözü eləcə rəqs etdirir. Vaqif Aslan şeirə, sənətə bağlı bir ömrün layiqli yolçusudur. Vaqif Aslanın şeirləri sanki nəğmədir. Nəğmə də bir dəfə oxunmur ki! Şeirlərini yazanda bəzən fit çala-çala, bəzən də zümzümə edə-edə yazır. Bir dəfə, özünün dediyinə görə, evinin eyvanında döşək üstə bardaş qurub, ayağını ayağı üstə aşıraraq adəti üzrə zümzümə edə-edə, fit çala-çala, dəftər-qələmsiz yeni şeirini oxuyurmuş, yəni, yaddaşına pərçim edirmiş. Bu zaman bir bülbül ayağının baş barmağına qonur, şeir və zümzümə qurtarandan sonra uçub gedir.

Dostumuz Səxavət dediyinə görə, bir dəfə də, Şəkidə Şahinin "Ləziz" restoranının yay köşkündə dostlarının əhatəsində nahar zamanı Vaqif Aslan şeir oxuyurmuş. Orada Türkiyədən gəlmiş yazar Asim Yekələr də var imiş. Qəfildən hava dəyişmiş, külək, yağış bir-birinə qarışmış imiş. Yağışdan və küləkdən qorunmaq istəyən bir dəstə bülbül uçub süfrənin ətrafına qonur. Heç kim onları qovmur. Şeir qurtarhaqurtarda hava sakitləşir, bülbüllər də uçub gedir.



*Soldan sağa: Ağa Ramazan, Rəsul İlməddinoğlu, Asim Yekələr, Vaqif Aslan. Şəki, 02 avqust 2010-cu il*

Vaqif Aslanın seirlərini oxuduqca o qənaətə gəlirsən ki, onun istedadı bənzərsiz istedaddır.

Arazdan keçmirik – suyu sərindir,
Kürdən adlamırıq – dibi dərindir.
Araz aşığından, Kür topuğundan
olan kişilər!

Nə qədər ucaymış boyunuz sizin,
Əsliniz, kökünüz, soyunuz, sizin,
Axıb qanımıza dolan kişilər?




Şairin “Kərbəla faciəsi”, “Ocaq”, “Qaçqın mahnısı”, “Haray” kimi onlarla şeirləri Qarabağ faciəmizi əks etdirən şeirlərdəndir. Mən köçkün soydaşlarımızın onun “Şəhid köynəyi” şeirini necə əzbərdən dediklərinin şahidi olmuşam. Vaqif Aslan poeziyası səmimiyyət poeziyasıdır. şairi Bəxtiyar Vahabzadə “Məzarçı ilə söhbət”şeirini “Qələminə və insanlığına dərin hörmət bəslədiyi” Vaqif Aslana – “Qəbirqazan” şeirinin müəllifinə (Bax. Bəxtiyar Vahabzadə. Bir ömür yuxu. Səh.149-152. Azərbaycan nəşriyyatı, Bakı-1998) ünvanlamışdır. Qeyd edim ki Bəxtiyar Vahabzadə Vaqif Aslanın “Ruhlarla söhbət” poemasını da türk dünyasının layiqli sənət əsəri kimi qiymətləndirmişdir.

“Ruhlarla söhbət” poeması, məncə, Vaqif Aslanın şah əsəri, Çingiz Nağıyevin sözləri ilə desək, türklərin zəfər himnidir:

Günəşi bayraqtək sancmışıq göyə!
Türkoğlu bir dikəl,ona dur yiyə!
Ruhu əcdadının şad olsun deyə
Titrə,özünə dön,millətim mənim!

*Şəki, avqust 2020*

## Salaməleyk, daim oyaq və narahat türk ruhlu, Vaqif Aslan!

Azərbaycanın müxtəlif bölgələrində yaşayan və yaradıcılıqla məşğul olan bir sıra söz yaradıcıları, şairləri, yazıçıları vardır. Onlardan biri də Şəki elindən olan Vaqif Aslandır. Vaqif Aslan Şəkidə dünyaya gəlib və yaradıcılığını məhz həmin şəhərdə qurub. Şair-publisist, araşdırmaçı və tərcümələr müəllifi, hazırda Azərbaycan

Yazıçılar Birliyinin (AYB) Şəki bölməsinin sədri olan V.Aslanın bu il 65 illik yubileyi tamam olur. Bu münasibətlə filologiya elmləri doktoru Yeganə İsmayılovanın Vaqif Aslanın yaradıcılığındakı Dədə Qorqud motivlərindən bəhs edən həmin yazısını təqdim edirik:



**Yeganə İsmayılova,**
*filologiya elmləri doktoru*

"Kitabi Dədə Qorqud" dastanlarındakı yüksək bədii sənətkarlıq, onun estetik xüsusiyyətləri daha çox şair və yazıçılarımıza ilham vermiş, onlar öz ulu əcdadlarının yaratdıqları bu abidədən zaman-zaman ilhamlanaraq böyük milli qürur hissi ilə onun təsiri altında yazıb-yaratmışlar. Sözümə tədqiqatçı G.Əliyevadan gətirdiyim sitatla başladım. Yenə də hörmətli tədqiqatçının fikirləri ilə davam etmək istəyirəm. Xüsusən, 70-90-cı illərdə Azərbaycanda vətənpərvərlik və azadlıq duyğularının geniş vüsət aldığı dövrdə "Dədə Qorqud" dastanları şairlərə daha çox ilham vermiş, onun motiv və obrazlarından, sənətkarlıq xüsusiyyətlərindən, poetik keyfiyyətlərindən istifadəyə meyl artmışdır. Bu dövr poeziyasını araşdırarkən dastanların mətnindən və motivlərindən bir neçə aspektdə istifadə edilməsinin şahidi oluruq: Qorqud atanın sözünə, ruhuna bir xilaskar, müdrik bir məsləhətçi, bir öndər kimi müraciət edilməsi. Bu müraciət çox vaxt imperiyanın yumruğu altında əzilməkdə, ümidini itirməkdə olan şairlərə bir növ ümid verir, onların arxasızlıq, köməksizlik hissini aradan qaldırır, mübarizəyə ruhlandırır, bu mübarizədə qələbə əldə ediləcəyinə inandırır.

Şair Vaqif Aslanın şeirlərində Dədə Qorqudun milli yaddaşla bağlılığı, bu yaddaşın başlanğıcı və əsas atributu kimi tərənnüm olunması bu obrazın arxaik mifoloji düşüncədəki semantikası ilə tam təsdiq olunur.

Müasir poeziyamızda "Kitabi Dədə Qorqud" motivlərindən istifadə ənənəsi dövrün ab-havasına uyğun olmuşdur. "Dədə Qorqud" ruhu Azərbaycan ədəbiyyatını heç vaxt tərk etməmişdir.

Poeziyamızda “Dədə Qorqud” motivlərindən istifadə kiçik janrlardan (şeirlərdən) monumental janrlara (poemalara) doğru istiqamət götürmüşdür. Bu cəhətdən B.Vahabzadə, N.Xəzri, B.Səhənd, Z.Yaqub, V.Aslan, A.Abdullazadə və b. şairlər “Dədə Qorqud” ruhunda poemalar da yazmışlar.

Əlbəttə bu, folklor və ədəbiyyat məsələsidir. “Kitabi Dədə Qorqud”un hər hansı şairin, yazıçının yaradıcılığına təsiri məsələsi tarixi poetikanın inkişafının folklor və ədəbiyyat mərhələlərinin qarşılıqlı münasibətləri ilə əlaqədardır və müasir Azərbaycan poeziyasında “Dədə Qorqud” motivləri şair Vaqif Aslanın yaradıcılığında mühüm yer tutur. Əslində, V.Aslan “Dədə Qorqud” poetik cazibəsindən bir növ ayrı düşə bilmir, sənətkarın poetik ilhamı hansı mövzulara üz tutursa tutsun, zamanla yenə də “Dədə Qorqud” dünyasına qayıdır. Bəlkə, məhz buna görə də tədqiqatçı R.Orsər onu “Dədə Qorquddan qor alıb qutlanan şair” adlandıraraq yazır: “Qədim Oğuz elində – Şəkidə doğulub, boya başa çatmağındandır ki, Vaqif Aslan şeirlərinə qordan istilik və işıq, qutdan isə qutlu sübh şəfəqləri hopmuşdur”; ...“Vaqif Aslanın misralarına oğuz ruhunun təmizliyi hopmuşdur. Bu ruh həmişə onu izləyir, bəd nəzərlərdən qoruyur...”

V.Aslanın Dədə Qorqud “havasına” yazdığı şeirlər, əsasən, onun “Oğuz elinə salam” adlı kitabında bir yerə toplanmışdır. Kitab iki hissədən ibarətdir. “Salaməleyk say bəylər” və “Banu Çiçək eşqinə”. Birinci hissədəki şeirlər oğuz dastanının motivlərini özündə əks etdirir. Bir çox şeirlər birbaşa oğuz eposu personajlarının adını özündə daşıyır: “Qanlı Qoca”, “Dəli Domrul”, “Qazan xanın yuxusu”, “Dəli Ozan”, “Təpəgöz”, “Aruz Qoca”, “Dirsə xan” və s.

Birinci hissənin və ümumən kitabın ilk əsəri olan “Oğuz bəyləri və xatunlarına Vaqif Aslan salamı” şeirində, əslində, kitabdakı “Dədə Qorqud” motivləri əsasında yazılmış şeirlərin ümumi ruhu ifadə olunmuşdur. Hər bəndi 7 misradan ibarət olmaqla 12 bənddən ibarət olan bu şeirin hər bir bəndi (7 ci misra) “Ruhunuz qarşısında baş əyir Vaqif Aslan” rədif misrası ilə tamamlanır. Bu şeirlə sənətkar Oğuz elinə salam verir, ona hörmət və məhəbbətini izhar edib

müqəddəs oğuz ruhları dünyasına girməyə, onları müasir düşüncəmizə gətirməyə, tərənnüm etməyə icazə istəyir:

Salam, ağ ban evləri qızılı tağlı bəylər!
Qızıl dirəkli bəylər, qızıl otaqlı bəylər!
Toyu ortaqlı bəylər, yası ortaqlı bəylər!
Çoxu ortaqlı bəylər, azı ortaqlı bəylər!
Keçərək neçə qışdan, keçərək neçə yazdan
Ruhunuz qarşısında baş əyir Vaqif Aslan

Göründüyü kimi, şeir bütün poetik varlığı ilə "Dədə Qorqud" şeirinin "havasına" – poetik deyiminə köklənmişdir. Poetik ritm vahidlərinin misralar arasında və misralar daxilində təkrarlanması V.Aslanın oğuz şeirinin ruhunu duyduğunu bariz şəkildə göstərir. Şeirin "oğuz" melodikası insanı elə sehrləyir ki, bəzən müasir şairin şeirini oxuduğunu unudursan: sanki bunlar V.Aslan yox, naməlum bir oğuz ozanının şeiridir.

Şeirdə oğuz dünyası bir bütöv olaraq görünür. Sənətkar pillə-pillə baxış nöqtələrini dəyişir: gözümüzün önündə oğuz dünyasının əlvan mənzərələri canlanır. Mənzərə nə qədər zəngin olursa olsun, oğuz dünyasının şeirdəki nizamı pozulmur: poetik elementlərin düzümü oğuz dünyasının ilahi sahmanını özündə əks etdirir. V.Aslan "deyimi" şeirin əvvəlindən sonuna qədər oğuz "deyiminin" poetikasına köklənir. Şeir "oğuznamə" poetikasına uyğun olaraq müqəddəs dəyərlərin daşıyıcısının – Dədə Qorqudun tərənnümü ilə bitir:

Bəxti açılan saatda, ruhun gələn günündə...
Adı görklü ərlərin toyunda, düyünündə...
Dədəm Qorqud nidası, Dədəm Qorqud ünündə,

Müasir poeziyamızda "Kitabi Dədə Qorqud" motivlərindən istifadə ənənəsi dövrün ab-havasına uyğun olmuşdur. "Dədə Qorqud" ruhu Azərbaycan ədəbiyyatını heç vaxt tərk etməmişdir.

Məhəmməd Mustafanın üzü suyu yönündə
Amin! Səcdəyə gəldim ağ alnınız önündə!

Göy-qara bağlayanlar çıxsınlar daha yasdan
Ruhunuz qarşısında baş əyir Vaqif Aslan

Maraqlıdır ki, şeirin sonuncu bəndində Dədə Qorquda müraciət edilməsi ilə "Kitabi Dədə Qorqud" boylarının sonunda Dədə Qorqudun gəlib yum verməsi arasındakı əlaqə formal səciyyə daşımır. Burada ilk baxışdan görünməyən dərin forma-məzmun bağlılığı var. Eposun boylarının sonunda Dədə Qorqud gəlib "oğuznamə" qoşur. V.Aslan da "Oğuz elinə salam" kitabının ilk şeiri ilə oğuz bəyləri və xatunlarına salam verdikdən sonra oğuz igidləri və xanımlarının şərəfinə şeir oğuznamələr qoşmuş, onları öz mənəvi "ustadı" Dədə Qorqud kimi tərənnüm etmişdir.

V.Aslanın yaradıcılığında "Kitabi Dədə Qorqud" a müraciət bütün hallarda milli-mənəvi dəyərlərlə bağlıdır, şair eposa bu dəyərlərin qaynağı kimi müraciət etmişdir. Eposdan milli-mənəvi, milli-əxlaqi keyfiyyətlər – ədalət, humanizm, gözəlliyin tərənnümü, ana müqəddəsliyi, vətənpərvərlik, doğruçuluq, əxlaqi saflıq, etibar kimi bəşəri problemlərlə şairin yaradıcılığında qarşılaşırıq. Özünü bir milli şəxsiyyət kimi axtaran, milli özünütəsdiq ideyaları ilə yaşayanlar bu ali duyğuları "Dədə Qorqud" dastanlarında tapırlar. Məhz buna görə Vaqif Aslanın dastanın obraz və ideyalarından istifadəsinin kökündə məhz milli ideyalar, milli özünütəsdiq idealları durur. Çünki, Vaqif Aslan "ədəbi vicdan" ölçüsü ilə, "meyar-şəxsiyyətdir" formulası ilə ruhu daim oyaq, həssas bir qələm sahibidir. Onun şeirlərində əqli idrakla hissi idrak vəhdət təşkil edir. Fəlsəfi ideyalarla, duyğularla dolu olan Vaqif Aslan şeirlərində əsl narahat türk ruhu daim oxucunu izləyir.

***Mənbə: Lent.az***
***URL: http://kulis.lent.az/news/13971***
***Dr.Prof.Yeganə İsmaılova . Nurlan Ağa***
***2 Aralıq 2015 10:06 tarihinde Murad Nabibekov tarafından yayınlandı***
***Bax. Yeganə İsmayılova. "Dədə Qorqud kitabı" və müasir Azərbaycan ədəbi düşüncəsi. Bakı-«Elm»-2011.Səh.158-161.***

## I
## Gözəlim

Səsi mobil telefondan
qırıq-qırıq gələnim.Ox
“Ox” deyincə
“ox”u oxa
dönüb mənim
ürəyimi dələnim.
Şalvarının dizi yırtıq
budu yırtıq gözəlim.
Əyni-başı didik-didk,
qırım-qırtıq gözəlim.

Yubkan-koftan arasında
bufer zona qoymusan.
Elə bil ki, yumurtanı
sərhəd boyu soymusan.

Özü ilə olanları
gözü ilə görənim.
Qaranlıqda qaraşınım!
Samanlıqda sarışının!
Ağım, ağcam,
kürənim!

Qulağını, boğazını
şunur ilə hörənim!
Facebook-dan çıxan kimi
whatsAppa girənim!

Görməmişlər səni görüb
İrişərlər, nə olsun?
Ərk eləyib

sağdan-soldan
girişdilər, nə olsun?
Tanışırlar,..
bilişirlər, nə olsun?
Axır gəlib
qoltuğunda
ilişirlər, nə olsun?

Ərkək-dişi döyüşündə
ad alarsan, gözəlim..
Dad verirsən,
dad alıasan, gözəlim.

*27-29 iyul 2016-cı il*

## II
## Həvva və hava

Nə Həvvadan başım çıxdı, nə də havadan...
Arada qaldım.
Göz açmağa vaxt oldumu dərddən, dəvadan?
Nə biləydim haradaydım, harada qaldım.

Yağma dedim, acığıma yağdı yağışlar.
Selə dönüb, suya dönüb axdı yağışlar.

Dedim: – Həvva, havaya bax, keçib yüz əldən.
Dedi: – Bircə sən qalmışdın hava düzəldən.

Dedim: – Həvva, bəs sən necə, nə düşünürsən?
Dedi: – Şair, get bürütlən, çox üşünürsən!

*11 avqust 2018-ci il*

**III**

**A madam!**

A madam!
Yağlı badam!

O saraydır,
bu da- dam.
Deşilibdir tavanı...
Dama-damdır,
dama-dam.

A madam!
Yağlı badam!
Tov deyil olmasa tam.
Bu tabaqdır,
bu da-cam.
Çömçəsi çömçələnib...
Nimçəsi nimçələnib...
Qarışıb ustaya xam.

A madam!
Yağlı badam!
Mən kiməm?
– Bir yad adam.
Gecədir... Yol azaram...
Əriyibdir deyəsən
İstidən səndəki şam.

*11 avqust 2018-ci il*

## IV
## Telefon aşiqlərinə

Ay səni sağ olmuş, hanı bəs başın?
Necə inanaq ki, itirməmisən?

Qopub yerə düşüb kipriyin, qaşın...
Əyilib asfaltdan götürməmisən.

Yəqin boş şey imiş itirdiklərin...
İtirib, köksünü ötürməmisən.

Nə adın bilinir, nə də ki, yaşın!
Çünki kimliyini gətirməmisən.

Yapışıb qalmısan telefonundan.
Özünü mənzilə yetirməmisən.

Möhkəm tut, telefon əlindən düşər!
Hələ söhbətini bitirməmisən.

*02 aprel 2017-ci il*

## V
## Pişiyin dəcəldir, xanım

Pişiyin dəcəldir, xanım.
İncimə, sən mənim canım.

Görən kimi qaça-qaça
Pişiyin çıxır ağaca.

Hoppanıb dırmaşır, çıxır.
Sarılb sarmaşır, çıxır.

Düşürmək olmur, ay xanım.
İncimə, sən mənim canım.

Sən də onun axşam-səhər
Əriyini əzdirirsən.

Gah ovcunda saxlayırsan...
Gah əlində gəzdirirsən..

Dırnağını qaşov edıb
Asta-asta qaşıyırsan.

Dincəltdirib pişiyini
Sakitləşib yaşayırsan

Görüb o da tumar, sığal.
Olub özün kimi cığal.

Pişiyin dəcəldir, xanım.
İncimə, sən mənim canım.

*26 fevral 2021-ci il*

## VI
## Köhnə hamam...

– O zaman necə idi?
– Gündüzdü, gecə idi...
Hamı oyun oynayan,
Hesab heç-heçə idi.
Üzlərdə it dərisi,
Başlarda keçə idi.

*22 sentyabr 2013-cü il*

## VII
## Quşu tutarlar quş ilə...

Quşu quşa qonan gözəl!
Quşun yaxşı oxuyurmu?
Səninkidir bu göz, bu əl...
Yan-yörən gül qoxuyurmu?

Quşu quşla tutan kəslər
Quş tutmaqçün quşu bəslər.
Bəs quş quşu necə səslər?
Quş quşa tor toxuyurmu?
Torunu zor toxuyurmu?

Onun quşu buna qonur...
Bunun quşu ona qonur.
Ha qovurlar, uçub getsin...
Dövrə vurub yenə qonur.

Sən dünyanın işinə bax!
Quşlara da quş qoyulur.
Quş qoyulan quşlar ki, var
Bir-birinə tuş qoyulur.

Deyirlər ki, ətyeyən quş
Dimdiyindən bəlli olur.
Ağzında diş olmasa da,
Məsələnin həlli olur.

*27 yanvar 2020-ci il*

## VIII
## Əhvalpürsanlıq

*20 oktyabr 2013-cü il tarixə geçən gecədə yuxumda qab-qacaq yuya-yuya ləhcə ilə danışan iki qadın gördüm Onlardan biri sual edir, digəri cavab verirdi:*

– Bu gecə nə olacaq?
– Happıltı, guppultu.
Lappıltu, luppultu.
Şikayət nə vaxadır?
– Şikayət savaxadır.

*20 oktyabr 2013-cü il*

## IX
## Ariflərdən eşitdim

Ariflərdən eşitdim:
– Yardan şikayət olmaz.
Yar yanında sevgidən
Ayrı hekayət olmaz.

*17 yanvar 2015-ci il*

## X
## Adam var ...

Adam var – mir adamdır
Adam var – pir adamdır.
Adam var – çör-çöp kimi,
Adam var – tir adamdır.
Adam var – boynu yoğun...
Adam var – cır adamdır.
Adam var – əlim səndə...

Adam var – kür adamdır.
Adam var – hamı ilə
Dost adam, cür adamdır.
Adam var – şərə-şürə.
Şər adam, şür adamdır.
Adam var – alimanə.
Adam var – zır adamdır.
Adam var – pambıq sayaq,
Adam var – qır adamdır.
Adam var – açıq-saçıq...
Adam var – sirr adamdır.
Adam var – tülkü, çaqqal...
Adam var – şir adamdır.
Hər Adam bir adamdır.

*25 dekabr 2017-ci il*

## XI
## Qaravəlli

Hər şey zaman içində .
Yaxşı yaman içində.

Xəstə ümid etmədə
Həkim güman içində.

Yollar toz-tozanaqda ...
Dağlar duman içində.

Samanlıq kənddə qaldı,
Xəlbir saman içində.

Hoteldə də hamam var...
Moteldə də hamam var...

Hamam hamam içində.
Nə var – tamam içində.

Dişi tumansız gəzir...
Ərkək tuman içində.
Hər şey zaman içində ...

Hər yerdə dəlləkxana
Qırxmağa baş tapılmır.

Ülgüclər korşalıbdır ...
Sürtməyə daş tapılmır.

Sönmədədir ocaqlar ...
Quru var, yaş tapılmır.

Lupayla axtarırsan ...
Göz üstə qaş tapılmır ...

*17 oktyabr 2016-cı il*

**XII**
## Ey payız!

Yazdan köçüb gəlirəm.
Yaydan keçib gəlirəm...
Yol ver mənə, ey payız!
Ehey, payız, hey, payız!

*24 sentyabr 2020-ci il*

# Barat VÜSAL
## Şaman andı və ya
## YAXUD ZİRVƏDƏ ÇIXAN YORĞUNLUQ...



Ədəbiyyata nəfəs vermək lazımdır, ədəbiyyatın nəfəsini kəsirlər.

Vaqif Aslan ədəbiyyatımıza nəfəs verən şairlərimizdəndir.

Vaqif Aslana görə Nuh Tufanından da qorxulu bir tufan başlayıb: Ruh tufanı!

Bu fəlakətdən qurtulmaq olacaqmı?!

Özü də tərs kimi...

Ata-Adəm, ana – Həvva, əcəbövladdır, adamlar,
Nə səbəbdən görəsən, bir-birinə yaddır adamlar!

Tarixi o adam bilmir ki, baş verən hadisələri xronoloji ardıcıllıqla ən azından sadalaya, yadda saxlaya bilir.

Tarixi o adam bilir ki, Ruhun tarixindən xəbəri var. "Yer yox ikən, göy yox ikən mən əzəldən var idim" (Xətai) deyə bilir.

Yaradıldım ruh kimi,
Adəmlə həmyaş oldum.

söyləyən Vaqif Aslan da bu sözləri Yunis İmrələrin, Nəsimi və Füzulilərin dizinin dibini kəsdirərək deyir.

... Bir sözünün də dalından qaçan görməmişəm onu. Hər dediyi sözə, yazdığı kəlməyə cavabdeh görmüşəm. O, dediyi hər Sözün dalında durub, ona arxa söykəyib, arxa olub. Hər sözə, hər şeyə cavabdeh olan bu şairi "dəliliyi" tutanda eşqi "topuğuna vuranda" görəsən allah! Məhəbbətin dadını, duzunu çıxardanda görəsən:

Nə olar ki, ayda, ildə bircə yol
Görüm səni xalangilə gedəsən.
Açıq-aşkar qansızlığa qoyub qol,
Haqq-nahaqdan bildiyini edəsən,
Görüm səni xalangilə gedəsən!

Bu qədər qımışa-qımışa könül sevgisinə gizlicə məharətlə, sənətkarlıqla eyham vuran şair, fikri-zikri qarışa-qarışa ciddi görkəm alır, əsl insana xas olan istəyi ortaya qoyur:

Gülzar istəyirəm, çiçəklərinə
Xəzan küləkləri dəyməmiş olsun.
İnsan istəyirəm, xəcalətindən
Başını heç yerdə əyməmiş olsun!

Vaqifin müqəddəs arzu-istəklərindən biri göz qabağında!

Vaqifin dediyi insan da qarşımızdadır. Elə bu, onun özüdür ki!

Şairin aşağıda misal çəkəcəyim misraları da öz şəkli, öz əksi deyilmi?!

Azıxda ilk dəfə çatılmış ocaq,
Sənin gözlərində şölə verir, bax!

Hərənin bir niyyəti olur. Şəhriyarın adına niyyət edib, yola çıxıb!

Bu niyyətin şairi haraya qədər aparacağını (aparmayacağını!) yaxşı bildiyi üçün böyük tənqidçi, türkoloq alim Aydın Məmmədov

1976-cı ildə Vaqifin şeirləri ilə tanış olan kimi gələcək şairi tanımışdı, çəkinmədən, cəsarətlə demişdi: „Qələm dostumuz Vaqif Aslan... Böyük ümid verir... Addımları uğurludur... Belə başlanğıc isə Pifaqor demişkən, bütövün yarısına bərabərdir".

Bir gün (elə lap bu gün!), tam olmağa, bütövləşməyə dəyərdi. Aydın Məmmədovun peyğəmbərcəsinə verdiyi qiymətdən sonra.

Ona görə də kökünü andı, südünü yada saldı. Dedi:

Ey mənə əzəldən dil verən anam,
Mənə Qobustanın dilini öyrət!

Hiss etdi ki, onu da şair etsə, anası edəcəkdi. Şəhriyarın anası kimi!

Onu bütövləşdirə bilsə, Qobustanın dili bütövləşdirə bilərdi.

Vətənin, insanın, dünyanın başına gələn bəlaları bu dil öyrədəcəkdi ona. Qobustan əlifbasını öyrədəcəkdi. İlk müəllimi bu əlifba oldu – Qobustan əlifbası! Özünə borc bildi ki, bu əlifbanı öyrənsin, duysun, desin:

Bilim, o, yurdumun şərəfi, şanı,
Bilim, o, yurdumun dərdi, yasıdır.
Oxuyum – Qobustan Azərbaycanın
Danışan imzası, əlifbasıdır.

And içdi qələmə! Dərdlərimizi araşdırmağa! Həm ədəbiyyat naminə yazdı, yaratdı, həm də tarix naminə!

Qılıncına söykəndi. Koroğlunun, Şah İsmayılın, Alp Arslanın... qılıncına!

Çoxdandı düşmən başı kəsmədiyi üçün qana batmış qılıncına belə dedi:

Matəm paltarını bu gün soyun, çıx,
Sinəmin qanıyla silim pasını.
Göynəyən əlimlə bir zərbə çalım,
Doğra, tök, Vətənin qəm libasını!

V.Aslan öz səsi və öz nəğməsi (özü-səsi, sözü-nəğmə!) olan şairdir. Bilir ki, bu fani, yalançı dünyadan "Biz gedərkən – səs əbədi, səsi olan kəs-əbədi"dir.

Vaqif şeir yazdıqca, şair olduqca dili cilalanan, açılan şairdir, doğru deyir ki: "Mən şeir yazanda – dilim açılır. Başqa cür dinəndə dilim dolaşır, başqa cür dinəndə kəkələyirəm..."

"Dünyaya zirvədən baxmışam bu gün" deyir şair və əslində, şairlik həmin yerdən, həmin zirvədən heç kimin əli çatmayan yerdən başlayır.

Ordasansa, canında nə yorğunluq varsa da çıxacaq. "Zirvədə yorğunluq çıxırmış bütün..." Özün də, sözün də dincəlirsən (və siz də gəlib bu zirvədə istəsəniz, dincələ bilərsəniz, daha...)

Vaqifin qələmi özü kimi çox dərd içindədir, çox. Torpaqlarımız uğrunda çarpışan döyüşçüdür, tarixi təzədən olduğu kimi yazmaq istəyən tarixçidir. Yazdıqlarının çoxusu hələ də qan qoxuyur, qan! Necə oxuyasan bu yazıları ki:

Qurumuş mürəkkəb, sanıq qələmlə,
Qırılmış qol ilə yazılıb yazım.

"Şəhid köynəyi" şeiri M.Cəlalın "Bir gəncin manifesti" romanında Sona anamızın fəryadı, iniltisiylə doludur. Xalçanı ingilis almaq istəyəndə o, "itə ataram, yada satmaram!" dediyi kimi, bu şeirdə şair qeyd edir ki, bazarda nə varsa, məsələn:

Satılmayan namus, həya,
Satlıq qoyun, mal qurtarıb.
Şor quruyub, yağ tükənib,
Bal qurtarıb.
Bircə şəhid köynəyi var!

Və şair eyni öz anası (anamız) Sona kimi hərəkət edir. Bu köynəyi ölsəniz də, satlıq etməyə razı olmaram. O, mənim, sənin, onun (əslində Vətənin) köynəyidir.

V.Aslan qələmini öz qanına batırıb yazan şairdir. “Dəftər-qələm yanımda, Qanım – qələmdanımda” deyərək yazır şeirlərini... Və həmişə də qədim filosoflar, müdriklər kimi indiki və gələcək nəsillərə öyüd verəcək, deyəcək:

Kəsirəm, demə
Ağacın eşidər, bar verməz.
Sökürəm, demə,
Evin eşidər, soyuyar.

V.Aslanı oxuyanda adam tariximizi daha yaxşı öyrənir, fəlsəfənin təzə qatlarına baş vura bilir.

V.Aslan birmənalı şəkildə mütəfəkkir şairdir. O, həm yurdumuzun, həm də ruhumuzun bütöv ərazisidir. Türk oğlu türkdür. Araz bir qoludur, Kür bir qoludur. Onun söz səngərinə yatmış əsgər kimi daima zəfər, qələbə gözləyir. Yalnız şair deyil, alimdir, filosofdur, dramaturqdur, tədqiqatçı-araşdırıcıdır.

Azıx mağarasında doğulub
Qobustandan indicə gəlib...

Tur Heyerdal qamış gəmisində Atlantik okeanını keçərkən o da orda olub.

Şəki xanı Hüseyn xan Müştaqla bir dövrdə yaşayıb. Onun dostları Vaqif və Vidadi ilə oturub-durub! Qobustan qayasıdı sinəsi. Çəkdiyi şeir şəkilləridir, şəkil-şeirləridir.

Bu adam danışanda da, şeir yazanda da hayqırır! Yalnız şəkili, bakılı, qazaxlı deyil, orxunludur!

Yeniseylidir!
Ötügenlidir!

Metenin (Oğuz xanın) silahdaşıdır. Az qala inanmaq istəyirsən ki, Əhməd Yəsəvi kimi Durna cildinə, Hacı Bektaş Vəli kimi göyərçin donuna, Misgin Abdal kimi maral qiyafəsinə girə bilər...

Şamanlar kimi düz olmağa, düz yaşamağa and içib! Şəkidə yaşamağına baxmayaraq!

Dünyanın hər yerində dünyada olmamışdan var!
Ruh şəklində!
Eşq şəklində!
Nəsimi babası kimi bəşər şəklində!
Elə bir bütöv məmləkətdir ki, onu hələ bölə bilməyiblər!
Vaqif Aslan qədim kişilərdəndir!

Özü dediyi kimi: "Cumay ocağındandır. Bu ocaq Kiş kəndinin tatar uşağı deyilən məhəlləsindədir. Hələ də ocaq hesab edilən zoğal ağacının altında ocaq yandırırlar... ... Tur Heyerdalın nitqində bizim 5000 il əvvəlki genlərlə bağlı doğulmağımızdan söhbət gedir. Əslində, Adəmlə Həvva hansı genlərlə doğulmuşdursa,elə biz də həmin o genlərlə bağlı doğuluruq. Bu mənada mən özümü Kiş ilə (açığı desəm, Azərbaycanımla) həmyaşıd hesab edirəm...

Fəlakətlər olmasın deyə maq paltarı geyirəm, diyarbadiyar gəzirəm, insanları insanlığa çağırıram".

Bu yaxınlarda Vaqif Aslanın yeni bir kitabı çıxıb: "Türk xalqları ədəbiyyatı üzrə mühazirələr". Mühazirələr fransız şərqşünası Alber Şoreldən götürülmüş bu epiqrafla başlayır: "Yer üzərində iki şey hələ də kəşf edilməmiş qalır: coğrafiyada qütblər və tarixdə türklər".

V.Aslanın bütün yazdıqlarında bu epiqrafda ifadə olunmuş məqsəd-məramın çox aydın izləri, bəlirtiləri var. O da həmin sevgiylə, proqramla bütün əsərlərində və əslində, elə bil ki, həmin qütbləri və türkləri araşdırır. Niyə də araşdırmasın? Bir halda ki, Amerikanın qızıldərili hüquqşunası Cek Rasinq təsdiq edib ki, "çox ehtimal, biz buraya 50 min il əvvəl indiki Azərbaycan ərazisindən köçüb gəlmişik. Özü də bəlkə elə Qobustandan?!"

Azərbaycanda Qazax rayonunda "Avey dağı" var. Araşdırdıqca məlum olur ki, hunlar qələbə çalanda "urra! urra!" deyirmiş kimi "Avva! Avva!" deyirmişlər. Meksikada bir dağın adı Aveydir. İndiki İraqda türkmənlər yaşayan yerdə də.

Aman allah, sən demə, Turi-sina, Tur dağının bir adı da Avaymış! Maraqlıdır, deyilmi?!

Ən maraqlısı budur ki, bu adın da ilkin vətəni Azərbaycandır. Demək, hindu hüquqşunas düz deyirmiş...

Füzuli deyirdi ki, mən şeir ha yazmıram, əslində, özümü və əslimi - nəslimi tədqiq edirəm.

Hüseyn Arif yazırdı ki, gecə də, gündüz də fikrim, niyyətim əslimi, nəslimi öyrənmək oldu.

Vaqif Aslan da bu yolla gedib və gedir.

Çox yaxşı da edir!

Xüsusən də yazanda ki, "Misir piramidalarındakı yazılar qədim türk əlifbasıdır". Biləndə ki, "Türk sözünü ilk dəfə rəsmi dövlət adı kimi Göytürk imperatorluğu quranlar işlətmişlər". 552-ci ildə!

"1930-cu ilin əvvəlində əməkli general Təhsim bəy Türkiyənin Meksikadakı atteşesi təyin edilir. Onda o, Mustafa Kamal Atatürkə göndərdiyi raportların birində "Haiti adasında yerlilərin dilində işlədilən "Turan" sözünə xüsusi diqqət yetirdiyini, yerli əhalinin dediyinə görə, "göyə mənsub millət demək olduğunu göstərir".

V.Aslanın təzə kitabında ən maraqlı mühazirələrdən biri "İslama qədərki türk mifik düşüncə tərzi və inancları" adlanır. "Şamançılıq" bölümündə tədqiqatçı şair qeyd edir:

"Şamanlıq irsi sayılır. Onlar dürüst insanlar olub, pislik etməzlər. Onlar zavallıların qoruyucusu, yoxsulların babası, öksüzlərin anası olmağa "and içərlər".

Vaqif Aslan da şamandır, şaman ruhludur. O da and içib.

Şamanlar və şaman kimi!

Onun bütün fikri-zikri millətimizlə, mədəniyyətimizlə, ədəbiyyatımızla, tariximizlə – bağlı ən həssas nöqtələrin nəbzi üstündədir.

O nəbz bir az düzgün vurmayanda, zəifləyəndə sən onda V.Aslanın qələminin harayına, fəryadına bax!

V.Aslanın yaradıcılığında tərcümələr də mühüm yer tutur. Fransız dilindən tərcümə edilmiş bu əsərlər sırasında Yan Şardən və və onun "Səyahətnamə"sinin tarixilik baxımından əhəmiyyəti danılmazdır.

Bədii tərcümələr içərisində Pol Verlen, Ojen Dabi, Erve Bazendən, eləcə də Mustay Kərim və Slavomir Mrojekdən etdiyi bədii tərcümələr də aydın və səlist dili ilə diqqəti cəlb edir.

Kim ki, əldə yaba, ot yığmalıydı,
Professor olub kağız korlayır.

Bu misralar V.Aslanın "Aydın" poemasındandır. Heyf Aydın Məmmədovdan!

Ölüm onu bizdən uzaq salmaq istədi. Çünki bildi ki: Aydına yaxın olsaq, xalqa yaxın olarıq! V.Aslanın "Ruhlarla söhbət" poeması həm Azərbaycanın (həm də dünyanın) qədim və müasir tarixinin poetik ensiklopedyasıdır.

Poemada belə bir düşündürücü misra da yer alıb: "Daşı qaval kimi çalır baxsana". Müəllif bu misraya şərh olaraq əlavə edib: "Mən xoşbəxt adamam. Qaval daşını öz əllərimlə çalmışam. O səs mənə çox şey demişdir". Vaqif Aslana görə ilk ocağı kişlilər, kasərlər çatıb.

Kasər boyu boy atıbdır
Göyə qədər.
Kasər boylum,
Azər boylum,
Məkan nədir? - Kasər ruhu
yaşayan can...

Bir rus generalının gerçəkliyi çox doğru-düzgün əks etdirən bir fikiri var: "Türklərə qalib gəlmək üçün onların tarixini məhv etmək lazımdır".

Vaqif Aslan kimi şairlər nəinki Azərbaycan Türk ədəbiyyatını durmadan inkişaf etdirirlər, onlar həm də tarixi və tariximizi ölməyə qoymurlar!

Vaqif Aslanın son illərdə qazandığı ən böyük ədəbi uğurlarından biri "Hüseyn xan Müştaq" dramıdır. Əsərə yazdığı ön

sözdə tarix elmləri doktoru, professor Kərim Şükürovun aşağıdakı fikri, məncə, həmin əsərin mahiyyətini daha düzgün əks etdirir: “Bu əsərdə dilin poetizmi ilə düşüncənin akademizmi birləşmişdir”.

Həmin mühazirənin “Türkülər” bölümündə manilərdən, türkülərdən söhbət açılır. “Sev məni” türküsü belədir:

Sev məni, ay sev məni!
Faytona mindir məni.
Apar eşqin bağına,
Doyunca dindir məni!

Bu türkünün sən demə, ilk variantı bu cürmüş... Görün sonralar erməni və erməniпərəstlər onu dəyişib nə hala salıblarmış və necə oxuyurlarmış, necə qanımıza yeridir, genimizi dəyişmək istəyirlərmiş:

Erməni ay erməni,
Faytona mindir məni!
Apar sərdar bağına,
Doyunca gəzdir məni!

Müəllif yazır ki, Makedoniyalı İsgəndər türkü tanıyıbmış. Qarşısına çıxan 24 kişini görəndə “Türk manənd” (“türkə bənzəyir”) demişdir.

Vaqif Aslan tarixi yaxşı bilən bir araşdırıcı olduğunu bu kitabıyla bir daha təsdiq edib. Türkü daha yaxından tanımağa (tanıtmağa) nail olub, türkü bacardığı qədər kəşf edib (və əslində, özü də yenidən kəşf olunub!)

... Səməd Vurğun Bakıda bağdaymış. Heydər Hüseynova bir “Zapiska” yazıb, xahiş edib ki, gələndə mənə özünlə vəd verdiyin Zərdüşt və Prometey haqda kitabları da gətir. Tarixi bilmədən təzə söz demək çətindir.

Vaqif Aslan bu həqiqəti yaxşı bildiyi üçün tarixi (tariximizi) araşdırmaqda davam edir.

Bu şairin, dramaturqun, tarixçinin, filosofun, dilçinin tədqiqatçının, publisistin, bütövlükdə mütəfəkkirin ensiklopedik şəkilli bir yaradıcılıq dünyası var.

İllərlə onun əsərlərini sevə-sevə oxumuşam. Yazmaq istəmişəm ondan. Bunu özümə mənəvi borc bilmişəm. Ha yaxınlaşmaq istəmişəm. Aşağılara boylanmışam ki, bəlkə oralarda gözümə dəyə, görüşəm. "Xoş gördük böyük şair" deyə! Lakin onu həmişə hündürlükdə görmüşəm, hündür görmüşəm. Hündürə də hələm-hələm adamın əlimi çatır, yönümü düşür?!

***

Şairlərində milli-mənəvi dünyamıza dərin bağlılığı, ehtiramı, hörməti, sevgisi, vurğunluğu, heyranlığı üstünlük təşkil edir.

Tədqiqatlarında, poemalarında, publisistik əsərlərində tarixə (tariximizə!) Oljas Süleymanov həngi baş vurmağı diqqəti dərhal çəkir, onu oxuduqca adamın qəlbində qürur hissi oyanır.Əyalətdə yaşayasan, di gəl ki, şəhər sivilizasiyasının nail olduğu sənət uğurlarının, ondan da hündür görünən sənətkar, mütəfəkkir təfəkkürünün daşıyıcısı olduğunu görəsən, heyrətlənməyə bilməyəsən?

Mif deyirsən mifdən danışsın, Xalq yaradıcılığı deyirsən, az qala bütün janrlardan danışmağa biliyi, yüksək elmi və eridusiyasının olduğunu etiraf etməyə məcbur olasan...

Bu qədər bu şairin özünün də, sözünün də hündürlüyü hardandı, hardan?

Əlbəttə, bütün ruhuyla ruhun (ruhumuzun) folklorumuzun, nağıllarımızın, rəvayətlərimizin, dastanlarımızın, mifik dünyanın (dünyamızın) içində olmağından! Oğuz Xaqan kimi!

Keçmişdə tarixi şeirlə yazırmışlar.

Elə indi də!

***

Çıtır-çıtır yanır bu adam
Sətir-sətir nəfəs dərməyi də var.

Özümüzün də, sözümüzün də oxşar cəhətləri az deyil. Bir dəfə Şəkini yaxşı görüm deyə şəhərin hündür yerlərindən oraya tamaşa etmək imkanı yaratdı mənə.

İndi sözünün ən hündür yerinə çıxmışam.
Onu hamıya yaxşı göstərmək üçün.
Onu hamı yaxşı görsün deyə.
Onun sözünün ən hündür yeri birmi-ikimi?

Biri Qobustandır – keçmişlərə, yurdumuzun qədim yerlərinə dönüb baxmaq üçün.

Biri doğulduğu Kiş kəndinin özüdür.

Ordansa şeirimizin, tariximizin, fəlsəfəmizin, dilimizin, dinimizin, milli-mənəvi dəyərlərimizin dünənini, bu gününü, sabahını apaydın şəkildə o dəqiqə görmək olar.

O hündür yerlərdən biri də Azıxdır.
Mağara olmağına baxmayın!

... Bir gün kefinin kök vaxtında Napoleona onunla yanaşı duran generallarından biri zarafatla deyir ki, imperator həzrətləri, bax mən sizdən uzunam. Balacaboylu imperator gülümsəyir:

– Sən məndən uzun ola bilərsən, amma hündür (uca) ola bilməzsən.

Vaqif Aslanın da hündürlüyü belə hündürlüklərdəndir – çox-çox özünü ondan uzun (uzunboylu) sananların yanında!.

***Bax. Barat Vüsal. Şaman andı yaxud zirvədə çıxan yorğunluq. Vaqif Aslan-70.***
***Bax. 525-ci qəzet 29 fevral 2020-ci il, şənbə № 24 (5405).Səh.18.***

## Murad Nəbibəyov
## Ədəbiyyatımızın düşünən beyni – Vaqif Aslan



*“Vaqif! Özünü qoru! Sən ədəbiyyatımızın təkcə*
*yazan əli yox, həm də düşünən beynisən”*
*professor Fərman İsmayılov*

Tanınmış, görkəmli, dahi adamlar haqqında yazmaq, onların fəaliyyətinə, dediyi sözə qiymət vermək həyatda ən çətin, ən məsuliyyətli və ən qorxulu işdir. Səbəbi də budur ki, belə insanların həyatı, məşğuliyyəti, gördükləri iş həddindən ziyadə çətin və mürəkkəb, cəmiyyətdə tutduqları mövqe isə çox yüksəkdə olur. Ona görə də onlar haqqında hər yazılan sözü, hər cümləni dəfələrlə ölçübbiçdikdən sonra qələmə almaq lazımdır ki, ictimaiyyətin qınağına tuş gəlməyəsən.

Belə insanlardan biri də haqqında söhbət açmaq istədiyim, təxəllüsünü soy adından götürmüş, müasir ədəbiyyatımızda özünəməxsus və təkrarolunmaz yeri olan şair-dramaturq, yazıçı-puplisist

VAQİF ASLANDİR. O, həm də tarixçi, folklorşünas, türkoloq olmaqla yanaşı, fransız dili mütəxəssisidir. Eyni zamanda O, gələcəyimizin qarantı olan gənc nəslin təlim-tərbiyəsində, savad almasında böyük rolu olan pedaqoqdur. İndi özünüz deyin, belə şəxsiyyət haqqında nə isə deməyə, yazmağa necə cəsarət edəsən?! Amma bu cəsarəti mənə qəhrəmanımızın bu yaxınlarda qeyd edəcəyimiz 70 illik yubileyi verdi. Yəni tam əminəm ki, yazıda səhvlərim, yerində olmayan cümlələrim, "artıq-əskik" ifadələrim olsa da, Vaqif müəllim yubileyi ərəfəsində irad tutub məni utandırmayacaq və sadəcə, qeyri-peşəkar bir jurnalistin təbriki kimi qəbul edəcəkdir. Elə bilirəm böyük tərəddüddən sonra başlamaq istədiyim məqalə-təbrikin ən çətin hissəsini bir təhər də olsa başa çatdırdım. İndi isə Azərbaycan oxucularının əksəriyyətinin tanıdığı yubilyar haqqında qısa tanışlıq: Vaqif Cumay oğlu Aslanov 1950-ci il iyulun 5-də Azərbaycanın ən qədim diyarı olan Şəkinin ən qədim və safalı kəndi olan Kişdə dünyaya göz açıb.

Orta təhsilini doğma kəndində və qonşu Oxud kəndində ana dilində başa vurduqdan sonra, nədənsə fransız dilinə meylini salıb və Azərbaycan Pedaqoji Dillər İnstitutunun "Fransız və Azərbaycan dilləri" fakültəsində ali təhsil alıb. Şeir, poema, roman, dram əsərləri çap edilmiş çoxsaylı kitabların, elmi-publisistik məqalələrin müəllifi olan Vaqif Aslan hazırda Azərbayğan Pedaqoji Universitetinin şəki filialının baş müəllimi və Azərbaycan Yazıçılar Birliyininin Şəki filialının rəhbəridir.

Var-dövlət, ad-san, şan-şöhrət ardınca heç vaxt qaçmayan, hətta tutduğu vəzifəyə görə yaşadığı və işlədiyi regionda ədəbi mühitin təmsilçiləri və ədəbiyyat sevərlərlə görüşlər keçirmək üçün bir otaq belə tələb etməyən Vaqif Aslanı tez-tez Şəkidə M.Füzulinin və B.Vahabzadənin adlarını daşıyan istirahət parklarında, Şəhidlər Xiyabanında, Xan Sarayının həyətində oxucularla, şair və yazıçılarla görüşlər keçirdiyinin şahidi oluruq. Özündən soruşanda ki, niyə görüşlər, rəsmi tədbirlər, poeziya gecələri keçirmək üçün məkanı yoxdur? – cavab verir ki, insanlarla təbiətin qoynunda görüşməkdən böyük zövq alır.




*Soldan sağa: Vaqif Aslan, Murad Nəbibəyov, dr. prof. Fərman İsmayılov*

Vaqif Aslan poeziyası VII sinifdə oxuyanda yazdığı ilk şeiri olan "Mən sizə vuruldum, a qarlı dağlar"la başlayıb, sonra isə onun qələmi "istirahət" nədi bilmədən şeirdən poemaya, poemadan pyesə, pyesdən isə tarixi romanlara qədər gedib çıxıb.

Bu gün Vaqif Aslan yaradıcılığı ilə tanış olmayan Azərbaycan ziyalısı tapmaq çətin olar...

Vaqif Aslan şair olmasının səbəbini dünyaya göz açdığı doğma kəndinin, yaşadığı Qədim Şəkinin səfalı təbiəti, əzəmətli dağları, saf insanları ilə əlaqələndirir:

Şair sənsən, şeir deyən dilin – mən,
Sərkərdəsən, qılınc vuran əlin – mən.
Gözəl sənsən, sevgilin – mən, dəlin – mən,
Bilmirsənmi, oğlun Kərəmsayaqdır,
Səndə şair olmamaq da günahdır.

Tanınmış türkoloq, tənqidçi, siyasətçi alim, Vaqif Aslanın həmkəndlisi və yaxın dostu olmuş mərhum Aydın Məmmədov yubilyarın yaradıcılığı haqqında yazdığı məqalədə deyirdi:

"Vaqifin şeirlərinin mərkəzində həmişə insan, onun hiss və həyəcanları durur. Səmimiyyət onun şeirlərində nəzər-diqqəti cəlb edən əsas xüsusiyyətdir. Toxunduğu mövzudan asılı olmayaraq, onun yazıları dağ çeşməsi kimi saf, uşaq gülüşü qədər səmimidir".

Vaqif Aslan isə gənclik dostu Aydın Məmmədovu "Aydın" poeması ilə əbədiləşdirdi, tarixdə onun adına daha bir səhifə əlavə etdi.

Mərhum professorumuz Yaşar Qarayev poema haqqında yazırdı: "bütün əsər boyu şair özü – əzabkeşliyi, qeyrət-dərd yanğısını qəhrəmanla bölüşən "yaman gün", çətin yol yoldaşına çevrilir və bizə iddiaya əsas və haqq verir ki, əbədiyyətə qovuşan Aydına son anda ən böyük sədaqəti iki şəxs göstərdi: müştərək ölümü onunla qoşa qarşılayan axirət bacısı – Dilarə xanım və bu poemanı ilk dəfə qəbrə, məzara oxuyan, onu göz yaşı ilə baş daşına yazan axirət qardaşı – Vaqif Aslan!"...

Burada Vaqif Aslan haqqında Aydın Məmmədovun hələ 44 il əvvəl "Şəki fəhləsi" qəzetində yazdığı məqaləyə diqqət çəmək yerinə düşərdi:

"QƏLƏM DOSTUMUZ VAQİF ASLAN"

Adlı-sanlı şairlər, ədiblər haqqında yazmaq nə qədər asandırsa, sənət aləminə yeni qədəm qoyan, özünəməxsus sənət cığırı seçməyə çalışan gənclər barədə danışmaq bir o qədər çətindir. Şair Vaqif Aslanov belələrindəndir. O, yetkinliyini, dolğunluğunu hələ tam kəsb etməsə də, böyük ümid verir.

Səmimiyyət onun şeirlərində nəzər-diqqəti cəlb edən əsas xüsusiyyətdir. Gözünü açan gündən ətrafda gördüyü mühit, təmtəraqdan uzaq zəhmətkeş kənd həyatı ona qəlbin çırpıntılarını, duyğu və düşüncələrini səmimi ifadə etmək üçün ilham vermişdir:

Çəkilir qızların göyə insafı,
Qoymurlar hal qala gəncdə,cavanda.
Ay zalım,onsuz da yanıram axı,
Ələfsər zurnası havalananda.

Vaqifin şeirlərinin mərkəzində həmişə insan,onun hiss vəhəyəcanları durur. Xalq şairi Səməd Vurğunun dediyi kimi, "...bu canlı insan bəzən sevir, sevilir, bəzən iztirab çəkir, xəyallara dalır, bəzən müxtəlif təbiət gözəlliklərindən daha saf, dahadərin təsirlər alır". İnsanda yaxşılığı, xeyirxahlığı axtaran gənc şair bəzilərinin mənsəbpərəstliyinə irad tutur.

Ağac gördüm, sarmaşıqlar içində –
Alçaq, uca, hamısı da yan-yana,
Ağac gördüm, bir boyda, bir biçimdə,
Ağaclar da bənzəyirmiş insana.
**(„Ağaclar da insan kimidir")**

deyən şair hələ də qəlblərdə yuva salmaqda olan pis hisslərə qarşı barışmazdır.

Vaqif gəncdir. Lakin onun addımları uğurludur. Belə başlanğıc isə Pifaqor demişkən, „bütövün yarısına bərabərdir". Sənə uğurlar arzulayırıq, qələm dostumuz!

*"Şəki fəhləsi" qəzeti,*
*9 oktyabr, 1976-cı il."*

Yubilyarın anadan olmasının 65 illik yubileyi ərəfəsində onunla birlikdə mərhum professorumuz Fərman İsmayılovla çay stolu arxasında oturmaq mənə də nəsib oldu. Fərman müəllim qəzetimizin hər sayında Vaqif Aslanın yazılarını dərc etdiyimizi böyük maraqla qarşıladı və tövsiyyə etdi ki, gələcəkdə şairin çap olunmayan əsərlərinə daha çox yer ayıraq. Ayrılanda professor bir anlıq dayandı və üzünü şairə tutub: **„Vaqif, özünü qoru, sən ədəbiyyatımızın təkcə yazan əli yox, həm də düşünən beyinisən"** – dedi.

Onu da qeyd edim ki, Vaqif Aslanın əsərləri həm də Türkiyədə və İranda işıq üzü görür. Məhz onun məqalələri sayəsində „Şəki bələdiyyəsi" qəzeti də Türkiyə mətbuatında təbliğ olunmuş və türk oxucusu tərəfindən bəyənilmişdir. Son illərdə, ilk dəfə bizim qəzetdə işıq üzü görən və silsilə şəklində dərc etdiyimiz „Türk xalqları

ədəbiyyatı üzrə mühazirələr“i isə Türkiyə ədəbiyyatşünas və tarixçilərində böyük maraq oyatmışdır.

Vaqif Aslanın „Aydın“, XVII əsr fransız səyyahı Şardendən tərcümə etdiyi „Səyahətnamə“, „Ruhlarla söhbət“, „Oğuz elinə salam“, „Qanımdam rəng alan gül“, „Hüseyn xan Müştaq“, „Bizim dünya adlı bir evimiz var“ (əski əlifba ilə Təbrizdə) adlı kitabları və 4 cilddə „Əsərləri“ nəşr olunub.

Yubilyar haqqında yazdığım bu kiçik məqaləni onun özünün şair Ramiz Orsərlə hələ 1999-cu ildə olan və “Ocaq” qəzetində dərq olunmuş müsahibəsində bir suala verdiyi cavabla tamamlamaq istəyirəm:

R.Orsər: – Bu gün iqtisadi məhrumiyyətlər hamını öz içinə çəkilməyə, öz ocağının külünü “üf”ləməyə vadar edib. Hərə bir cürə tüstülənir.

Ancaq hamının tüstüsü Azərbaycan adlı məmləkətin başı üzərində dairələnib bir addım da o yana getmir. Belə bir vaxtda Vaqif Aslan özünü necə hiss edir?

V.Aslan: – Özünü hiss etmək yaşamaqdır. Necə hiss etmək necə yaşamaqdır. Dünən bir cürə narahat idim, bu gün bir başqa cürə. Şəkililər demişkən: – Adam dağdan ummaz, daşdan ummaz. Adam adamdan umar. Mənim də öz-özümdən qəribə umacaqlarım var. Özgələrin umacaqları da bir yandan. Nə özümə umac ova bilirəm, nə də özgələrə əriştə doğraya bilirəm. Narahatam, qardaş, narahatam.

*72188 | 2020-07-03 13:26:57.*

***Bax. Murad Nəbibəyov. Ədəbiyyatımızın döyünən ürəyi – Vaqif Aslan“. Şəki Bələdiyyəsi” qəzeti. № 06(188) iyun 2020-ci il. S.4.***
***Bax. Murad Nəbibəyov. Ədəbiyyatımızın düşünən beyni – Vaqif Aslan. Vaqif Aslan-70. “Region mediyası” qəzeti. №05(222), 17 iyul 2020. S.9.***
***Bax. Murad Nəbibəyov. Ədəbiyyatımızın düşünən beyni – Vaqif Aslan. Vaqif Aslan-70. “Ədalət” qəzeti. № 88(5748) 4 iyul 2020-ci il. S.9.***

## Kimiyəm

Yarım gün, yarım da duman içində...
Gözə boy verməyən dağlar kimiyəm.
Yəqinlik içində, güman içində
Göyləri yerlərə bağlar kimiyəm.

Məni tanıyanlar bətdən-bənizdən
Elə düşündülər olaram dizdən.
Gördülər böyükdür dalğam dənizdən...
İçimdən, çölümdən çağlar kimiyəm.

İstədim dağlara deyəm dərdimi...
Dağlar götürərmi bəyəm dərdimi?
Bir həzin dil ilə öyəm dərdimi...
Bilələr fəryadlar, ahlar kimiyəm.

Bağımdan, bağçamdan, barınammıram.
Yarı-yarımçığam, yarınammıram.
Hazır kəfənimə sarınammıram.
Büküb qoltuğumda saxlar kimiyəm.

Bir dünya sevincəm, bir dünya qəməm...
Tamam, yarımçığam, bütövəm, kəməm.
Mən Vaqif Aslanam,ayrı aləməm...
Lalə sinəsində dağlar kimiyəm

*13 avqust 2001-ci il*

## Olsun!

Mən özgənin yolu ilə getməmişəm,
Deyim, günah etməmişəm.
Oğlum, bunu bilə-bilə,
Getmə özgə yolu ilə.

Sənin də öz yolun olsun!
Öz sağın, öz solun olsun!
Nə olsa, öz dərkənarın,
Öz möhrün, öz qolun olsun!

*27 avqust 2015-ci il*

## İnsan

Daş kəsən, yaş kəsən, baş kəsən insan!
Kəsüdiyin ağac da, daş da özünsən!
Sənə insan olmaq gəlməsin asan!..
Quru da özünsən, yaş da özünsən!

*10 may 2016-cı il*

## Toy

Ağ buluddan süzülən Günəş şüasıdır toy,
Atanın övladına xeyir-duasıdır toy.
Toy ana gözlərində yaz yağışı kimidir.
Gəlinliyə boylanan qız baxışı kimidir.
Toy addır, sandır bizə!
Şərəfdir, şandır bizə!
İki sevən ürəyin bir olmaq həvəsiylə,
Oğlanlığın, qızlığın qara zurna səsiylə,
Vurulan son zəngidir.
Toy "Cəngi" hərarəti, "Vağzalı" ahəngidir.
Doğmaların "Yallı"da birləşən qoludur toy.
Xoşbəxtlik yoludur toy.
Oyunla doludur toy.
Bəyin gözlərindəki şimşək çaxışıdır toy.
Bu gəlimli dünyaya gəlin baxışıdır toy.
Toy müqəddəs işlərin lap ən müqəddəsidir.
Toy dünyaya gələsi körpələrin səsidir.

*06 oktyabr 2015-ci il*

## Epitafiya

Ey insan, gözünü aç, dünyaya bax!
Gör ki, sən bir ovuc torpaqsan, torpaq!
Baharda açılan gülsən, çiçəksən...
Payızda yel vurub tökülən yarpaq.

*03 mart 2015-ci il*

## Sev incə

Onu-bunu sevincə,
Sevil incə, sev incə.
Qəlb viranə saraydır
Yer yoxdursa sevincə.

*03 oktyabr 2015-ci il*

Türkü

Əynindəki köynək güllü çəməndi,
Neynim, könlüm yenə həmən, həməndi.
O çəməndə bir sevdalı çiçək var ...
Boğazımda o çiçəyin kəməndi.
Yada düşdü qafiyənin qarası.
Yaraşacaq bunun yara harası?
Qıl qurtardım, yaxşı oldu, dəymədi
Sevən ilə sevilənin arası.

Sevincimdən sızıldadım ney kimi.
Dodağından bal süzüldü mey kimi.
Şükür sənə, sən ey məni yaradan!
Göylərdəyəm, şığıyıram ley kimi.

Dedi: – Məni çətinliyə salma, gəl.
Dayazda üz, dərinliyə dalma, gəl.
Dedim: – Dünya əzəl gündən belədir.
Olanları heç vecinə də alma, gəl.

*27 dekabr 2015-ci il*

## Gəlirəm

Mən ki od ilə havadan,
Su ilə gildən gəlirəm.
Bilən varsa, durub desin
Mən hansı ildən gəlirəm.

Mən bir əcəb dəmdə idim.
Təkdə deyil, cəmdə idim.
Bura qədər bəmdə idim.
İndi də zildən gəlirəm.

Qorğa kimi qovrularaq,
Xırman kimi sovrularaq,
Təknələrdə yoğrularaq
İlikdən, beldən gəlirəm.

İrmaqları keçilməyən.
Bulaqları içilməyən,
Sünbülləri biçilməyən
Çox uzaq eldən gəlirəm.

Göyün yerə sözü mənəm.
Ürəklərin közü mənəm.
Məhəbbətin özü mənəm.
Könüldən, dildən gəlirəm.

*05 aprel 2018-ci il*

## Olasan

Gəl gülüm, gəl gözəlim, gəl ki, səni var olasan
Sənə şahlıq yaraşır, olsan, hökmdar olasan.

Mən də bağlar dəlisi, bar və nübar aşiqiyəm.
Ətəyi alma dolu, qoynu dolu nar olasan.

Sağ əlin nərgiz üzə, sol əlin novruz çiçəyi.
Mənə gül çatmasa da, səni bəxtiyar olasan.

Ulduza: – En! – deyəsən,ulduz enə ulduz ilə.
Həm Aya, həm Günəşə sahib-ixtiyar olasan.

Pis kəsi, pis nəfəsi Allah özü həll eləsin.
Sən isə yaxşıların yaxşısına yar olasan.

Sən ətirdə çiçəyi bir də bitirməz bu çəmən.
Diləyi bar yetirən, arzusu gülzar olasan.

Vaqif Aslan əl açır Allaha ki,tez gələsən,
Gələsən, ömrü qışa bir də ilk bahar olasan.

*16 fevral 2003-cü il*

## Gəl

Mən dedim: – Qız, gəlirəm. Sən dedin: – İsrar ilə gəl.
Könlünün tellərini çək tarıma, tar ilə gəl.

Mən dedim: – Laləyə bax, nərgizə bax, qoymur, axı!
Sən dedin: – Yum gözünü, amma ki, gülzar ilə gəl.

Mən dedim: – Yoldur, axı, döngələri, tinləri var...
Sən dedin: – bilməyirəm, əhd ilə, ilqar ilə gəl.

Mən dedim: – Ey Günəşim, şəkk eləmə saflığıma
Sən dedin: – Yaz mehi ol, bar ilə, nübar ilə gəl.

Mən dedim: – Çaydır ömür, axmadadır, varmı sözün?.
Sən dedin: – Onda tələs, eşqə etibar ilə gəl.

Mən dedim: – Gözlərim üstə, nə desən, eyləyərəm.
Sən dedin: – Dur, Cümayoğlu, məni sən yar elə gəl.

*06 yanvar 2019-cu il*

## Əkinçilərə

Torpağı darayıb təmizləyərlər...
Xışlaya-xışlaya sır-sığal çəkib
Oxşaya-oxşaya əzizləyərlər.

Əkinçi qardaşım, getmə dərinə!
Dərdi su dərdidir yanan torpağın...
Bir damcı su damdır yanan yerinə

Bacarmaq – becərmək halalın olsun!
Göyərmək – cücərmək halalın olsun!

*14 sentyabr 2019-cu il*

## "Elə-belə"

*(Bu rədif İlqar Fəhmidə və digərlərində də vardır)*

Oğul-uşaq ağlayır
"Elə-belə".
Ata basıb bağlayır
"Elə-belə".
Sarsaqlar sarsaqlayır
"Elə-belə".

Adamlar bir-birini
ütəyir, qorsaqlayır
"Elə-belə".
Dünya nədir bilmirəm.
Birisi tüprükləyir,
O birisi yağlayır
Elə-belə.
Xam düşənlər bal bilir...
Uşqunur, barmaqlayır
"Elə-belə".
Birləşmiş millətlərin
birlikləri laxlayır
"Elə-belə".
Yıxılası evləri,
xalq çiynində saxlayır
"Elə-belə".
Əriyir buz dağları,
okeanlar çağlayır
"Elə-belə".

*04 dekabr 2018-ci il*

## Qurban olsun...

Sevgi ilə alışın!
Qaynadıqca qarışın!
Köz közə qurban olsun.
Qurbanlıqda yarışın!
Üz üzə qurban olsun.
Sarmaşıqtək sarışın!
Göz gözə qurban olsun.
Ürək ilə çalışın!
Sevərəkdən danışın!
Söz sözə qurban olsun.

Yol əhli o kəsdir ki,
qəlbən gedib gəldiyi
yol-izə qurban olsun.
Əyriylə nə işim var?
Düz-düzə qurban olsun.

*12 avqust 2019-ci il*

## Rəhmət

Atama rəhmət olsun
Məni əkib becərdi.
Anamın tarlasında
Məntək oğul cücərdi.

*29 yanvar 2015-ci il*

## Sən elə düşünmə ki...

Sən elə düşünmə ki, ömrümü yelə verdim.
Mən səndən şeir aldım, onu da elə verdim.

*11 dekabr 2020-ci il*

## Olmasın

Qovuşuqdur yaranışdan dağ-aran...
Dağ aransız. Aran dağsız olmasın.
Məndən küsüb inciməsin sevənlər...
Can taqətsiz, ürək yağsız olmasın.

Mən bu yaşda neçə fəsil görmüşəm...
Gah bədəsil, gah da əsil görmüşəm.
Gördüyümü nəsil-nəsil görmüşəm...
Göz işıqsız, ev çıraqsız olmasın.

Bağ odur ki, qoynu dolu barı var...
Dağ odur ki, zirvəsində qarı var...
Xöşbəxtlərin xoşagələn yarı var.
Sevənləri sevən çağsız olmasın.

*21 fevral 2021-ci il*

## Qalacaq

Güldərən əllərə sağlıqlar olsun!
O güldə gül əlin ətri qalacaq.
Gülə sığal çəkən əl sahibinin
O gülün yanında xətri qalacaq.

*12 fevral 2021-ci il*

## Olar

Dost ilə dost arasında
Söz də olar, sov da olar.
Ürəyində varsa əgər
Tov olmayan tov da olar.

Ağ sinədə qara xallar...
Şərh istəməz çox suallar.
Göydə tutar əhli-hallar
Ovçu olsa, ov da olar.

And olsun bu yerə-göyə
Qaldım səni öyə-öyə.
“Qaçma-gəldim” deyə-deyə
“Qaç” da olar, qov” da olar.

*22 fevral 2021-ci il*

## Gül səndən, şeir məndən

And olsun, düz deyirsən
Bağ səndən, seyir məndən
Göstər səxavətini
Gül səndən, şeir məndən

Əzizim, bu-bahardır.
Gör, nə gəlişi vardır.
Tumurcuq dolu bardır
Bar səndən, xeyir məndən.

Gül-çiçəkdə bu nədir?
Meyli ancaq döşədir.
Bənövşə bənövşədir.
Lalə də deyir məndən.

*27 fevral 2021-ci il*

## Olsun

Sizdən bizə düşənlər
Qoy olsun, bizim olsun.
Bizdən sizə düşənlər

Olsun də, sizin olsun.
Təki öz aramızda
Olmağa izn olsun.

*27 fevral 2021-ci il*

## Qəbrüstü yazı

Qəbrim üstə yazı yazdım, budur ki!
Zaman dərya, ömür axar sudur ki!
Torpaq bizi yavaş-yavaş udur ki!
Göyərməyin vədəsində göyərtsin.

*29 may 2017-ci il*

## Tanrım, sənə şükürlər!

Səni olduğun kimi
Anadangəlmə gördüm.
Qollarımı boynuna
Çərpələng kimi hördüm.

Şükür sənə, ey Xuda!
Qismətim imiş bu da.
Amma harda? –Yuxuda!

*1 mart 2021-ci il*

## Bahası…

Yaş yaşıllıq deyil, ha!
Yaş nədir? – Can bahası...
Yaş verir, can alırlar.

Qov qığılcım deməkdir...
Qovuşmaq qan bahası...
Qov vurub qan alırlar.

*08 yanvar 2020-ci il*

## Nə mənası?

Nə qədər istəyirsən sığallan,
Nə qədər istəyirsən parla!
Ey əkilməyən torpaq,
Becərilməyən tarla!

*12 iyun 2018-ci il*

## Yoxsa

Könül sevən könüldürsə, yar istəyər.
Axı necə istəməsin, yarı yoxsa?

Bağa girən bağa baxıb bar istəyər.
Bağ neyləsin uralanıb, barı yoxsa?

Nar ağacı bir ağacdır, yetən ondan nar istəyər.
Yazıq ağac günahkarmı dərilibsə, budagında narı yoxsa?

Yoxu yoxa çıxsın görüm, yoxdan bezar olub hamı.
İnsan qalır boynuburuq dövləti yox, varı yoxsa.
Adam dağdan-daşdan ummaz deyənlərin nə günahı?
Amma... Əmma..
Dağ neyləsin, zirvəsində qarı yoxsa?

*21 iyun 2018-ci il*

## Mən səni unuda bilərəmmi heç?

Səni görən gündən vuruldum sənə,
Mən səni unuda bilərəmmi heç?
– Məni unutdunmu? – Deyirsən mənə.
Mən səni unuda bilərəmmi heç?

Gəzdirdim könlümdə, gözümdə səni
Vəsf etdim şerimdə, sözümdə səni.
Qorudum, saxladım özümdə səni,
Mən səni unuda bilərəmmi heç?

Zirvədə izin var, qayada yazın...
Göylərdə əks edir səsin, avazın.
Mənim var ömrümdə olar-olmazım,
Mən səni unuda bilərəmmi heç?

Üstümdə sevdadan çətrin var sənin.
Canımda, qanımda ətrin var sənin,
Yanımda bu boyda xətrin var sənin,
Mən səni unuda bilərəmmi heç?

Hər iki dünyada sənədir meylim,
Ay mənim Şirinim, ay mənim Leylim!
Ay mənim həmişə məndən gilelim
Mən səni unuda bilərəmmi heç?

*31 oktyabr 2012-ci il*

## Mən yordum bu yolları

Yollar məni yormadı, mən yordum bu yolları.
Bu hava, bu da quru, bu da ki, su yolları...
Harda qırıldılarsa, onlara körpü oldum.
Sondan sonra sonrakı sonlara körpü oldum

Günlərdən-günə vardım, aylardan – aya vardım...
Alıb ayaqlarıma yolları mən apardım.
Elə yollardır mənim dövlətim də, varım da...
Gəzirəm bu dünyanı yollar ayaqlarımda.

*29 oktyabr 2012-ci il*

## Olmur

Əslən gözəl olmayan
Binadan gözəl olmur.
Sevgiylə doğulmayan
Anadan gözəl olmur.

İşlər var – belə-belə,
Gözəl gözəldir elə.
Nə rəng vursan da ələ,
Xınadan gözəl olmur.

Nə sən pirsən, nə mən pir.
Haqq-hesab eylə sən bir.
Sonanı sevən bilir...
Sonadan gözəl olmur.

*31 iyul 2012-ci il*

## Mənim sevdiklərim, çox sevdiklərim

Mənim sevdiklərim, çox sevdiklərim
Qara siyahıya məni saldılar.
Hayıf alasılar qıraqda qaldı,
Hamının hayfını da məndən aldılar.

Mənim sevdiklərim, çox sevdiklərim
Elə unutdular insafı, dini.
Haçan incidilər, acıqlarından
Mənə yaşatdılar 37-ni.

Mənim sevdiklərim, çox sevdiklərim
Şirinə, şərbətə qatdılar məni.
Gördülər hamıya şirinləşmişəm,

Qara quyulara atdılar məni.
Sonra da bir quru qazancdan ötrü
Dəyərə-dəyməzən satdılar məni.

Mənim sevdiklərim, çox sevdiklərim
Məni oşam-oşam oşaladılar,
Məni param-param paraladılar.

Asdılar, kəsdilər, soyumadılar,
Üstümdən xətt çəkib qaraladılar.
Mənim sevdiklərim, çox sevdiklərim
Məni özlərinə yaxınlaşdırıb,
Özümü özümdən araladılar.
Mənim sevdiklərim, çox sevdiklərim
Pislik etmədilər mənə, bəlkə də,
Amma ki, ruhumu yaraladılar.

Mənim sevdiklərim, çox sevdiklərim
Ömrümə, günümə qənim oldular.
Məndən inciməsin məni sevənlər
Onlar da həmişə mənim oldular.
Könüldən getməyən, gözdən getməyən
Kədərim oldular, qəmim oldular.
Mənim sevdiklərim, çox sevdiklərim

*24 iyul 2012-ci il*

## Sirsiniz siz

Ey sığala yatmayanlar!
Ey səsləri batmayanlar!
Ey gözləri oyulanlar!
Ey dərisi soyulanlar!
Öz qanında çimə-çimə
İllər boyu yuyulanlar!
Nəfəsləri
minillikdən duyulanlar!
Şəkilləri kitablara,
heykəlləri meydanlara
qoyulanlar!
Sirsiniz siz!
Taleyi bir, qisməti bir,
aqibəti birsiniz siz!

Ey başları hökmdarlar hökmü ilə kəsilənlər!
Fərman ilə, sərəncamla tapdalanıb əzilənlər!
Ey əlləri yerdən-göydən üzülənlər!
Əsərləri əsrə görə düzülənlər!
Bir bu boyda yaşınızla
Dağdan ağır daşınızla,
Beyni daşa dağıdılmış başınızla,
sirsiniz siz!
Abidsiniz, möbidsiniz, pirsiniz siz!

Pambıq ilə baş kəsənlər
baş əyirlər başınıza.
Qərar verib yaş kəsənlər
qol qoyurlar yaşınıza.
Kabinetdə möhür basıb,
karxanada daş kəsənlər
and içirlər daşınıza.

Taleyi bir, qisməti bir,
aqibəti birsiniz siz!
Abidsiniz, möbidsiniz, pirsiniz siz!
Sirsiniz siz!
Sirsiniz siz!

*15 yanvar 2019-cu il*

## Sabirə xitab

Ay səni olasan pir!
Mirzə Ələkbər Sabir!

"Qulyabanı"lar gəzən
"biyaban"dan qorxmadın!..
Düz etdin!
Dümdüz etdin!
Lap düppələm düz etdin!

Sağı, solu viranə
xiyabandan qorxmadın!..
Düz etdin!
Dümdüz etdin!
Lap düppələm düz etdin!

"Bulvarda madam" görüb,
"Talvarda madam" görüb,
Bəlkə də, təsadüfən
şalvarda madam görüb,
qorxmadın!..
Düz etdin!

Dümdüz etdin!
Lap düppələm düz etdin!

"Xarici mülkündə də...
çox tühaf adam " görüb,
qorxmadın ...
Düz etdin!
Dümdüz etdin!
Lap düppələm düz etdin

Başına çitmə, irət,
kələğayı bağlanan ...
Sığallanan, yağlanan ...
Qucaqlarda saxlanan ...
Birindən boşanınca
birinə adaxlanan ...
Ər axtaran kişilər
görsən də, görməsən də ...
Ərkəknişan dişilər
görsən də, görməsən də ...
"Qəbirdə Xortdan" görüb
qorxmadın ...
Düz etdin!
Dümdüz etdin!
Lap düppələm düz etdin!

"Mənzili-viranədə ...
cin" nədir ki, "can"görüb
qorxmadın ...
Düz etdin!
Dümdüz etdin!
Lap düppələm düz etdin

Ay səni olasan pir!
Mirzə Ələkbər Sabir!
Ələndikcə müsəlman
müsəlman xəlbirindən!..

Gecələr yuxunda da
hövlank qalxdın yerindən ...
Qorxdun, qorxdun da!.. Qorxdun!
Düz etdin!
Özü-özünə düşmən
kəsilənin birindən
Qorxdun, qorxdun da!.. Qorxdun!
Düz etdin!
Dümdüz etdin!
Lap düppələm düz etdin!

Düz olanı yüz yerə
əydirib qatladandan,

Düşmən sevindirəndən,
dost bağrı çatladandan
Fətvası verilməmiş
özünü partladandan ...
Qorxdun, qorxdun da!.. qorxdun!
Düz etdin!
Dümdüz etdin!
Lap düppələm düz etdin

Ay səni olasan pir!
Mirzə Ələkbər Sabir!
İndi bütün dünyanın
"fikri qan"dır, beyni qan ...
Yarpaq kimi titrəyir
Yer kürəsi qorxudan.

*21 yanvar 2016-cı il*

## Şairdən üzrxahlıq

Şirə görüb
ağızlara,
Rəqəm görüb
kağızlara
qondular.
Görənlərin gözü qorxdu,
eşidənlər dondular.
Onlar axı bir deyildi,
beş deyildi, ondular...
Heykəlini büst olunca
manat-manat,
qəpik-qəpik,
yondular.

*14 avqust 2011-ci il*

## Sevgi yox, sevməyənlər bir salama dəyməyir

*(B.Vahabzadənin "Bir salama dəymədi" şeirini yanıqlı-yanıqlı oxuyan gənclərimizə həsr edirəm)*

İlk dəfə vurulan qız,
ilk dəfə sevən oğlan!
Xalismisən, qəlpmisən?
Məhəbbətinlə yoxlan!

Salam təmənnasıyla
yavaşıyıb dayanma!
Zaman dayanmır, axı,
vaxtı, zamanı danma!

Tut sabaha üz, yeri!
Sinma, şax dur, düz yeri!

Əsla, əsla insanı
məhəbbəti əyməyir!
Sevgi yox, sevməyənlər
bir salama dəyməyir!

İlk dəfə sevən oğlan,
ilk dəfə vurulan qız!
Səsini nə boğ, nə qıs!

Göz açıb gördüyünçün
gözlərin aydın olsun!
Könlünü verdiyinçün
fikrin tam, hökmün qəti,
sözlərin aydın olsun!

Salamını almayan,
Səni saya salmayan
Bir ruhsuz üzü dönmüş,
Odu-ocağı sönmüş
üzünü yana tutsa,
“Qəlbinizin bir duyub,
bir vurduğu anları
bir andaca unutsa,
Özünü suçlu sanma!
Yanma, havayı yanma!
Əsla, əsla insanı
məhəbbəti əyməyir!
Sevgi yox, sevməyənlər
bir salama dəyməyir!

İlk dəfə vurulan qız,
ilk dəfə sevən oğlan!
Tüstülənmə, alovlan!

Elə baxma mənə sən!
Bəyəm bilmirəmmi mən
Sevdikcə də sevdiyin
necə keçib yanından?
Dönüb “dala baxmısan,
can ayrılıb canından.”

Sevənə zülm edərlər,
Sənə zülüm yaraşır!
Eşqə xor baxanlara
ancaq ölüm yaraşır!

*12 may 2014-cü il*



*16 avqust 2020-ci il. Şəki. B.Vahabzadənin büstü önündə*

## Zəlimxan Yaqubu yuxuda gördüm



*Şəki*
*07 mart 2006-cı il*

Zəlimxan Yaqubu yuxuda gördüm...
Evi də var idi bağlar içində.
Yuxuda olsam da, ömür yaşadım
Mehriban, səmimi çağlar içində.

Zəlimxan Yaqubu yuxuda gördüm...
Söykənib balkonun məhəccərinə

Sağını, solunu seyr eləyirdi.
Qabaqda maşınlar şütüyürdülər...
Ötən günlərinə baxırdı sanki...
Ömrünün yolunu seyr eləyirdi.

Zəlimxan Yaqubu yuxuda gördüm...
Təkcizgi vərəqdə şeiri var idi.
Amma bitməmişdi yazdığı şeir...
Olanı elə o misralar idi.

Zəlimxan Yaqubu yuxuda gördüm...
Necə var idisə, eləcə idi...
Sağdı, salamatdı, coşqundu, kürdü...
O belə şairdi, beləcə idi!

*28 mart 2020-ci il*

## Şair dostum Əbülfəz Ülviyə

Xoş gəldin Şəkiyə, mənim qardaşım!
Xoş gəldin, xoş gəldi ilimiz bu yaz.
Yaşıl səmənidir torpağım, daşım...
Gəldin, şirinləşdi dilimiz bu yaz.

Vətəndir qaynağı imanın, dinin ...
Kökübir, boyubir, soyubirlərik.
Birdir vurğusu da ürəyimizin
Torpağı, havası, suyubirlərik

Ordubad, Sədərək xətirli qardaş!
Səni görən kimi özümü tapdım.
Ey Culfa, ey Sahbuz ətirli qardaş!
Söhbətimi tapdım, sözümü tapdım!

Şəki də – Şəkidir, saxalı Şəki...
Durur Nuhdan qalma məbədi ilə.
Dağıyla, daşıyla arxalı Şəki
Dostdur yaranışdan əbədi ilə.

*31 mart 2016-cı il*

## Bəhruz İmani Təbriziyə

Salamün-əleyküm, Bəhruz İmani!
Yüz il də, min il də anidir, ani.
Amma ki, amma ki, bar vermir dilim
Söyləyəm: – “Bu dünya fanidir, fani”.

Əlahəzrət Zaman axar bir sudur.
Daim sabahlara yol gedir, budur!
Haqsızı qəhr edir burulğanında.
Haqlının həmişə əlindən tutir.

Dərdini əsəcək yellər aparsın!
Yellər aparmasa, sellər aparsın.
Ellərə dediyin nəğmələrini
Elə əmanət et, ellər aparsın!

*21 may 2016-cı il*

## Ramiz "Hörmüz" demək ...
*(Hüquqşünas dostum Ramiz Məmmədov üçün)*

Ramiz "Hörmüz" demək – nursan, işıqsan...
Sən Tanrı payısan bizə, qardaşım.
Necə də mehriban, necə də şuxsan,
Ömrünü sevginlə bəzə, qardaşım.

65 yaşın var, yaşın mübarək!
Xeyirli yaş gəlsin yaşının üstə.
Ayağın altında açsın yer çiçək,
Göy də işıq saçsın başının üstə.

Ulduzlar gecələr yerə baxmasa,
Yerlərin sirrini bir kimsə bilməz.
Dönüb nur selinə yerə axmasa,
Günəş də sevilməz, Ay da sevilməz.

Külək də əsməsə külək saylmaz.
Çay da çay sayılmaz aşıb daşmasa.
Qəflət yuxusundan insan ayılmaz
Doğulub dünyayla qarşılaşmasa.

Ad günü deyirik olum gününə,
Adınla, sanınla yaşa, qardaşım.
Daim yaxşılıqlar gəlsın önünə,
Yaşınla çıxasan başa, qardaşım.

Oğlundan, qızından yarıyasan sən...
Nəvənə pay düşə gülüşlərindən.
Bəxtəvər-bəxtəvər qarıyasan sən,
Gülün ətri gələ gül işlərindən.

Qalıb-qalmasa da dünya kimlərə,
Həmişə olacaq bu bahar, bu qış.
Üzündə sayrışan təbəssümlərə,
Sinəndə çırpınan ürəyə alqış!

## Ürək ovudursan sinəndə, qardaş!

*(Vəkil dostum İkram Abdullayev üçün)*

Duruşun mənalı, baxışın dərin...
Kədərin gözündən süzülüb gəlir.
Qəlbində yığılan xatirələrin
Durna qatarıtək düzülüb gəlir.

Bu sərin gecədə nə düşünürsən?
Ovutmur qəlbini yaz havası da.
Nədən gah titrəyir, gah üşünürsən?
Yatmırmı könlünə saz havası da?

Ömürlər gərəkdir, illər gərəkdir
O keçən illərə qayıtmaq üçün.
O illərdə qalan dillər gərəkdir
Qəlbini, ruhunu ayıltmaq üçün.

Yaxşı ki, ürəyin dolan vaxtda da
Bədnəzər gözündən uzaqlardasan.
Sən özün özündə olan vaxtda da
Elə bil, özündən uzaqlardasan.

Günmü axtarırsan geri dönməyən?
Bu gün də şirindir, dünən də, qardaş.
Nələri itirdin, nələri tapdın
Dünəndən bu günə dönəndə, qardaş?
Gözlərin yaşarır dinəndə, qardaş.
Alovu sönməyən, odu sönməyən
Ürək ovudursan sinəndə, qardaş!

*07 mart 2017-ci il*

## "Teleovqatın" yaradıcısı və aparıcısı Səyyarə xanım Səyyafa ithafən

Azərbaycan "Ovqat"ının Səyyarəsi, de, necəsən?
Göyün yerə tanrıqutluq işarəsi, de, necəsən?

Ey Ağdamın alduvaqlı, ağörpəkli gəlin qızı!
Ey səadət, ey xoşbəxtlik fəvvarəsi, de, necəsən?

Eşqi seçdin, seçildin də, candan keçdin, keçildin də.
Eşq özüdür sevənlərin tək çarəsi, de, necəsən?

Eşitdim ki, xəstəhalsan, xoş olardım, könlün alsam...
Sənə qurban ürəyimin hər parəsi, de, necəsən?

Mən sevdalı ömür sürdüm, eşq üzündən nələr gördüm!
Şirin olur sevən qəlbdə yar yarəsi, de, necəsən?

Sən olmasan, yetim qalar "Ovqat"ımız, ilhamımız...
Qəza eylər xəyalların təyyarəsi, de, necəsən?

And verirəm, özün söylə, soruşmasa olarmı heç?
Sən gözəldən mən gözəllik avarəsi: – De, necəsən?

*20 mart 2022-ci il*

## Xeyir-dua

*(Tangiz xanıma)*

Allah ömür versin bu gözəl qıza.
Üstündə naxışı, bəxti da olsun.
Xoş sözü yüksəlsin Aya, ulduza.
Mümkünsə, qızıldan təxti da olsun.

Gecələr göz vursun ulduzlar ona.
Yayılsın üzünə Ay təbəssümü.

Yalan söyləyərəm, görmüşəm desəm,
Mən bu təbəssümə tay təbəssümü.

Gündüzlər güvənsin doğulduğuna.
Qəlbinin ən sevər gülü açılsın.
Kiminsə sevgisi tuş gəlsin ona...
Kiminsə tutulan dili açılsın.

Coş, Vaqif Aslanın coşan ilhamı!
İşıqdan iti ol, kəskin ol səsdən!
Qoyma ki, qırılsın sevginin camı!
Qoyma ki, ürəklər düşsün həvəsdən!

**P.S.**
Bu şeri bir kəlmə sözünə yazdım.
Özün istəmişdin, özünə yazdım.
Mənim nə işim var yadla-yalanla?
Elimin-günümün qızına yazdım.

*25 oktyabr 2018-ci il*

## Gəlir

*(57-ci yaşına gülməyi gələn Cəfər Əzizoğluna)*

Nə yaxşı! Nə yaxşı ki, 57-yə yetdin!
Yetdin!
Lap yaxşı etdin!
Cəfərim, bu yaş ki, var,
yar deyil, gecə gəlsin.
Sifariş də götürmür, deyəsən necə gəlsin.
Gələndə bu yaş gözəl o qədər yavaş gəlir.
Gəlib çatana kimi çox gözlərdən yaş gəlir.
Bu yaş yaş işləriylə,
Övlad təbəssümüylə, nəvə gülüşləriylə ...
Üstümüzü kəsdirir bir anda, bir hovurda.

Mənim də sənin kimi elə bu vurhavurda
Bu ağaran saqqala, başa gülməyim gəlir.
Yubileylər başladan,
Başımızı daşladan
yaşa gülməyim gəlir.
Gulməyimin özünə
gülüb ölməyim gəlir.

Kim bilir nə dumanlar ötüşübdür başından?
Kim bilir hansı güllər su içib göz yaşından?
Hansı gözlər qalıbdır yaddaşında, de görüm!
Həmənki Cəfərmisən bu yaşında, de görüm?
Alıbdırsa arvadı Kiçik Cəfər əlindən
Böyük Cəfər, sıxılma ömrün gəlhagəlindən!
Mənim də sənin kimi ona gülməyim gəlir.
Əvvələ qəh-qəh çəkib,
sona gülməyim gəlir.
Gulməyimin özünə
gülüb ölməyim gəlir.

*01 avqust 2016-cı il*

## Gördüm
*(Dr Prof. Fariz Əmirov üçün)*

Bu səhər oldu vaxtım …
Dünəndən paylaşdığın
şəkillərinə baxdım …

Nyu-Yorkda o axşam,
Ucalıqdan alıb kam,
Neçə göydələn ilə yanaşı dayanmısan …
Görürəm ki, Ay doğub, nuruna boyanmısan …

Budur, sükut içində
böyük çaya baxırsan …
Sandım o çaydan dərin

Fikrin, düşüncələrin
axarında axırsan.

Gördüm məbəd önündə
görünürsən möhtəşəm …
Sənə torpaqdan gəlib
bu əzəmət, ehtişam.

Azərbaycan oğlusan, dünya boyda yaşın var.
Daşlaşmış, qayalaşmış yadın var, yaddaşın var.
Tanışlığın var sənin var olan dillər ilə …
Gün desəm – günlər ilə, il desəm – illər ilə …

Səmanı da, Yeri də sən müqəddəs sanırsan …
Ana bilib dünyanın
başına dolanırsan …

Eşq olsun! Bu dünyanın olsan da harasında …
Sən böyük görünürsən böyüklər arasında.

*13 may 2016-cı il*

## Abdulla Yusifliyə xitabən
## I
## Ata

Ana candırsa əgər, canda olan candır ata.
Ana torpaqdır əgər, göydür, asimandır ata.

Ana Gündürsə, inan, Aydır ata övlad üçün.
Nə qədər varsa nəsil, dövr eləyən qandır ata.

Yoğurub yapdı bizi südlə sümükdən Yaradan.
Atılan ox, çalınan qılınca qalxandır ata.

Onların alqışıdır bizləri xoşbəxt eləyən.
Ana taxt, onda durub hökm eləyən xandır ata.

Südü qoymaz ananın qarğışı övlada keçə.
Kölgəsi ilə belə arxadır, həyandır ata.

Həm anan, həm də atan ruhu başın üstə gəzir.
Doğmadır daim ana, daim mehribandır ata.

Vaqif Aslan sözünün qədrini Abdulla bilir.
Şan-şərəfdirsə ana, şöhrətdir, ad-sandır ata.

*14 iyul 2016-cı il*



*10 mart 2018-ci il. Bakı. Soldan: ......., Rafiq Rəsulov, Vaqif Aslan, Abdulla Yusifli, Əbülfət Oğuz*

## II
## Oğlum

Sevgidən yaranmısan
Sevgiylə yaşa, oğlum.
Elə bu sevgiylə də
Ömrü vur başa, oğlum.

Dərd səndən öc almasın
Tale bərkə salmasın
Qəlbində yer qalmasın
Borana, qışa, oğlum

Qədrini bil illərin
Xoşbəxt olsun ellərin
İstəyin, əməllərin
Çıxmasın boşa, oğlum.

Qanadsıza qanad ver,
Gülə-çiçəyə ad ver.
Nəfəsinlə həyat ver
Torpağa, daşa oğlum.

Əcdadını yad eylə.
Ruhlarını şad eylə.
El içində ad eylə,
Yaşa, min yaşa, oğlum.

*15 avqust 2017-ci il*

## Ayıra bilmədi ayrılıq bizi

*(Həyat yoldaşı Mehriban xanımı vaxtsız itirən əmoğlu Mirəlinin dilindən)*

Yenə çiçək sərib bahar hər yana...
Mən də sevə-sevə bağlaram.
Solan çiçəkləri qoyub güldana,
Solmayan gülləri sənə saxlaram.

Bərki var, boşu var sınaqların da
Xatirən ayımda, illərimdədir.
Nəfəsin soluxan yanaqlarımda,
Sığalın ağaran tellərimdədir.

Hərdən övladların silib gözümü
Gözümün içində səni axtarır.
Oğlun eşitdikcə “ana” sözünü
Sözümün içində səni axtarır.

Bərkiyib oluram daş kimi möhkəm
Özümü beləcə saxlayıram, bax.
Üzdə Günəş kimi gülümsəyirəm...
Qəlbən bulud kimi ağlayıram, bax.

Var ömrü boyunca insan yol gedər...
Gedəndən yadigar qalan izmi, de!
Ərkə öyrəşənlər, axı. ərk edər
Qürbətmi genişdir, evimizmi, de!

Aralı olsa da mənzillərimiz,
Ayıra bilmədi ayrılıq bizi.
Elə bilirəm ki, bir yerdəyik biz,
Birgə ovuduruq ürəyimizi

*06 sentyabr 2016-cı il*

## Rafiq Rəsulov üçün

Uca dağlar yağan qardan inciməz...
Bağban bağdan, bağ da bardan inciməz.
Çəkən bilir ağrının da nazı var.
Sevən ürək sevən yardan inciməz.

Ağrılarda göz ağrısı deyirlər...
Hər adama öz ağrısı deyirlər.
Hər ağrıdan ağır olur, bəd olur
Qəlb incidən söz ağrısı deyirlər.

Boyu uca, qaməti şax qardaşım!
Tez ol sağal, dünyaya bax, qardaşım.
Dərdi yandır, azarı yax, qardaşım!
Canım qardaş, gözüm qardaş, ağrıma!
Qalx ayağa, səni basım bağrıma!

Başın üstə Günəş olub duran var.
Çiçək kimi gül boynunu buran var.
Sənlə birgə yurd, xaniman quran var
Oğulları, nəvələri sevindir...
Bu sevimli dünya sənin evindir.

*27 fevral 2021-ci il*



*Soldan: Vaqif Aslan, Müğənni Əbülfət Oğuz, bəstəkar Rafiq Rəsulov, (-2022), əmioğlu Mirəli Nurəli oğlu İslamov*

## İçində

*(Təbrizli Seyid Məhəmməd Hüseyniyə)*

Gülümsər üzünə baxdım dünyanın.
Gördüm ellərimi ellər içində.
Dağına, düzünə baxdım dünyanın...
Çölləri titrədi tüllər içində.

Ey Seyid Məhəmməd Hüseyni qardaş!
Sevgiylə göyərir bu torpaq, bu daş.
Sərhədlər, bərələr olmayaydı kaş!
Gələydik, gedəydik güllər içində.

O tayda açılan lalələr mənə.
Çəkdirir, gör, necə, nalələr mənə.
Tanışdır gül üstə jalələr mənə.
Vəsfini elərəm dillər içində.

Bu yerdə qınama Vaqif Aslanı.
Dost görür, gül görür, qaynayır qanı.
Yaşa yurdumuzun torpağı sanı.
Görsünlər tarix var illər içində

*22 avqust 2017-ci il*

## Əli bəy

*(Ləzgi dostum Əli bəyə)*

Yatıb durdum,..
gördüm xeyli yaşım var.
Dost-tanışlı bir adamam,
dağdan ağır daşım var.
Fərəhləndim, Əli bəy!
Səsin gəldi,
ürəkləndim, Əli bəy!

Nədən düşdüm
Çin səddində yadına?
Quzu kəsim adına!
Adı gözəl Əli bəy!
Adı gözəl,
yadı gözəl Əli bəy!

Ətirlidir, xətirlidir sözlərin ...
Ordan məni necə gördü gözlərin?
Bahar gəldi dağlarıma, Əli bəy!
Gül ələndi bağlarıma, Əli bəy!
Burda Samur, orda Amur axır hey!
Dərya eşqi çayları da yaxır hey!
Yurd sevgisi yaman olur, Əli bəy!
Olsa, eldən aman olur, Əli bəy!

Dağların bu üzündə xan Şəkidir.
O üzündə Dağıstan nər təkidir.

Belə yerdə daha mənim nə dərdim?
Burda durdum, Çin səddində göyərdim.
Göyərəsən, göyərdəsən, Əli bəy!
Bəy olasan hər yerdə sən, Əli bəy!

*03 noyabr 2017-ci il*

## Hərbçi dostum Kərim üçün

Mən elə bilməzdim səni, qardaşım!
Oynatdın yerimdən məni, qardaşım!
Sənin necə gözəl səsin var imiş!
Deməli, istəkli kəsin var imiş!
Nə gözəl yandırıb səni yandıran!
Yandıra-yandıra alovlandıran.
Necə vurubdur ki, o nəfəs səni.
Hələ də oxudur o həvəs səni.
Çəkib çox bəlalar mənim də başım!
Ey mənim sevdalı Kərim qardaşım!

*02 yanvar 2018-ci il*

## Nəvəm Aylinə

Ay mənim Aylinim, gözəl Aylinim!
Babasından ötrü özəl Aylinim!

Tuncərə, Nəsrinə qəzəblənəndə
Hamını acıqlı süzər Aylinim.

Çətinmiş bu qızın könlünü almaq ...
Küsdümü, hamıdan küsər Aylinim.

Ərköyün gözəldir nənəsi kimi
Adamın canını üzər Aylinim.

Deyirəm: – Babaya bir öpüş gətir.
Durub dodağını büzər Aylinim.

Aylinim, Aylinim, gözəl Aylinim!
Vaqif Aslan üçün özəl Aylinim!

*07 iyul 2017-ci il*




*Soldan: öndən – Aylin, arxada – Aslan, Arzu, Nəsrin, Tuncər*

## Nəvələrim

Barmaq-barmaq,
Dırnaq-dırnaq,
Əl-əl. qol-qol,
Tez-tez, yol-yol,

Çox-çox, bol-bol
bölün məni, nəvələrim.
Ha axtarsın, tapammasın
Ölüm məni, nəvələrim!

*13 avqust 2011-ci il*

## Nəvəm Arzuya

Bənövşədən ətirli
Arzu.
Qərənfildən xətirli
Arzu.

Nəfəsin ilk baharda
əsən meh kimi
Göz yaşın yanağına
düşən şeh kimi.

Aydan arısan, Arzu.
Sudan durusan, Arzu.
Babanın anasısan
Atanın nənəsisən,

Ana arzularından
toxunmuş xalı Arzu.
Nənənin dağ çiçəyi
arısı, balı-Arzu.

*15 noyabr 2017-ci il*



*Soldan sağa: Birinci sırada – Tuncər, Aylin, Arzu (qız nəvəm).
İkinci sırada Nəsrin. Zülfiyyə (gəlinim), Şahin (oğlum), özüm,
Təranə (ömür-gün yoldaşım), Yeganə (qızım)*

## Oy!

*(Almas İldırımn "Əsir Azərbaycan" şeirini içdən gələn səsi ilə ifa edən, Urmiya yaxınlığında – Sulduzda doğulub, 1990-cı ili Bakıda yaşayan Araz Elsəsə həsr edirəm)*

Araz Elsəs, səsin məni göynədir!
Bilirsənmi göynətdikcə neynədir?
Gah dırnaq, gah təpəm üstə oynadır!
Qıyya çəkir içimdəki dərdim, oy!
Ovça çalsın, şıtka vursun mərdim, oy!

Keçiləsi çaylar var ki, keçilmir!
İçiləsi bulaqlar var, içilmir!
Yurd kiçilir, yurd ağrısı kiçilmir!
Öz başıma döyüb durdum, yurdum, oy!
Öz bürcümü öz əlimlə burdum, oy!

Elə çaldın, sazın bağrı çatladı.
Hayqırtından başım-beynim partladı.
Elə bildim, üstümdən dağ adladı
Yapışdığım yerdə qalıb durdum, oy!
Hanı mənim sanqa-sanqa ordum, oy!

Göz üstünə hər qaranı qaş etdik.
Baş yerinə başsızları baş etdik.
Əlimizlə başımıza daş etdik.
Yol göstərib ulamadı qurdum, oy1
Öz yolumu özgələrdən sordum, oy!

Yatan bəxtim, vaxtdır, oyan, dur daha!
Haqsızlığa haqq divanı qur daha!
Qiyamətdir, qoy çalınsın sur daha!
Qolumdakı qandalları qırdım, oy!
Səbr eləyib səbrimi də yordum, oy”

*13 iyun 2019-cu il*

## Təsəlli

*(Həyat yoldaşı Lamaranın vəfatından təsirlənən gürcü şair Giya Paçxataşviliyə)*

Səhərlər gün çıxar, Paçxataşvili,
Axçamlar gün batar, Paçxataşvili!
Gecələr Ay ilə, ulduzlar ilə
Bizləri aldadar, Paçxataşvili!

Ağlama, ağlama, Paçxataşvili!
Bu dünya belədir, bu dünya belə.
Ona bel bağlama, Paçxataşvili!
O, bir gün səni də verəcək yelə.

Ağrıma, ağrıma, Paçxataşvili!
Keçilən, gedilən yollar ağrıyar.
O süslü tabutu alıb çiyninə,
Torpağa tapşıran qollar ağrıyar.

Ağırdır, ağırdır, Paçxataşvili!
Ağırdır sevimli qadın itkisi.
Hər gün üz tutduğun evin, ünvanın,
Hər gün çağırdığın adın itkisi.

Yaman zərbə aldın, Paçxataşvili!
Lamara ömrünün sonuncu ili
Zərif əllər ilə çəkilən çaxır
İçilməzdən əvvəl torpağa axır.

Toxta, özünə gəl, Paçxataşvili!
Gör ki, necə susur evlər, qapılar.
Yenə də geyilmək istəyir deyən
Eyvanda cütlənmiş ayaqqabılar?

Bəlalı başını sığallayacaq
O zərif, o incə əl yoxdur daha.
Sənə səhər-axşam təsəlli verib,
Könlünü alacaq dil yoxdur daha

Karıxma, keyləşmə, Paçxataşvili!
Axı, kim siləcək göz yaşlarını?
Kim çay süfrəsinə dəvət edəcək
Sənin dostlarını, yoldaşlarını?

Ha çağırır, ha bağırır, Paçxataşvili!
Gələnin gəlsə də, gedənin gəlməz.
Evindən çıxanda: – Yaxşı yol! – deyib,
Dalınca dualar edənin gəlməz.

Səhərlər gün çıxar, Paçxataşvili!
Axşamlar gün batar, Paçxataşvili!
Gecələr Ay ilə, ulduzlar ilə
Bizləri aldadar, Paç-xa-taş-vi-li!!!

*Bax. "Şəki Bələdiyyəsi" qəzeti*
*17 may 2014-cü il, səh.24.*

## Dr.Prof. Rəhim Əliyevə

Yaşın mübarək olsun,
çünki 60 yaşın var.
Yaş tərpədə bilməyən,
dağdan ağır daşın var.

Ağsaçlı Qafqaz kimi
qarşımda dayanmısan.
Buz bağlayan kipriyin,
qırov tutan qaşın var.

Üzünə nur düşübdür
qəlbindəki Günəşdən
Yenilməyən iradən,
əyilməyən başın var.

Səma kimi işıqlar
içindəsən daima.
Torpaq kimi laybalay,
qatbaqat yaddaşın var.

Anadan olmusan ki,
beyninlə, ürəyinlə
Pozulmayan dostluğun,
bitməyən savaşın var.

Dünya ki var, əzəldən
mərdlərin dünyasıdır.
Vaqif Aslan adında
Şəkidə qardaşın var.

*02 noyabr 2010-cu il*

***Bax. "Ədəbiyyat naminə" qəzetinin Dr.Prof. Rəhim Əliyevə həsr edilmiş xüsusi buraxılışı, noyabr, səh.8.***



*Həkim dostlar və dostlar arasında. Soldan sağa doğru: Arif – taksi sürücüsü, Vaqif Ramazanov – iş adamı, Niymət həkim, Kamran həkim, Maarif həkim, Vaqif Aslan, Çingiz – elektrik mühəndisi (ad gününə yığışdığımız insan), Zahid həkim, Fərhad – iş adamı, Aslan – iş adamı*

## Ey həkim!

*(Həkim dostlarıma ithaf edirəm)*

Eşqdən canımda bir pünhan mərəz var, ey həkim!
Xəlqə pünhan dərdimi izhar etmə, zinhar, ey həkim!

Gər əl basıb nəbzimə, təşxis qılsan dərdimi
Al əmanət, qılma hər bidərdə izhar, ey həkim!

## M.Füzuli

Əmanətdir insan üçün Tanrı verən can, ey həkim!
Nə sözümü inkar elə, nə özümü dan, ey həkim!

O leykosit, ertrosit sayanları min yaşasın!
Nəcabətdən gələn şeydir damardakı qan, ey həkim!

Rentgen, lazer işığında baxanlardan sual etdim:
– Görünürmü o işıqda gəda ilə xan, ey həkim?

Qan tökürlər şişə-şişə, dağıdırlar şüşə-şüşə...
Ədalətdən danışanlar haqdan keçib yan, ey həkim!

Mən şairəm, sən həkimsən, nə vecinə kimin kimsən...
Bu zamanda işə keçmir kimlik, şərəf-şan, ey həkim!

Sözü sağsan, üzü ağsan, el yanında uca dağsan...
Ümid ilə üz tutur, bax, sənə hər insan, ey həkim!

Şəfa səndə, səfa səndə, öz əhdinə vəfa səndə!
Səni Loğman hesab edir bu Vaqif Aslan, ey həkim!

*20 mart 2021-ci il*

## Yaz! Yazma!

*(Gəncəli dostum Adil Əsgərov yayı yaylaqda keçirməyi çox sevir. Məni də dəvət etməyi unutmur. Məndən məqbul cavab almadıqda “səndən şikayət yazacağam” deyir. Mən də ona zarafatla belə cavab verirəm.)*

Yazsan məndən şikayət,
deyim sənə hara yaz.
Hörmətli Xaçbulağa,
möhtərəm Qoşqara yaz.

Hər yay ora gedirsən.
İstirahət edirsən.
Olsun, xətrin xoş olsun.
Ye, iç, sənə nuş olsun.
Kiş kəndində mənim də
şirin çay, pendirim var.
Bilmirəm nə səbəbdən
bizlərdə qiymət artıb...
Sizlərdə endirim var?
Yəqin məni gözləyir
xoruzuzboynu çay dolu
stəkan nəlbəkidə.

İlişmişəm, qalmışam
neynəyim ki, Şəkidə.
Qiymətlərin artımı
mənə yaman qəsd edib.
Sənisə yaylaqların
çiçəkləri məst edib.
Ayılsan, görsən ki, sən
gəlməmişəm, qardaşım.
Bil ki, qarışıb başım.
Ürəyim saf, sözüm saf...
Qardaşım. eylə insaf
Saxla şikayətini.
Mənim hekayətimi
Yada-yalana yazma.
Döngə-dalana yazma.
Tütək çalmaqdan bezib,
zurna çalana yazma.
Deyim sənə hara yaz.
Hörmətli Xaçbulağa,
möhtərəm Qoşqara yaz.

*19 iyul 2021-ci il*



*Adil müəllim rəhmətlik dostu Füzuli müəllimlə birlikdə*
*Şəkidə – Kiş kəndində qonağımızdır*

## Dostum

*(Nüsrət Musa oğluna)*

Küsməklə iş düzəlirmi?
Tez inciyib küsən dostum!
Düzlə əyri düz gəlirmi?
Ürəyimi üzən dostum!

Əməl solmaz çəmənlikdir.
İş halal süd əmənlikdir.
Sən cavansansa, sənlikdir
Lalə, nərgiz, süsən, dostum.

Heç gördünmü xeyri şərsiz?
Sən günahsız, mən xəbərsiz.
Kimdir, axı, dərdsiz, sərsiz?
Əzablara dözən dostum!

Vaqif Aslan nələr çəkdi.
Şər biçdikcə xeyir əkdi.
Ona daim dost gərəkdi.
Səmalarda süzən dostum!

*08 dekabr 2021-ci il*

## Dostum Barat Əli oğlu Abdullayevə Novruz təbriki

Əziz Barat, ilin, ayın mübarək!
Novruz gəlir, yazın, yayın mübarək!
Olanların olub uca Tanrıdan...
Bayram payın, ömür payın mübarək!

Harda oldun, Tanrı tutdu qolundan.
İbrət dərsi aldın sağın-solundan.
Yol gördün ki, yetmiş yeddi şaxədir...
Gözəl deyil amma ki, öz yolundan.

Yarananda halallıqdan yarandın.
Öz məsləkin, öz məramın, öz andın.
Qopub gəldi ürəyindən nəğmələr...
Yerdən göyə körpü olub dayandın.

Səsli, sözlü dillər ilə tanışdın.
Rənglər ilə rəng dilində danışdın.
Dilbilənlər sənə doğma oldular...
Cəfənglərlə cəng dilində danışdın.

Oğlun, qızın işıq olsun gözünə.
Yaxşı-yaxşı muğayat ol özünə.
Bir yarı-sən, bir yarı da yarındır...
Şəkk eyləmə Vaqif Aslan sözünə!

*19 mart 2021-ci il*

## Salam, Çələbi babam

Salam, Çələbi babam, qəbrin dolsun nur ilə!
Qarşında dayanmışam fəxr ilə, qürur ilə.

Bu dünya yaranışdan mərdlərin dünyasıdır...
Xoşdur üz-üzə durmaq mərd ilə, məğrur ilə.

Əyri çaydan düz keçib, Kürdən adlamağın var.
Xaini, xəyanəti iki qatlamağın var.

Arazla arazlaşıb,
Düzəlib tarazlaşıb,
Kürlə kürləşən babam!

Təbrizdə, Borçalıda
şəhər-şəhər toplanıb,
kənd-kənd birləşən babam!

Sən mənim vətənləşən, torpaqlaşan babamsan
Göyərib budaq-budaq, yarpaqlaşan babamsan.

*24 iyun 2013-cü il*

## Ali Baş Komandanım!

Bu yerin, bu yerişin,
bu duruşun mübarək!
Bu ləngərin, səngərin,
bu vuruşun mübarək!
Ali Baş Komandanım!

Şəhid cənazəsindən
könlü açılanları…
Ağzından zəhər damıb,
əzvay saçılanları…
Əlsizi, ayaqsızı
gəmirib yeyənləri…
Qarnı doyandan sonra
mələyəm deyənləri…
Öz qınına qoy indi!
Gözünü qan örtənin
gözlərini oy indi!

Xankəndini, Şuşanı
göynəyən yarama bas!
Qalx, İsa bulağının
nəğməsinə qulaq as!
Yollarını gözləyən
ellərimi salamla!
Çəmənimə sığal çək,
çöllərimi salamla!

Çaylarıma qoşul, ax,
göllərimi salamla!
Ali Baş Komandanım!

Bu işıqlı dünyaya
illər boyu kor baxan…

İnsanlığa xor baxan
iblisləri vur indi!
Xəbisləri, pisləri,
ən pisləri vur indi!

Yollarını gözləyən
dağın-daşın eşqinə!
Bu qaçılmaz, müqəddəs
haqq savaşın eşqinə!
Mayası turşları vur,
bətni şoranları vur!
İnsan sümüklərindən
ilik soranları vur!
Ali Baş Komandanım!

Əmrinə müntəzirdir
Azərbaycan ordusu
Halal olsun deyirəm
sənə bu torpaq, bu su!
Ananın südü kimi,
atanın çörəyitək!
Qarabağ üzərində
dalğalanın bayrağın
Ana Azərbaycanın
Ata Azərbaycanın
döyünən ürəyitək!
Ali Baş Komandanım!
Zəfərin də mübarək!
Qələbən də mübarək!

*05 oktyabr 2020-ci il*

***Bax. "Ədəbiyyat qəzeti". 10 oktyabr 2020-ci il. Şənbə, 45 (5273) Səh. 18.***
***Bax. "Ədalət" qəzeti. № 169 (5829), 24 dekabr 2020-ci il, səh.4.***
***Bax. "Şəki Bələdiyyəsi", № 11(193), 1-14 noyabr 2020, səh.14.***

## Tehran ƏLİŞANOĞLU

*Ədəbiyyatda Ali Baş Komandan*

**(Məqalədən fraqmentlər)**



**Ali Baş Komandan obrazı ədəbiyyatımıza 2016-cı ilin Aprel döyüşləri ilə gəldi:**

Vur, əsgərim, vur! – deyə
əmr eləyir Komandan...
**(Sabir Rüstəmxanlı, "Qarabağa dönüş" poemasından – ƏQ, 24 dekabr 2020**)

Hər sözünə deyirik: "Bəli!" Baş Komandanım!
Hər əmrinə hazırıq Ali Baş Komandanım!
**(Barat Vüsal, „Ali Baş Komandana"
– ƏQ, 13 mart 2021**)

...Zabitlər çıxmaz əmrdən,
Yumruğun var dəmirdən,
Ali Baş Komandanım!
**(Abuzər Turan, „Zəfər nəğməsi“**
**poemasından – ƏQ, 24 dekabr 2020)**

Əmrinə müntəzirdir Azərbaycan Ordusu,
Halal olsun deyirəm Sənə bu torpaq, bu su,
Ananın südü kimi, atanın çörəyitək
Qarabağ üzərində dalğalansın bayrağın
Ana Azərbaycanın, Ata Azərbaycanın
döyünən ürəyitək
Ali Baş Komandanım...
**(Vaqif Aslan, ƏQ, 10 oktyabr 2020)**

Müharibə dövrlərində, görünür ki, elə belə də olur: „Prezident çıxışları da Ədəbiyyatdır. Sözün gur səsləndiyi, özü olduğu Ədəbiyyat. İctimai şüuru bir nöqtəyə cəmləyən, səfərbər və ifadə edən Ədəbiyyat...“

**(T.Əlişanoğlu, „Qalibiyyət və ədəbiyyatın dərsləri“**
**– ƏQ, 12 dekabr 2020)**

27 sentyabr – 10 noyabr 2020, 44 günlük Vətən müharibəsi zamanı, Ali Baş Komandan Obrazını topluma, millətə və dünyaya səslənən çıxışlarında Ali Komutanın özündən gözəl, özəl, əzəl göstərən, təqdim edən, yaradan olmadı... Bu Sözü „tarixi qələbəmizi heç kimin təsəvvür edə bilməyəcəyi layihə gücündə həyata keçirən bir Lider işlətdi – Sözümüzün Ali Baş Komandanı!..“

**(Nizami Cəfərov, „Sözümüzün Ali Baş Komandanı“**
**– ƏQ, 14 noyabr 2020)**

… Ədiblər bu yüksəlişi milli-tarixi enerjinin oyanışına yozur və yazır: „Qədim türk dilində gözəl bir ifadə var – Eltəriş. Bu adı səpələnmiş yurdları bir mərkəz ətrafında birləşdirib dövlət quran xaqanlara verərdilər.

Bu mübarək yerişin, bu duruşun mübarək,
Bu ləngərin, səngərin, bu vuruşun mübarək,
Ali Baş Komandanım...
**(Vaqif Aslan, ƏQ, 10 oktyabr 2020)**
…………………………………………..

Ali Baş Komandan qürurla bu dəm
Çevrilib üz tutdu Xudafərinə.
Bizim gözümüzdə dəyişdi aləm
Dilimiz çevrildi min afərinə...
**(Vaqif Aslan, ƏQ, 12 dekabr 2020)**

Vətən müharibəsinin hər var günü, haqq günü Ali Baş Komandan alqış yiyəsidir:

...Alqışlar, alqışlar, alqışlar ona!..
**(Vaqif Aslan, ƏQ, 12 dekabr 2020)**

Alqış qazilərin, ordumuzun,
Dağ titrədən gur səsinə.
Alqış xalqımızın, yurdumun
Alov saçan nəğməsinə, nəfəsinə,
Bu xalqın sərkərdəsinə.
İlham sənə, alqış sənə!
Böyük Azərbaycan
Qalxıb ilk pilləsinə.
Azərbaycan alqış sənə!
**(Fikrət Qoca, ƏQ, 24 dekabr 2020)**
…………………………………………………………

"Ədəbiyyatda Ali Baş Komandan" məqaləsi başlıcası "Ədəbiyyat qəzeti"nin materialları əsasında qələmə alınmışdır. Yazını zənnimcə qəzetin baş yazarı Azər Turanın narahat düşüncələri ilə sonuclamaq da daha doğru olar: "...Ədəbiyyatımız millətimizi dünyada tanıda bilməsə də, qırx dörd gündə ordumuz onu dünyaya

təqdim etdi. Kaş ki, müzəffər Ali Baş Komandanımızın yanında da Atatürkün çevrəsində olduğu kimi, azərbaycanlı bir Mehmet Akif Ərsoy olaydı...”

**(Azər Turan, “Tanrının evi – Türk Qarabağ və Bir hilal uğruna batan günəşlər”. – ƏQ, 14 noyabr 2020)**

## Salam, Əsgər Tanrıkut!
## Tanrıkut Əsgər, salam!

Salam, Əsgər Tanrıkut!
Tanrıkut Əsgər, salam!
Sən Tanrının zalıma
qırmancısan, vəssəlam!

Kəsəndə işıq kimi,
əsəndə yel kimisən.
Çaxanda şimşək kimi,
axanda sel kimisən.

Damar-damar birləşib
türkün qeyrəti səndə.
Qğuz, qıpçaq saflığı,
qarlıq heyrəti səndə.

Başqurd, çuvaş, telengid
diləyir uğur sənə.
Əl edir tatar, tuvin,
qarağac, uyğur sənə.

Salam, Əsgər Tanrıkut!
Tanrıkut Əsgər, salam!
Ədalətin bükülməz
biləyisən, vəssəlam!

Alpər Tonqa demişdir:
– Olsan doğru ol, düz ol!
Yurd-yuva əmanəti!
Oda-ocağa göz ol!

Mətə xan söyləmişdir:
– Türk yağıya yedilməz!
Can fəda edilsə də,
torpaq fəda edilməz!

Bilgə xaqan ayıtmış:
– Özün-özünü bölmə!
Bölüm-bölüm bölünüb
ayaqlar altda ölmə!

Salam, Əsgər Tanrıkut!
Tanrıkut Əsgər, salam!
Sən yıxılı evlərin
dirəyisən, vəssəlam!

Türk qanına boyanan
çaylar da gəlir dilə
– Göy hələ basılmayıb,
dəlinməyib yer hələı!

Erməni süngüsündə
çabalayır körpələr.
Sınıq körpülər sənə
söyləyəcəkdir nələr!
Əsir daşlar tökərək
gözündən yaşlar sənə
Hər addımda bir yeni
hekayət başlar sənə.

Salam, Əsgər Tanrıkut!
Tanrıkut Əsgər, salam!
Sən haqqın, insanlığın
gərəyisən, vəssəlam!

Daşlar altından çıxan
bir çağa əli gördüm.
Sən əl verdin o ələ,
mən onu, bəli, gördüm!

Hayes canı saxlanan
şüşə var, əllərdədir.
Gör, hansı ölkələrdə,
gör, hansı ellərdədir.

O şüşəni qır belə!
Yeni dünya qur belə!
Düzlüyün, həqiqətin
keşiyində dur belə!

Salam, Əsgər Tanrıkut!
Tanrıkut Əsgər, salam!
Haq da var, divan da var!
Söz sənindir, vəssəlam!

Öldürür insanlığı
insan əti yeyənlər.
İmanı, əqidəni göy
əskiyə düyənlər.

Şeytan, iblis, ifritə
Tanrını təkləyibdir.
Qiyamət deyilən gün
tamam gerçəkləyibdir.

Salam, Əsgər Tanrıkut!
Tanrıkut Əsgər, salam!
Qabaqda Qılkörpü var,
keçməlisən, vəssəlsm!

*21 oktyabr 2020-ci il*

***Bax. "Ədəbiyyat qəzeti" 24 oktyabr 2020-ci il.Şənbə № 46 (5272). Səh.7.***
***Bax. "Ədalət" qəzeti. №11 (5843) 30 yanvar 2021.Səh.14.***
***Bax. "Şəki Bələdiyyəsi", № 11(193), 1-14 noyabr 2020, səh.14.***

## Anam, mən şəhid oldum…

Anam, mən şəhid oldum…
Şəhidlik necə olur?
Mən ona şahid oldum!

Yurduma qurban oldum
şirin canımla, anam!
Suvardım torpağımı
qızıl qanımla, anam!

Şahanə dur, şax dayan,
sil gözünü, ağlama!
Oddan paltar gey, anam,
qürurlan, yas saxlama!

Anam, xeyir-dua ver,
qisasımız alınsın!
Yurdun hər addımında
zəfər marşı çalınsın!

Sancılsın bayrağımız
qanımız axan yerə!

Toqquşduqca mərmilər
şimşəklər çaxan yerə!

Onda qanım tökülən
torpağa qoyaraq baş
Ağlarsan hönkür-hönkür,
sızlarsan yavaş-yavaş!

Alındıqca halallıq
torpağımdan, daşımdan.
Anam, göyərəcəyəm
mən sənin göz yaşından!

*19 sentyabr 2020-ci il*

***Bax. "Ədəbiyyat qəzeti" 3 oktyabr Şənbə, 44 (5272) Səh. 9.***
***Bax. "Ədəbiyyat qəzeti" 24 oktyabr 2020-ci il.Şənbə № 46 (5272). Səh.7.***
***Bax. "Ədalət" qəzeti. №11 (5843) 30 yanvar 2021. Səh.14.***

## XUDAFƏRİNLƏR
## və yaxud
## Tariximizdən gələn səslər

*(Hüquqşünas dostum Adil Əsgərovun sevincək zəngindən doğulan düşüncələr)*



**I**

Bu səhər zəng etdi Adil müəllim
Dostluqda mərdanəm, mərdlikdə bəllim.
Dedi: – Salamlar var sənə Gəncədən.
Gözün aydın olsun amma öncədən.

Şanlı ordumuza min afərinlər!
Azad edilibdir Xudafərinlər!
Bu taydan o taya onlar yoldular.
Sahilləri qucan qoşa qoldular.

Gözəl görünürlər Arazın üstə.
Bu günlər, elə bil, sığal çəkirlər
Sinəmi göynədən avazın üstə.
O vaxtdan nə qədər fəsillər keçib...
Fəsillər nədir ki, əsrlər keçib...

Hamıya deyilmir “xoş gəldin” sözü...
Ondan nanəsillər, əsillər keçib.
Bu arxı bir az da vurum dərindən...
Deyim kimlər keçib Xudafərindən.

Keçib bu körpüdən övliya, hacı...
Hər biri xalqının başının tacı.
Alpər Aslan keçib ondan, qardaşım.
Onda çiçəkləyib torpağım, daşım.

Məlik şah Səlcuqi keçibdir ondan.
Tarix fəxr etməzmi biçdiyi dondan?
Bu adlar saymaqla bitməz ki, bitməz.
Daş qoyulan yerin yaddaşı itməz.

Böldüm sevincimi Azər Turanla...
Gördüm, bəs etmir.
Danışdım Eynulla qardaşımızla...
Sevinci bölməyə kim həvəs etmir?

Varsa da, yoxsa da... xoşbəxt kimsədir
Yaxşılıq eləyib ləzzət alanlar.
“Ürəkdən-ürəyə yollar” çəkənlər...
Sahildən-sahilə körpü salanlar.

Əzəmət tökülür aşrımlarından...
Birində on beşdir, birində on bir.
Tarixlər süzülür şırımlarından...
Vurur insanları zəhmi min ildir.

Qartal caynağıdır daş sütunları...
Qayalar üstünə sancılıb durur.
Gəlsəydin, görərdin sən də bunları...
Daşlaşıb bu yerdə əzəmət, qürur.

Uludur yaşıyla, ay-illəriylə...
Zamana sığmayır şöhrəti, şanı.
O vaxtdan tutaraq daş əlləriylə
Qoymur ayrılmağa Azərbaycanı.

**II**
Teleekranlara dikilib gözlər
Baxır Cəbrayıla sonsuz maraqla.
Baxdıqca közərir içimdə közlər...
Dostum, yaddaşını sən də varaqla.

Hanı bəs, hanı bəs o məşhur çinar?
Cəbrayıl nə vaxtdan daş topasıymış?
Kimin fitvasıyla, istəkləriylə
Başına bu boyda göy qopasıymış?

Yıxılıb yaşından, qocalığından...
Vaxtından, taxtından, ucalığından...
Qalıb quru yerdə şəhid ağaclar...
Ey nəfsi itilər, gözləri aclar!

Həmin ağacların kötüyü durur...
Hər kötük üstündə neçə ildir ki,
Bozarıb qalan kül örtüyü durur!

Axı, siz kimsiniz, bayquşmuşsunuz?
Yox imiş sizlərə qanun, tabular?
– Sizdən nə qaldı ki?
– Yanıq divarlar!
Şəhid pəncərələr, şəhid qapılar!

Bu nə görüntüdür, mənzərədir bu?
O kimdir torpaqdan intiqam alıb?
Keçilməyən körpü, içilməyən su,
Biçilməyən zəmi onlardan qalıb.
– O kimdir?
– Əhrimən, aram, xayesdir!
Vandaldır, manyakdır, “es”dir,
“eses”dir!
Ay erməni, erməni!
Götürməz bu yer səni!
Bunu kimsə deyibdir.
Çünki erməni olmaq
insanlığa eyibdir.

**III**
Whatsap çıxaran kişiyə əhsən!
Qoşulur söhbətə Enulla qardaş.
Erməni dediyin bilirəm ki, mən
Nə qardaş tanıyır, nə də ki, yoldaş.

Keşişi təzədən dən “Bibliya” yazır...
Yazır, yazdığının içində azır.
Bir dərin, bir dibsiz quyu içində
Türkesə, türkesə quyular qazır.

Burda Azər Turan çatdı qaşını
– İki yüz ildir ki, çalışır onlar.
Görüncə daşın da daş yaddaşını
Hirs ilə, qəzəblə alışır onlar.

Deyin, kimlər bölüb Xudafərini?
Gedəni-gələni hara olubdur?
Onun qəlbindədir dərdin dərini...
Sinəsi bu dərddən yara olubdur.

Üstündən yerimir karvanlar nədən?
Nədən yoxa çıxıb sarvanlar, nədən?
Bu da Xudafərin... Tən ortasında
Üçrəngli bayrağım dalğalanır, bax!
İki yüz ildir ki, torpağım kimi
Körpüm də ikiyə bölünübdür, ax!

Bizim üstümüzə şəkləndi xaylar
Yadlara yalanan xanlara görə.
Gözyaşı tökmədi "şanlı" saraylar
Yurda qurban gedən canlara görə.

Nədəndir uzanır bu iki yüz il?
Hələ də bölürlər bizi yağılar.
Mənim dediklərim əfsanə deyil.
Yiyəlik etməsən, yurd da dağılar.

Çatdı Peterburqa Qriboyedov
Əlində Türkmənçay müqaviləsi.
Onu çar Nikolay basdı bağrına...
Dedi: – Bu dünyada yoxdur beləsi!

Onda göyə tutdu ağzını toplar ...
Açıldı iki yüz yaylım atəşi.

Sırındı bizlərə yalanlar, goplar...
Əyilən ağızlar söylədi: – Əşi!

Yenə Eynullanı fikir apardı:
– Amma səfir olub Qriboyedov
Qayıtdı İrana, rütbəsi vardı..
Kim gələ bilərdi orda ona dov?

Həm də bir erməni var imiş orda...
Adından, dinindən imtina etmiş.
Hərəm ağaqsıymış ... Soruş da, sor da!
O Qriboyedovun yanına getmiş.

– Mənə Mirzə Yaqub xan deyir hamı.
Amma ki, amma ki, Markaryanam mən.
Sən mənə dayaq dur, sən məni tanı!
Onda görərsən ki, necə canam mən!

Hesab olunuram şahın arvadı...
Mən hərəmağası olandan bəri.
Sən mənim üstümdən götür bu adı
Satma müslimlərə erməniləri.

"Ağıldan bəla"nı yazan səfirin
Bəlası xayesdən gəldi, nə gəldi!
Ağlı birdən-birə azan səfirin
Cumub müctəhidlər bağrını dəldi.

Nəşini yol boyu sürüdülər də.
Varını, yoxunu zir-zibil kimi
Silib süpürdülər, kürüdülər də.

Adil müəllimin tövrü dəyişdi:
– Xayeslər kabuslar, kölgələr kimi.
Onlar ki, boyaqtək bir yerə düşdü
Hər yerə yayılır ləkələr kimi.

Şeytan nəfəsidir nəfəsləri də...
Toxunsa yarpaqlar, otlar bürüşür.
Allaha üsyandır həvəsləri də ...
İman gözdən düşür, din gözdən düşür.

Onlardır, onlardır, deyirəm onlar!
Onlar – əsrimizin primatları!
Oğurlq donlardır geydiyi donlar!
Oğurluq adlardır xayes adları!

**IV**

Yenə zəng elədi Adil müəllim
Dostluqda mərdanəm, mərdlikdə bəllim.

Dedi: – Diqqətlə bax teleekrana!
Ali Baş Komandan Cəbrayıldadır!
Alqışlar, alqışlar, alqışlar ona!
Gör – nə həyəcanda, gör – nə haldadır!

Düyüb yumruğnu, durub şəst ilə...
Qalib ordumuza eşq olsun deyir.
Bu günün havası bu gündən belə
Gələcək günlərə məşq olsun deyir.
Qalib xalqımıza eşq olsun deyir.

Kiminsə eviydi bu daş topası...
O məzar kiminsə məzarı idi.
İnsanın başından çıxır lopası...
Bu azar erməni azarı idi!

Bu qudurğan yağı, bu azğın yağı
Nə qədər miskindir, nə qədər düşük!
Qoy xalqım bilsin ki, ana torpağı
Alaq otlarından təmizləmişik!

Düşmənin burnunu ovduqca ovduq!
İt kimi gəlmişdi,.. it kimi qovduq!

Arxalı köpəklər arxası olan
Dövlətlər, ölkələr bunlara baxsın!
Haqqın şimşəkləri bu gündən belə
Haqsız olanların başında çaxsın!

**V**
Ali Baş Komandan qürurla bu dəm
Çevrilib üz tutdu Xudafərinə.
Bizim gözümüzdə dəyişdi aləm...
Dilimiz çevrildi min afərinə.

Gördük ki, Araz da sevincək axır.
Dikəlib bir az da Xudafərinlər.
Bizə haqsevənlər sevgiylə baxır...
Deyirlər: – Sizlərə min afərinlər!

Bu görüş adi bir görüş deyildir!
Prezident-körpü görüşüdür bu!
Dövlətin xalq ilə verib əl-ələ
Birlikdə birliyə yürüşüdür bu!!

*07 dekabr 2020-ci il*

***Bax. "Ədəbiyyat qəzeti", 12 dekabr 2020-ci il. Şənbə № 56 Səh.26***

## Bir səndən razıyam, vətən

Mən şəhid olmadım, qazi olmadım...
Amma ki, şəhidəm, qaziyəm, vətən.
Heç vədə özümdən razı olmadım...
Oldumsa, bir səndən razıyam, vətən.

*7 dekabr 2020-ci il*

## Şəhid

Başının baş daşı olmayan şəhid!
Vətənin daşları bəsin deyilmi?
Gözünün göz yaşı olmayan şəhid!
Göyün göz yaşları bəsin deyilmi?

*02 aprel 2017-ci il*

## Şəhid köynəyi

Dəstə-dəstə, qoma-qoma,
Tanrıya göz yuma-yuma,
bazarlara Cuma-Cuma
mal axtaran arxadaşlar,
mal qurtarıb.
Özgə verən tuman-köynək,
şal qurtarıb.
Ət qaxacı, şəkər tozu,
yad verən adyal qurtarıb.
Bircə şəhid köynəyi var,
verəmmərəm onu sizə.
Geysəniz də, dar gələcək
əyninizə.

Didərginin tikəsini
yeyənlərim.
Millətimi soyundurub,
Köynəyini geyənlərim!
Bazarlara yol axtaran
bagrıdaşlar,
a soydaşlar,
a yoldaşlar
yol qurtarıb!
Yaşamaga yarpaq, budaq,
Kol qurtarıb.

Bircə şəhid köynəyi var,
Necə qıyım onu sizə?
Eybinizi örtmək üçün
Çəkəsiniz əyninizə?!

Kəfən deyil –
Qandan baha, candan baha
köynəkdi bu!
Şivən deyil –
göz dağıdı, lal fəryadlı
göynəkdi bu!
Əlvan deyil,
bir üzlüdü,
bir ipdəndi,
bir rəngdi bu!
Mənsəb gəzən,taxt axtaran
taxtabaşlar,
Gəzdiyiniz hal qurtarıb.
Şirin nağıl, yalan vədə
Heç dəyməyib, kal qurtarıb.
Doğru sözə, düz ilqara
qismət olan
buxov, noxta,
nal qurtarıb.
Satılmayan namus, həya,
satlıq qoyun, mal qurtarıb.
Şor quruyub, yağ tükənib,
bal qutarıb.

Bircə şəhid köynəyi var,
O da mənim.
Qalan nə var...sizin olsun.
A qandaşlar,
qarındaşlar!

Təkcə isti qan çilənən
köynəkdəki
O qan mənim,
qada mənim!

*18 iyul 1994-cü il*

## Mən türkəm

Oğuz mənəm, qıpçaq mənəm,
qarlıq mən.
Bu uruklu, bu turuklu
varlıq mən.
Kumuk, xakas, barabin mən,
tarlıq mən.

Mən – Məshəti, Qaraqalpaq,
Oryat, Meşaram.
Mən – Qaqauz, mən – Karaim,
Çuyam,.. yaşaram.

Mən – Qu kişi, mən – Kumandin,
Suyam,.. daşaram.

Siu da – mən, Dakota da,
Mayya da hələ.
Ey Əratta, ey Günana,
işıq, nur ələ.
Mən Teleut, Qaşqay, Xalac,
Əfşaram elə!

Mən bir dünya ağacıyam,
ocağam, pirəm.
Tanrıkutam, o bir olan

Tanrımla birəm.
Köklərimdə həyat suyu,
kölgəmdə İrəm.

Pestin kiji, Noqay, Saqay,
Aba – mən.
Kaçin, Saka, Apaçi mən,
Tuba – mən.
Türk oğul – mən, türk ata – mən,
baba – mən.

Mən tərpənsəm, Yer tərpənər
Göy tərpənər yerindən.
İnsan bacı, insan qardaş,
dur, nəfəs dər dərindən.

Türkəm mən!
Börksüzlərə –
börkəm mən!
Kürksüzlərə –
kürkəm mən.
Türkəm mən!
Türkəm mən!

*09 may 2021-ci il*




*Şuşa, 29-31avqust 2021-ci il*

## I
## Gediş

Karvan yola düşür üzü Şuşaya...
Yolları gözümə yığıb gedirəm.
Elə bil, bu böyük şəhərdən deyil,
Elə bil, özümdən çıxıb gedirəm.

Keçirəm Salyandan, Biləsuvardan
Bu yerdə burulur yol İmişliyə.
Bizdən şanlı-şanlı salamlar olsun
Qovunlu, qarpızlı, yer-yemişliyə!

Beyləqandan sonra Füzuli yolu...
Gedirəm, dəyişir gözümdə dünya...
Çöldür, biyabandır yolun sağ-solu...
Olubdur, gör, hansı dözümdə dünya!

İnsi yox, cinsi yox, ev-eşiyi yox...
Baxırsan, hər tərəf daş topasıdır.
Dolu beşiyi yox, boş beşiyi yox...
Burda yer yarılıb, göy qopasıdır.

Erməni rüzgarı əsibdir burda...
Yerləri, yurdları yalayıb keçib.
Arxalı köpəklər quduz it kimi
Otu, alafı da dalayıb keçib.

Bu da Zəfər yolu... Baş əyirəm mən.
Ağrımı, acımı udub gedirəm.
Yanar ürəyimi çəkib sinəmdən
Əlimdə bayraqtək tutub gedirəm.

Qalxır Zəfər yolu arandan dağa...
Bu yol sarma-sarma, dolay-dolaydır.
Dağlarsa bənzəyir yamyaşıl tağa...
Qalxırıq,.. enirik... Hələ ki, yayadır.

Burda aşılası dağlar birmidir?
Beşmidir, onmudur? – Bilənlər bilir.
Torpaq ziyarətgah, torpaq pirmidir?
Durub səcdəsinə gələnlər bilir.

Qəlbi bu yerlərdə vuran analar!
Nələr var qarşıda, nələr var, nələr!
Papağı başından uçan binalar...
Gözləri oyulmuş kor pəncərələr.

Xocavənd uzaqdan görünür, baxın!
Hələ Zəfər yolu eləyir davam...
Nə var ki, insana torpaqdan yaxın?
Salam, doğma suyum, torpağım, havam!

Şuşam bir şəhərdir dağlar başında...
Özü şüşədəndir, səngəri – daşdan.
Qartaldır dayanıb qaya qaşında...
O, qalib çıxıbdır qanlı savaşdan...



Heyrətə gələcək desəm hər kimə...
Səksənməsin deyə güllə səsindən.
İgid əsgərimə, mərd əsgərimə
Qayalar yol verib daş sinəsindən.

Qızılı bir payız günü Şuşada
Açılıb qızılı bir səhər, Allah!
Baxıb, gözlərinə inanmasa da,
Mat qalıb, key keçib bu şəhər, Allah!

Göydə başı üstə şəhid ruhları...
Yerdə sinəsinə sarılan qollar...
Gülündən qan daman güllər, çiçəklər...
Gün vurub buğlanan qan gölü yollar.

Nə deyim taleyin biçdiyi dona?
Bəşərə yaraşmır bəşər tarixi.
Bir gün Xankəndində yetəcək sona
Bu fitnə tarixi, bu şər tarixi.

Çatdıq... Bu da – Şuşa... Dayanır maşın...
Şuşam, gözün aydın, var olsun başın!
“Mənim əziz Şuşam, azadsan daha!”
Şükür Allaha!
Şükür Allaha!

*04 sentyabr 2021-ci il*

## II

## Ziyarətin qəbul olsun, Məhərrəm!

*(Şuşaya daxil olarkən Tehran Əlişanoğlunun, Vaqif Yusiflinin, Sərvaz Hüseynoğlunun və mənim şahidliyimlə Şuşaya səcdə edib daşını öpən Məhərrəm Qasımlıya)*

Qismət oldu, əhdə vəfa eylədin!
Ziyarətin qəbul olsun, Məhərrəm!
Yaman yerdə dərdə dəva eylədin!
Ziyarətin qəbul olsun, Məhərrəm!

Daşa əydin sevda dolu başını.
Daş da içdi gözlərinin yaşını.
Öpdün əziz Şuşamızın daşını
Ziyarətin qəbul olsun, Məhərrəm!

İçimizdə əsdi sərin-sərin meh.
Bu yanğılar çətin sönər, çətin, eh!
Bəzən gözəl görünürmüş gözdə şeh...
Ziyarətin qəbul olsun, Məhərrəm!

Zəfər yolu başdan-başa zəfərdi...
Bu nə gözəl yolçuluqdu, səfərdi!
Bizim Şuşa şüşə kimi şəhərdi...
Ziyarətin qəbul olsun, Məhərrəm!

Şöhrətimiz yaman gözə şiş idi.
Bu olanlar yağıların işidi...
Vaqif Aslan köhnə, qədim kişidi...
Ziyarətin qəbul olsun, Məhərrəm!

*05 sentyabr 2021-ci il*




*Şəkildə Tehran Əlişanoğlu (AMEA-nın müxbir üzvü, ədəbiyyatşünas. Eynəkli), Gülnarə Məmmədli (AYB Sumqayıt bölməsinin sədri), Əkbər Qoşalı (Atatürk Mərkəzinin şöbə müdiri DGTYB (Dünya Gənc Türk Yazarlar Birliyinin) Məsləhət Şurasının sədri. Bığlı və şapkalı), Vaqif Aslan (qalstuklu)*

## III
## Şuşada əsən külək

Necə də şəfalıdır...
Şuşada əsən külək.
Sinəmdə, kürəyimdə,
üzümdə gəzən külək.

Könlümə sığal çəkir
anamın əlləritək.

Məni fikir götürmüş....
Məni xəyal aparmış...
Şuşada Şəki varmış ...
Şəkidə Şuşa varmış...

Bəlkə, bu Şuşa deyil,
Şəkidir, Kiş kəndidir.
Bu – müdrik Həsən əmi,
O – Kamran əfəndidir.

Yolu yoluma bənzər,
gah yoxuş, gah enişdir.
Başının üstündə göy
geniş, geniş, genişdir.

Külək əsir, yel vurur...
Yel mülayim, meh sərin...
Bitmir, bitmir ki, bitmir
fikrim, düşüncələrim.

Əsir, əsir Şuşada
yel də, meh də, külək də.
Tanrım, yer yaratmısan
bu qəlbdə, bu ürəkdə!
Mənim də bağımda var,
and olsun, xarı bülbül.
“Yarı gül, yarı bülbül”.
Gülə, çiçəyə demə
dərdimi, barı, bülbül.

Şuşada əsən külək
zənguləndir, muğamdır.
Oxu, sevdalı könlüm,
oxumalı məqamdır!

*06 sentyabr 2021-ci il*



## IV
## Əzizə xanım

*(Vaqif poeziya günlərindən qayıdacağımız gün Vaqif Yusiflinin əlində isti çörək və qoğal gördüm. Dedi ki, ev üçün götürmüşəm, qoy bizim süfrəmiz Şuşa süfrəsi kimi bərəkətli olsun. Mən də digər yoldaşlara qoşulub çörək almağa getdim. Yolda bir qadın otuz il əvvəl qoyub gəldiyi evini tanıdı. Maşından düşdü. Biz də onun evini ziyarət etdik.)*

Boynundan asılan bəlgədən
adını bildim:
– Əzizə xanım.
– Bağımda bal armudum
var, – dedin...
Yeməmişdən dadını bildim,
Əzizə xanım.

Sürücüyə üz tutub
Dedin: – Saxla maşını.
Otuz ildir görmürəm
eyvanımı, divarımı, daşımı.
Dayandı maşın, Əzizə xanım.
Dayanmadı göz yaşın, Əzizə xanım.

Günün günortasında...
Şuşanın ortasında
Bünövrəsi salamat
evini gördün!..

Gözün aydın!
Dünyanın dərdqarışıq
kefini gördün!..
Gözün aydın!

Dedin ki, otuz ildir
dərilməyən gavalın var.
Qəribə günahın var!
Qəribə babalın var!

Şuşan o Şuşan kimi
Əhsən, qalıb yadında.
Varmı elə bir armud
bal armudun dadında?

Zəfər yoluyla gəldin,
evini tapdın.
Əzizə xanım!
Fikrində, xəyalında
təndirinə od salıb
çörək də yapdın.

Əzizə xanım!
Mən də bir pay götürdüm
yapdığın o çörəkdən,
Əzizə xanım!
Halallıq ver ürəkdən!
Əzizə xanım!

*06 sentyabr 2021-ci il*

## V
## – Onlar kimlər idilər? – Ermənilər idIlər!

*(Vaqif poeziya günləri çərçivəsində Şuşaya səfər edən Əli müəllim adlı bir ziyalımız orada atasının məzarını tapa bilməməsindən gileyləndi)*

– Onlar kimlər idilər?
– Ermənilər idIlər!
Məzarları yedilər
başdaşları qarışıq.
Üstündən qan içdilər
göz yaşları qarışıq.
Bizi kənd-kənd tutdular...
Şəhər-şəhər uddular...
Analar bətnindəki
körpələri yedilər.
Ləzzətlidir dedilər.
– Onlar kimlər idilər?
– Ermənilər idilər!

– Dayan, Əli müəllim,
məzar axtarma burda!
Atan, baban məzarı
daha qarışdı yurda.
Qarabağ baban oldu
Qarabağ atan oldu.
Torpağın torpaq oldu,
vətənin vətən oldu.

– Onlar kimlər idilər?
– Ermənilər idIlər!..
Ermənilər idIlər!..

*08 sentyabr 2021-ci il*

## VI

## Çağır, Fəxrəddin, çağır!

*(Şuşada "Vaqif poeziya günləri"nin iştirakçısı Fəxrəddin Maqsud oğlu Mahmudov Cıdır düzündə uca bir səslə "Ehey,buraya gəlin! Buraya gəlin!" deyə hamını bir yerə çağırdı)*



Çağır, Fəxrəddin, çağır!
Çağır yurddaşlarını!
Çağırmasa olarmı
qardaş qardaşlarını?
Dayanmışıq, durmuşuq
zamanın bu üzündə.
O üzdə qalanları,
bu üzdə olanları
çağır Cıdır düzündə!
Min ildir, milyon ildir
səsin mənə tanışdır.
Elə bu səsinlə də
yolları kəsiləndə
əsgərimə, mərdimə
sinəsindən yol verən
qayaları danışdır.

Çağır, Fəxrəddin, çağır!
Çağır yurddaşlarını!
Yoğur yanğılarınla
odlu göz yaşlarını!
Eşitməsə də karlar,
danışmasa da lallar.
Eşidir harayını
dağlar, yamaclar, yallar.
Yarpaq-yarpaq səs verir
sənə ağaclar, odur.

Qartal qanadlartək
qollarını aç, otur
qayaların qaşında.
Çağır, ruhu şad olsun
torpağın da, daşın da.

Çağır! Yurddaşlarının
qulaqları açılsın!
Qoy Şuşanın quruyan
bulaqları açılsın.
Çağır! İsa bulağı
Göz-göz olub ağlasın!
Xan qızı bulağı, qoy
Zümzüməylə çağlasın!
Göyərsin çəmənlərin!
Açsın yasəmənlərin!
Güllərin, çiçəklərin
təzədən yarpaqlasın!

Çataraq qaşlarını
Çağır yurddaşlarını!
Şəhidlərin ruhunun
şəhadətiylə çağır.
Çağır ayaqçılartək!
Çağır duyuqçulartək!
El adətiylə çağır!
– Ehey, buraya gəlin!
Buraya gəlin!” deyə
Sizlərə uzanıbdr,
sizlərə əlim deyə
Çağır, Fəxrəddin, çağır!
Yer eşidir, Göy baxır!

Çağır, çağır hər kəsi! Öz ləhcəsiylə çağır!
Seyidin avazıyla, Xanın səsiylə çağır!
Cabbar Qaryağdıoğlu şivəsi, təbirincə
Xanlı, xanlıqlı yurdda
qalx zilə pillə-pillə!
En bəmə incə-incə!
Çağır Bağrıqandakı bağrı qan olanları.
Qaldır, ayağa qaldır qalalı oğlanları!
Zarıslıdan gələnlər qaymaqlarıyla gəlsin!
Malıbəyli Həmidgil oymaqlarıyla gəlsin!

Çağır, Fəxrəddin, çağır!
Çağır yurddaşlarını!
Bayatı ilə oxşa
yurdun yurd daşlarını!
Ürəyini göynədən
yanğıyla, ahla çağır!
Şikəstə üstə köklən,
Zabul segahla çağır!
Səsin göyləri yaxsın
yandırılan evlərin
alov dilləri kimi.
Səsin yerlərə axsın
leysan selləri kimi.

"Ərim gəldi qayası"
qənşərində dayan, dur!
Elə bir zəngulə vur!
Qız-gəlinlər gözləyən
ərlər geri qayıtsın!
Yığnaq yeri, toy yeri,
ocaq yeri qayıtsın.
Sevincindən titrəyib
dağ tərpənsin, daş uçsun!

Qayalar qayaları,
daşlar daşları qucsun!

Üzeyir həvəsiylə…
Usta Xarrat Qulunun
boğazı, nəfəsiylə…
Bülbülün cəhcəhiylə….
Ellərin bəhbəhiylə
Çağır, Fəxrəddin, çağır!
Çağır yurddaşlarını!
Çağır bacılarını,
çağır qardaşlarını!
Nisgillilər sevinsin,
ağlayanlar kirisin!
Səsin gələn tərəfə
şan-şöhrət ayaq açsın!
Azərbaycan yerisin!

*19 sentyabr 2021-ci il*

## VII
## Şəkili İlham

*(29-31 avqust 2021-ci il tarixdə Şuşada keçirilən “Vaqif poeziya günlərində Şəkili İlhamın çayxanasında Şuşa ətirli, Şəki xətirli çaya qonaq olduq)*

– Salam, qardaş! Mən Şəkinin Kiş kəndindən...
Bəs sən hardan?
– Mən Şəkinin Qışlağından, Mədolardan.
– Mənim adım – Vaqif Aslan.
– Mən də İlham Hüseyn oğlu.
Dürüst, doğru.

Qoltuğumuz qarpızlandı, aşıb daşdıq.
Yumruq ilə salamlaşmaq
çıxdı yaddan, qucaqlaşdıq.

– Bu, Məhərrəm Qasımlıdır,
təxəllüsü – Orxan Paşa.
– Özüm gedib baş əymişəm
Orxan Paşa öpən daşa.

Bu da Vaqif Yusiflidir,
tənqidçidir – gözü qanlı.
Sözü qanlı tutur ancaq, sözü qanlı.

– Sanki əppək yeməyib heç, su içməyib
– Varmı elə şair ki, dostum ona ilişməyib?

– Bu, Əlişanoğlu Tehran – səmimi dost,
ciddi alim.
Burda bizə dost olmayan kim var ki, kim?
Poeziya günlərinə gəlmişik biz.
– Xoş gəldiniz Şuşaya siz!
Çayxanamız, çayımız var.

Sizə haqq-sayımız var.
Amma yadda saxlayın ki,
bizim şeir payımız var.

Dedim: – Olsun! Bu da oldu.
Halallaşdıq. İlhamın da
gözü doldu.
O kövrəldi, biz kövrəldik.
Şuşanı da, İlhamı da qəlbimizə qoyub gəldik.

*25 sentyabr 2021-ci il*



*29-31 avqust 2021-ci il. Şuşada Vaqif poeziya günləri.*
*Vaqif Aslan – soldan axırıncı sırada 10-cu, sağdan 7-ci*



Ədəbiyyat QƏZETİ

11 sentyabr 2021-ci il 19

**Şuşada M.P.Vaqif Poeziya Günlərindən təəssüratlar**

Vaqif ASLAN

**Gediş**

**I**

04.09.2021

**Ziyarətin qəbul olsun, Məhərrəm!**

**II**

05.09.2021

**Şuşada əsən külək**

**III**

06.09.2021

**Əzizə xanım**

**IV**

06.09.2021

**- Onlar kimlər idilər?**
**- Ermənilər idilər!**

**V**

08.09.2021

*"Ədəbiyyat qəzeti", Şənbə, № 36 (5322), 11 sentyabr 2021-ci il. Səh.19*




**P.S.** 1. **Bütün yollar Şuşaya aparır.** Bakı, "Nurlar N/P Mərkəzi", 2021, 272 s. Say: 300 ədəd. AYB kitab layihəsinin nəşri. Layihənin rəhbəri: Elçin Hüseynbəylinin redaktorluğu, "Ön söz"ü və Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin Şuşada M.P.Vaqifin türbəsi önündəki çıxışı ilə başlayan bu tarixi kitabda **Vaqif Aslanın Gediş. Ziyarətin qəbul olsun, Məhərrəm. Şuşada əsən külək. Əzizə xanım. – Onlar kimlər idilər? – Ermənilər idilər** (Bax.Səh. 243-251) şeirləri çap edilmişdir..



**2. Xarı bülbüllər.** Təbriz, "Aydın sav", 2022, 604 s.Tiraj: 1000. Kitabda Güney və Quzey Azərbaycanın 110-na yaxın şairinin doğma Qarabağı vəsf edən şeirləri toplanıb. Topluya daxil Azərbaycan şairlərinin əsərləri Vüqar Əhməd, Cənubi Azərbaycan şairlərindən poetik nümunələr Nurəddin Müqəddəm və Seyid Mahmud Sani İbadi tərəfindən tərtib olunub. Kitaba Şimali Azərbaycandan Əliağa Vahid, Səməd Vurğun, Süleyman Rüstəm, Nəbi Xəzri, Məmməd Araz, Bəxtiyar Vahabzadə, Fikrət Qoca, Xəlil Rza, Zəlimxan Yaqub, Musa Yaqub, **Vaqif Aslan**, Nüsrət Kəsəmənli, Sücaət, habelə Vahid Əziz, Ramiz Rövşən, Sabir Rüstəmxanlı, Paşa Qəlbinur, Vüqar Əhməd, Nazim Əhmədli, Fəridə Hicran, Gülbəniz Babayeva, İbrahim Yusifoğlu, Arif Buzovnalı, Əsəd Cahangir, Gülnar Səma və bir çox şairlərin Qarabağ ətirli əsərləri daxil edilib.

# VAQİF
## (Mənzum faciə)

## SƏMƏD VURĞUNUN EYNİ ADLI DRAMININ NOTİVLƏRİ ƏSASINDA

Rejissoru: MƏRDAN FEYZULLAYEV – AR əməkdar artisti
**P.S, Əsər Şəki Dövlət Dram Teatrının (mart 2016) və Bakı Musiqili Teatrının (7-8 iyun 2016) səhnələrində tamaşaya qoyulmuşdur**

İŞTİRAK EDİRLƏR:
VAQİF – şair (1717-1797) – 80 yaşında
ƏLİ BƏY – Vaqifin oğlu
VİDADİ – Vaqifin şair dostu
İBRAHİM XAN – Qarabağ xanı (1732-1806)
AĞA MƏHƏMMƏD ŞAH QACAR – İran şahı (1741-1797) – 56 yaşında
TƏLXƏK
VƏZİR MİRZƏ ŞƏFİ
SADİQ BƏY – Qacarın baş sərkərdəsi
SƏFƏRƏLİ BƏY – Qacarın sərkərdəsi
MƏHƏMMƏD BƏY – İbrahim xanın qardaşı oğlu – Məhəmməd-qulu bəy Mehrəli bəy oğlu SARICALI CAVANŞİR – (1762? Şuşa-1797, Şamaxı)
CƏLLAD
ÜÇ NƏFƏR QARA GEYİMLİ VƏ QARA MASKALI ŞƏXS

***Qeyd: Mətndə qara şriftlərlə verilmiş misralar böyük Səməd Vurğunun "Vaqif" pyesindən götürülmüşdür***

# BİRİNCİ HİSSƏ
# PROLOQ

Səhnə daırəsi yavaş-yavaş fırlanır... Ətraf qaranlıqdır, projektorun işığı altında Molla Pənah Vaqifi görürük... O namaz qılır... Səhnə daırəsı bütün monoloq boyu fırlanmaqda davam edır...

VİDADİ
**Xudaya! İnsanın halı yamandır,**
**Nələr çəkdiyimiz sənə əyandır,**
**Mənası varmıdır mın təriqətin?**
**Aç...aç qapısını sən həqiqətin.**
**Nə olur, bir yeni işıq ver bizə,**
**Bizim kor yaranmiş gözlərimizə –**
**Bəlkə də yaxşını seçək yamandan,**
**Ta ki, qansız keçən bir güzərandan**
**Biz də ilham alaq, sevinək bari!**
**İşiqlat bu dibsiz qaranlıqlari...**
**Yazıqdır dünyanın əşrəfi insan,**
**Böyüksən, adilsən, keç günahından!**
**Qoyma ki, yerlərdə sürünsün bəşər,**
**Dünyada qalmasın nə pislik, nə şər.**
**Yaxşılıq insana bir sənət olsun,**
**Dünya başdan-başa bir çənnət olsun...**

## BİRİNCİ ŞƏKİL

Şuşa... İbrahim xanın sarayı...

Səhnənin müxtəlif yerlərində yeddi ədəd kondelyabr / fiqurlu şamdanlar/ vardır... Dərinlikdə üzərinə rus ordusunun general-mayorunun hərbi paltarı geyinindirilmiş müqəvva.... Müqəvvanın qarşısında kiçik masanın üstündə tapança və perqament... Səhnə tam qaranlıqdır... Qaranlıqda kimsə kibrıt yandırır... Bu İbrahim xandır, kibritin alovu onun sifətini işıqlandırır... İbrahim xan şamları növbə ilə yandırır...

İBRAHİM XAN
Ən bədbəxt xanammış xanlar içində,
Qalmışam tökülən qanlar içində.
Mənim sağım İran, solum Rusiya...
Nə bundan işıq var, nə ondan ziya.
Nə buna bir savaş aça bilirəm,
Nə ondan qurtarıb qaça bilirəm.

Bir anlıq donaraq, əlində yanar kibrit dayanır, kibrit əlini yandırdığından diksinir, kibriti yerə atıb, yenisini yandırır...

Qorumaq naminə mən Qarabağı
Rusun ayağına getmişəm, axı.
Yoxsa ki, minnətə gedərdimmi mən,
Bu boyda acizlik edərdimmi mən?
Getdim də, etdim də ..
Nə çarə? Amma...
Yoxdur nicat yolu, budur müəmma...
Yoxdur nicat yolu, budur müəmma....

Masanın üstündən müqavilə – perqamenti götürüb nəzərdən keçirir...

Mən- yəni, Qarabağlı, Şuşalı İbrahim xan
Özüm başda olmaqla varisim, vəliəhdim,
Əslim, nəslim adından
Dünyanın qarşısında Qurana and içirəm.
Özümə böyük kimi Rusiyanı seçirəm.

Müqəvvaya sarı gəlir, diqqətlə ona baxır və birdən müqəvva hərəkətə gəlir, kukla təki əli-qolu tərpənməyə başlayır...

MÜQƏVVA
İranın, Türkiyənin vassalı olmamaqçün,
Hər hansı bir dövlətin, ya hər hansı bir gücün

Təsirindən qaçmağı biryolluq qət edirəm.
Rusiya taxt-tacına sədaqət vəd edirəm.
Böyük imperatriçə, onun vəliəhdləri
Əmin olsunlar buna.
Mən kölənin ağası Rusiya olduğuna.
Dünyanın qarşısında Qurana and içirəm.
Başıma başçı kimi Rusiyanı seçirəm.

İbrahim xan masanın üstündəki tapançanı dəliçəsinə qaparaq, müqəvvaya atəş açır... Sonra halsız bir halda diz üstə çökür, tapança əlindən düşür...

İlahi, günahım nə olub ki, nə?
Bu boyda zülümlər edirsən mənə.
Mən bu cür şərtlərə necə qol qoyum?
Bu gündən sabaha necə yol qoyum?
Yadlara bəxş edib Qarabağı mən
Hara qaçacağam el lənətindən?

Masanın üstündən müqavilə – perqamenti götürüb nəzərdən keçirir... Vaqif gəlir. Onun əlində çox təmtəraqlı bir əsa vardır. Xana təzim edir... Xan isə danışığına davam etməkdədir.

Mən-yəni, Qarabağlı, Şuşalı İbrahim xan
And içib vəd edirəm xanlığımın adından:
Ülyahəzrət, o yüksək imperatriçə yenə
Özümün gəlirindən istifadə etməyə
izn verərsə mənə,
İldə 8.000 çervon
Bac verərəm mən onun
Tiflis xəzinəsinə.
Bacın bir hissəsini fevralın birinədək
4.000 çervon həcmində şərtsiz ödəyəm gərək.
İkinci hissəsini sentyabrın 1-də
ödəyib qurtararam.

Bac verməklə yanaşı başqa yollar araram.
Lap elə günü bu gün
Rahat yaşamaq üçün
Böyük oğlum Məhəmməd Həsən ağanın oğlu
Şükrüllahı Tiflisə
girov verməliyəm mən.
Ruslar arxayın olsun mənim sədaqətimdən.
Vəzir, nə deyirsən bəs bunlara sən?
Bu əhdnaməyə qol qoyummu mən?
Kafirlər Tiflisə girəndən bəri
Əlləriylə yazıb göndərdikləri
Bu iyrənc, rüsvayçı müqaviləyə
Rəvamı qul kimi xanlıq baş əyə?

VAQİF
Yoxdur başqa çıxış yolumuz, ey xan!
Qorunmaq gərəkdir yenə Qacardan.
Bütün Gürcüstanı iki il qabaq
Qoydu pis günlərə çalıb çaparaq.
Tiflisi odlara qaladı, keçdi.
Sağını, solunu taladı, keçdi.
Durur bu təhlükə başımız üstə,
Gəlsə, daş da qalmaz daşımız üstə.

İBRAHİM XAN
Onda Tiflisə get sən yubanmadan,
Konsul Zubova de bunu qorxmadan.
Savaşda bizimlə əlbir olsalar,
Qacarı qaz kimi tutub yolsalar,
Qoruya bilsələr onlardan bizi,
Etibar edərik taleyimizi.
Bir anlıq sükutdan sonra...
Onda bu şərtlərə qol qoyarııq biz,
Bir olar yolumuz, əməllərimiz.

Bu dünyanı tutub dayanan kimdir?
Sonra nə olacaq? Allah kərimdir.

Vaqif əlindəki məktybu İbrahim xana verir...

VAQİF
Qacara yazdığım cavabdır, alın.

İBRAHİM XAN
/məktubu nəzərdən keçirdikdən sonra, fikirli.../

Qoy olsun! Qoy olsun! Tez yola salın!

İbrahim xan gedir... Vaqif pilləkənlərlə aşağı düşür... Işıqlar azalır, ön plan işıqlanır...
Vaqiflə Məhəmməd bəy üz-üzə gəlirlər...

MƏHƏMMƏD BƏY
/kinayə ilə/
**Vəzir, əlindəki o əsa nədir?**

VAQİF
**Rusiya padşahı o zülmkardan-**
**Yekaterinadan bir hədiyyədir.**
MƏHƏMMƏD BƏY

**Aha!..De sən hara, Rusiya hara?**
**Yoxsa satılmısan o kafırlara?**

VAQİF
/əsanı göstərərək /
**Buna şəkil verən bir sənətkardır,**
**Mənim sənətkara hörmətim vardır.**

MƏHƏMMƏD BƏY
**Bəs onu göndərən Yekaterina?**

VAQİF
**Yalnız nifrətim var, inanın ona!**
**Onu da boğacaq gedən üsyanlar,**
**Azadlıq uğrunda tökülən qanlar.**

MƏHƏMMƏD BƏY
**Bəs ruslar? Bəs ruslar? Bəs o məlunlar?**

VAQİF
**Din ayrı, dil ayrı olsa da onlar,**
**Yenə beşiyidir mədəniyyətin,**
**Qədrini çox bilir şerin, sənətin.**

MƏHƏMMƏD BƏY
**Aman! Ayaqladi müqəddəs dini,**
**Bu tanrı düşməni, vətən xaini!**
**… Demək, satılmısan sən şeytanlara!**

VAQİF
**Tarix çavab verər bu böhtanlara!...**
Hərəsi basqa səmtlərə səhnədən gedırlər...

## İKİNÇİ ŞƏKİL

Qarabağ ətrafında Qacarın düşərgəsi... Yay vaxtıdır, cırcıramaların səsı eşidilir. Səhnə dairəsinin üstündə nizələr üzərində qurulmuş altıaçıq-düşərgə... Qacarın taxtı... Qacar sadə geyimdə, əynində adi iş döşlüyü /meyzar/ taxtda deyil, bir kənarda pilləkənlırin üstündə oturub qılıncını xartla itiləyir... Ön planda iri su çəni...

Vəzir Mirzə Şəfi gəlir, baş əyir...

QACAR
**Gəlib çıxmadımı bizim elçilər?**

MİRZƏ ŞƏFİ
**Xeyir, Qarabağdan yoxdur bir xəbər!**
**Deyirlər arifdir o İbrahim xan,**
**Deyirlər dərs alır Molla Pənahdan.**

QACAR
O kimdir?

MİRZƏ ŞƏFİ
**Şairdir, ləqəbi "Vaqif".**
**Yaranmış, deyırlər, hər elmə vaqif.**

QACAR
Hanı məni qanan, məni anlayan?
Xəlvəti-xəlvəti rusu yanlayan
Avam Azərbaycan xanlarına bax!
Bir ola bilmirik yumruq kimi, ax!
Sağa bax, sola bax, özünü tanı!
Bir görmək istərəm Azərbaycanı!

MİRZƏ ŞƏFİ
Məmnunam, məmnunam bu rəyinizdən.

İndi nələr keçir ürəyinizdən?
Tiflisi yandırıb, oda qaladiq,
Bütün ellərini soyub taladıq,
Yenə də hirsiniz soyumadımı?

Qacar su çəninə yaxınlaşır, qılıncını yuyur...

QACAR
Vəzir, ləkələmə mənimadımı!
Elə ki, su qaynar…
Üzündə oynar
zirlər, zibillər.
Köpüklər, çör-çöplər, palçıqlar, lillər,
Burdakı xanlar da bax buna bənzər.
Mən bu oyunları görmürəm, yəni?
**Çox da tərifləmə mənə vətəni,**
**Bu qılınc olmasa, yeyərlər məni!**

Taxtın arxasından Təlxəyin başı görünür...

TƏLXƏK
**Şahim, siz özünüz... azərbaycanlı...**

Qacar başındkı təsəyi çıxarıb Təlxəyə sarı atır...

QACAR
Şöhrətli, şanlı…
Bilmirsənmi sən?
Heç vaxt atmamışam bunu üstümdən!

Sadiq xan əlində məktub daxil olur...

SADİQ XAN
Şahim, qayiıtmışdır bizim elçilər.

Əlindəki perqamenti Mirzə Şəfiyə verir və baş əyib gedir...

QACAR
Oxu, gör nə yazır Qarabağ xanı!

MİRZƏ ŞƏFİ
/məktubu oxuyur/
**Aldiq məktubunu, Məhəmməd Qacar,**
**Tərlan oylağında sar ola bilməz!**

QACAR
**Sar ola bilməz!...**

MİRZƏ ŞƏFİ
**Bu dünya qalmamış ulu şahlara,**
**Zülm də, salim də var ola bilməz!**

QACAR
**Var ola bilməz!...**

Qacar iş döşlüyünü əynindən çıxarır, Təlxəyin gətirdiyi xalatı geyinir...

SADİQ XAN
**Göydən başımıza odlar da yağsa,**
**Bu ellər baş əyib xar ola bilməz.**
**… Basma ayağını bizim torpağa,**
Xacədən bizlərə **yar ola bilməz!**

Araya çox gərgin bir sükut çökür...

QACAR
**Xəbərdar eləyin sərkərdələri,**
**Hücuma toplasın bütün əsgəri!**

Qılıncını götürür, bir anlıq sükutdan sonra...

Axı biz qardaşıq... birdir qanımız,
Birdir vicdanımız, birdir canımız...

Şükut...

Son bir namə yazın İbrahim xana
Millət boyanmasın qoy nahaqq qana!

Vəzir kağız-qələm götürüb yazır...

Böyük, uca Allaha sevgilər, sayğılarla,
Bəndəyə qayğılarla.
Şahənşahi-İrandan hökm etdiyi ünvana!
Qosqoca Qarabağın xanı İbrahim xana:
Mən Ağa Məhəmməd şah Qacaram, belədir-var.
Bölünməli deyildir bizim bu qədim diyar.
Nə yamanlıq görmüsən sən bu təxti-İrandan?
Rusiyaya baxırsan gah Dağdan, gah Arandan?
Təxti-himayəmizdə olmusan bu günədək,
Hörmət-izzət görmüsən sərkərdəmtək, xanımtək.
Harda olsan, olmusan gözəl işlər içində,
Daim əmin-amanlıq, asayişlər içində.
İndi səbəb nədir ki, hökmümüzdən qaçırsan,
Üstümüzə gəlməyə kafirə yol açırsan?
Xaçpərəst ruslar ilə ülfətlər bağlayırsan,
Nədən səfehləyirsən, nədən maymaqlayırsan?
İrəvanın, Gəncənin xanlarından al ibrət,
Bir olanda güclüdür bu dövlət, bu məmləkət.
İnadın ucbatından təklənibdir Qarabağ,
Tarixinə üz çevir, keçmişini ara, bax!
Gör ki, yaddan yar olmaz.
Yadlar gəldi-gedərdir, dar ayaqda var olmaz.
Qarabağın naminə yerə vurma adımı,
Mənə itaət eylə, qazan iltifatımı.
Əgər qəbul etməsən təklifimi, bil ki, sən
Səksən minlik qoşunla hücum edəcəyəm mən.
Qarabağın başına gəlsə hər nə müsibət,

Baisi, cavabdehi sən olacaqsan, əlbət.
Nəyə ümid edib sən mənə qarşı durursan?
Üz görüb nədən astar eşqiylə qudurursan?
Başınla, ayağınla quruşa dəyməyirsən!
Nədən baş əyməyirsən?
Digər xanlar kimi sən mənə etsən itaət,
Xan yerində durarsan əvvəlkitək, nəhayət.
Bəyəm bilmirsənmi sən,
Qalxıb hərb eyləsəm mən,
Qələbə calacağam?
Şuşanı alacağam!
Hansı cəsarətlə sən mənə hədyan yazırsan?
Nə yolunu azırsan?
Olanların sədası qulağına çatmayıb?
Görünür, çatıbsa da, boş başına batmayıb.
Xəbərdar deyilmisən sən mənim divanımdan?
İçərəm ovuc-ovuc sənin qızıl qanından.

## ÜÇÜNCÜ ŞƏKİL

Qazaxda Birinci Şıxlı kəndi... Vidadinin evinin həyəti... Aylı, uldulu bir gecə... Vidadi ilə Vaqif ocaq başında.... Vidadi saz çalıb oxuyur...

VİDADİ
Könül səbrü qərar etməz...
Gedər yar olmayan yerdə.
Məhəbbət payidar olmaz
Vəfadar olmayan yerdə.

...Könül dünyada yar istər...
Olubdur biqərar, istər.

Vidadi xəstə var istər
Haçan yar olmayan yerdə?

Vidadi oxuyanda sonra

Vaqif, **nə var, nə yox? Kefin necədir?**

VAQİF
**Bu dünya doğrudan bir bilməcədir.**
**Qapıya qoymuram can möhnıtini,**
**İçirəm dünyanın hər şərbətini.**
**Gündüzlər oxşayır məni saraylar,**
**Çecələr sirdaşım ulduzlar, aylar...**
**Hər gülün rəngində bir canlı sənət,**
**Nə qədər təmizdir, safdır təbiət.**
**Mənim də oylağım dağdır, dərədir,**
**Könlüm gözəlliyə bir pəncərədir,**
**Dünyanın sirrini görürəm ordan...**
**Bir parça sümükdür sevdasız insan.**

VİDADİ
**Sevda bir dənizdir, göylərdən dərin,**
**Asta bax, qaralar birdən gözlərin**
**Burnun uşaq kimi dəyər daşlara.**

VAQİF
**Xeyr! Mən yoldaşam uçan quşlara.**
**Dünya çox böyükdür, min bir yuvam var.**
**Hələ bu dünyayla mənim davam var.**
**Hər təzə gülüşdən zövq almalıyam,**
**Ovçu gözlərimdə qalmasın bir kam.**
**Ömür vəfasızdır, bizi tərk edir,**
**Hər ağ gün, qara gün ömürdən kedir...**

VİDADİ
Quda, **heç aldanma dünya varına,**
**İnanma dünyanın etibarına.**

**Savab gör, hər zaman yaxşılıq eylə,**
**Dar gündə Allaha "kərimdir" söylə.**
**Səni bu dünyada boğsa da möhnət**
**Axırda qismətin olacaq cənnət,**
**Axirət dünyası qalacaq bizə.**

VAQİF
**O da bir pərdədir gözlərimizə.**

**Canım, nə cəhənnəm, nə cənnət vardır,**
**Bunlar da bir çürə uydurmalardır.**

VİDADİ
**Yenə şairliyin baş aparır ha!...**
**Yoxsa ağ olursan böyük allaha?**

VAQİF
Günah eyləyirəm, bağışla, ustad!
Bəs nədən bizlərə hamı olub yad?
Səhv edə bilərəm, bunu danmıram.
Elə bilməsinlər heç nə qanmıram.
Neynəyim, ürəyim od tutub yanır.
Yetən Qarabağı qurbanlıq sanır.
Alıb üstümüzü qara buludlar,
Göydən başımıza yağacaq odlar.
Qapılar bağlıdır, tapılmır açar,
Gəlir üstümüzə Məhəmməd Qacar.
Tiflisə göndərib yenə xan məni,
Qarışıq salmışıq dostu, düşməni.
Kömək diləyirik rus konsulundan,
Ordan qayıdıram, dönüb yolumdan
Dedim ki, baş çəkim barı sizlərə,
Qismət olmayacaq, bəlkə, bizlərə
Bir də görüşmək.
Xoşdur Vidadinin evinə düşmək.

İlhama gələrək

Ey səba, yara de kim, avarə gördüm Vaqifi,
Qəm əlindən bikəsü biçarə gördüm Vaqifi,
Bağrı olmuş sərbəsər sədparə gördüm Vaqifi,
Aqibət salmış özün odlarə, gördüm Vaqifi,
Gecə-gündüz müntəzir dibarə gördüm Vaqifi.

Vaqifin bu müxəmməsinin
son bəndini Vidadi özü deyir

VİDADİ
Söylə kim, başın üçün, bir lütv qıl, ey gülizar!
Sallanıb sərvi-rəvan tək bu yana eylə güzar,
Gecə-gündüz dərdi qəm etmiş məni candan bezar,
Görməyə didarını hərdəm çəkər çox intizar,
Gözlərin dikmiş baxar yollarə, gördüm Vaqifi.

VAQİF
**Ah, bu axşam nə gözəldir, ondakı mənaya bax,**
**Parçalanmış ağ buludlar, göydə bağdaş quraraq,**
**Təbiətin saflığına qulaq asır uzaqdan.**
**Gəlin kimi bəzək vurb ay da çıxmış otaqdan.**
**Nə təmizdır, nə parlaqdır səmanın süd bənizi,**
**Ən müqəddəs xəyallara dəvət edir o bizi.**

VİDADİ
**Xəyal şirin nemətidir bu acı kainatın…**

VAQİF
**Xəyal doğma balasıdır bizim ana həyatın,**
**Onun gözü kor olsa da, sevəcəkdir bu ana,**
**Yaziq, bədbəxt balasını basacaqdır bağrına.**
İstək, arzu, xəyal yoxsa, bu dünyada nə vardır?

Onda dünya qarsız qışdır, gül-çiçəksiz bahardır.
O kimdir ki, bu dünyada xəyallara dalmasın?
Arzu olsun, istək olsun, dünya yetim qalmasın.

VİDADİ
İnsan neynəsin ki, dünya yetimdir,
Onunçün hər yerdə ölum-itimdir.

Qucaqlaşırlar

Şükür ki, bizləri ziyarət etdın.

VAQİF
Gərəkdir sübh tezdən Şuşaya gedim...

VİDADİ
Burdadır dünyanın zövqü, ləzzəti,
Gəl sən öz boynundan at bu minnəti,
Qayıt kəndimizə! Kömək ol bizə.

VAQİF
**Mən orda olmasam qan çıxar dizə.**
**Quşlar da ağlayar ellərimizə.**
**Xan məndən utanır, çəkinir bir az,**
Getməsəm, **qırğının hesabı olmaz.**

VİDADİ
Əl çək bu tərslikdən, qulaq as mana!

VAQİF
Ölsəm də, ölməyim xoşdur mərdana!

VİDADİ
Mərd ol, mərdanə ol olandan sonra,

Olmaq da itirir öz mənasını
Çiçəyi burnunda solandan sonra.

VAQİF
Su qabı sularda sınmasa olmaz
İçilə-içilə dolandan sonra...

# İKİNCİ HİSSƏ
# DÖRDÜNCÜ ŞƏKİL

Şuşa... İbrahim xanın sarayı... Səhnə dairəsinin tən ortasında taxt... Ətrafda şamdanlar...İbrahim xan taxtda oturub, qarşısındakı masanın üstündəki iri fiqurları olan şahmat taxtasına nəzərlərini dikərək dərin düşüncələr ıçərısındədir... Vaqif gəlir...

VAQİF
Tiflisdən naümid qayıtmışam, xan!
Zubov ordusuyla çıxıbmış ordan.
Çünki ulyahəzrət Yekaterina,
O, "boyu sürahi, gərdəni mina"
Durduğu yerdəcə eyləyib vəfat.
Oğlu Pavel çıxıb taxta o saat.
Alıb nəzarətə dərhal hər yeri,
Zubovu Tiflisdən çağırıb geri.

İBRAHIM XAN
Vəzir, ucaldarsa bir kəsi Allah,
Onu endirəmməz bir kimsə, vallah.
Allah bir kimsəni salsa aşağı,
Onu qaldırammaz Adəm uşağı.
Üz-üzə gəlsəydi Zubovla Qacar
Biryolluq olardı İran tarımar.
Qürbətə düşməzdi daşımız bizim.

Dərddən qurtarardı başımız bizim.
Gör, hansı məqamda baş verdi nələr...
Bu boyda müsibət heç ağla gələr?

Qəzəblə şahmat taxtasını çevirir, fiqurlar ətrafa səpələnirlər...

Nədən vəfat etdi imperatriçə?
Mənim ümidlərim puç oldu necə!
Geriyə çağrıldı rus qoşunları,
Qacardan qoruna biləydik barı...

Pauza

Səksən minlik qoşunla Arazı keçib Qacar,
Müharibə yolunu yenə də seçib Qacar.
Qarşı gəlsək nə olar? Ağlın bundan nə kəsir?
On minlik qoşun ilə bəs biz nə edək, vəzir?
Bir tərəfdən quraqlıq evimizi yıxıbdır,
Aclıq da bir tərəfdən kəllə-çarxa çıxıbdır.
Əgər döyüşə girsək Qacarla, məhv olarıq,
Xalqı güdaza verib, hər yerdə səhv olarıq.

VAQİF
Doğru buyurursunuz, bəli, bu dəfə, ey xan,
Qaça bilməyəcəyik Qacarın qabağından.

Sükut çökür...

İBRAHIM XAN
Həqiqət budur, vəzir.
Bizdə o güc nə gəzir?

Yenə də həddi aşsaq,
Qacarla qarşılaşsaq,

Qarabağı qoruya bilmərik əsla, vəzir!

Şahmat fiqurlarını yerdən yığa-yığa...

Xalqı güdaza verək hansı əsasla, vəzir?
Hansı əsasla, vəzir...?
Mənim fikrimi sorsan, fikrim belədir qəti:
– Təslim olmalıyıq biz Qacara müvəqqəti.

VAQİF
Qacar gəlincə, ey xan,
Qoşununu götürüb çıxarsan Qarabağdan.
Güya uzaqlaşırsan xanlıqdan öz xoşunla.
Car-Balakən tərəfə çəkilib bu qoşunla
Orda məskən salarsan.
Qaynın avar xanından canlı qüvvə alarsan.
Deyirlər: – Ümmə xanın 70 min əsgəri var.
Dağıstan xanları da bizə kömək olsalar,
Əlavə qoşun alıb İlisu sultanından,

Keçib şirin canından
Qacara hərb açarsan,
Başına od saçarsan.
Azğınların burnunu yerindəcə ovarsan,
Qacarı Qarabağdan Tehranacan qovarsan.
Heç kəs düşünməsin ki, meydan daim şərindir,
Haqlı olduğumuzçün Allah bizə kərimdir.

## BEŞİNCİ ŞƏKİL

Şuşa qalası... Qacar və vəziri Mirzə Şəfi...

QACAR
Gözün aydın olsun, Şuşa qalası,
Çəkildi başından kafir bəlası.
Mən necə demişdim, elə də oldu,
Davasız-şavasız düşmən qovuldu!

Vəzir Mirzə Şəfi qucağında çoxlu perqamentlərlə daxil olur, onları masanın üstünə qoyur,
sonra bir-bir açıb gözdən keçirir...

VƏZİR MİRZƏ ŞƏFİ
Hökmünə, gücünə qurban olum, şah.
Sizə kömək olsun o böyük Allah!
Qabaqda görməli günlər var hələ!

QACAR
Heyif, İbrahim xan keçmədi ələ.

VƏZİR MİRZƏ ŞƏFİ
O da ələ keçər, Qibleyi-aləm,
Dəyərmi heç nədən edəsiniz qəm?
Allah qoysa, bu gün İbrahim xanın
Ya özü, ya başı gələr, inanın.

QACAR
Allah o ağzından eşitsin, vəzir!
Gərəkdir xainlər alınsın əsir.
Ələ keçirməsə İbrahim xanı,
Dincələ bilərmi Qacarın canı?
Axı aləm bilir, mən, mən olmuşam,

Dosta dost, rüşmənə düşmən olmuşam.
Taxtabaş xanlardır məni yandıran,
Yoxdur bir bunları tutub qandıran.
Farslar daldan-dala, tor hörə-hörə,
Türkə xər deyirlər bunlara görə.

Vəzir əlindəki perqamenti Qacara göstərir...

VƏZİR MİRZƏ ŞƏFİ
Ey qibleyi-aləm, bir baxın buna...

Qacar perqamenti alıb, gözdən keçirir...

QACAR
Hm! Hm...Ülyahəzrət Yekaterina!...
Pauza
Molla Pənah Vaqif…
Yenə pauza
Axı o müsəlman, bu xaçpərəsdir!
Amma bizim xanlar sərxoşdur, məstdir.
Götür Ukraynanı, Finlyandanı,
İndi nə Krım var, nə Krım xanı
O da Baltikyanı ölkələr, vəzir.
Bir bax, müstəqillik orda nə gəzır?
Xoşbəxt ola bilməz heç vaxt həyatda
Qarabağ rusların qapazı altda?!
Kül sənin başına, ay İbrahin xan,
Çahildən çahilsən, nadandan nadan!

VƏZİR MİRZƏ ŞƏFİ
Şahim, bunu yazan molla Pənahdır
Onun sağ qalması, vallah, günahdır.
Odur dil verəni İbrahim xanın,
Kəsdir kəlləsini qurtarsın canın.

Onu yaxalayıb Laçın yolunda,
Tutub gətirmişik qandal qolunda.

Təlxək hürə-hürə gəlir...

QACAR
**Təlxək, yenə hürürsən?**
Elə bil, mal sürürsən.

TƏLXƏK
/Ətrafı göstərərək/
**Şah sağ olsun, bu sürüyə**
**Bəs bir köpək deyil gərək?**
Hürməliyəm daha da bərk.

QACAR
**Təlxək, söylə, məni çoxmu sevirsən?**

TƏLXƏK
**Şahim, yaranmadan qulunuzam mən...**

QACAR
**Bir de görüm, məni əsir alsalar,**
**Qaranlıq zindana tutub salsalar,**
**Neylərsən?**

TƏLXƏK
**Neylərəm? Neylərəm? Aman!...**
**Keçərəm yolunda baş ilə candan...**
**Sizi zindanlara salsalar əgər,**
**İnsan boğazlaram düz otuz nəfər...**

QACAR
**Təlxək, kəmərimin qiymətidir bu.**

TƏLXƏK
**Şahim! Elə mən də bilirəm bunu.**
**Kəmərdən qiymətli sizdə nə var ki?**

Təlxək donbalaq aşır, qoltuğundan qadın qoççağı /kukla/ yerə düşür... Təlxək qoççağa müraciətlə...

Sən qönçə kimi hər bir edən dəmdə yaşınmaq,
Artar bizə yüz mərtəbə odlarına yanmaq,
Mən aşiqəm, ey gül sənə, olmaz bunu danmaq,
Ölən günədək eyləməzəm səndən usanmaq,
Daxi nə yaşınmaq, nə bürünmək, nə utanmaq?
Bəsdir bu dayanmaq!

Qeyridən əgər ki, edəsən sən bu hicabı,
Billəm ki, sözündür vəli məqbulu hesabı,
Yoxsa, məni görcək, üzünə çəkmə niqabı,
Gəl, Tanrı üçün, Vaqifə çox vermə əzabı,
Daxi nə yaşınmaq, nə bürünmək, nə utanmaq?
Bəsdir bu dayanmaq!

QACAR
Şeir **Vaqifindir?**

VƏZİR MİRZƏ ŞƏFİ
**Bəli, Vaqifin.**

QACAR
**Yaxşı, hüzuruma onu gətirin!** (S.V. Nəoldu? Onu tez tapıb gətirin. S.80.)
**Vəzir! Bu doğrudan böyük qüdrətdir,**
**Hər sözü, kəlamı canlı sənətdir.**

VƏZİR MİRZƏ ŞƏFİ
**Şahim! Təhlükədir Vaqif, doğrudan,**
**Onu gözünüzdən qoymayın bir an...**
**Deyir, qanunlarda yoxdur həqiqət,**
**Deyir ki, pərdədir bütün şəriət,**
**Nədənsə el-oba çox sevir onu.**
**Bilməyir bu qədər tərs olduğunu.**
**Vaqif yaşadıqca, qorxudur bizə,**
**Şair görünməsin gözlərinizə!...**

Vaqifi gətirirlər...
QACAR
Vəzir**... Baş əyməyir hüzurumda bu!**

VƏZİR MİRZƏ ŞƏFİ
**Yoxdur vicdanında qanun qorxusu.**

QACAR
**Şair, hökmüdarın hüzurundasan!**

VAQİF
**Bunu sizsiz belə düşünürəm mən.**

QACAR
**Bəs baş əymədiniz?**

VAQİF
**Əymədim, bəli!**
**Əyilməz vicdanın böyük heykəli...**

QACAR
**Qılınclar toqquşub iş görən zaman,**

**Neylər dediyiniz quru bir vicdan?**

VAQİF
**Vicdan dedikləri bir həqiqətdir,**
**Beşiyi, məzarı əbədiyyətdir...**

QACAR
**Bəs zindan necədir, qaranlıq zindan?**

VAQİF
**Soyuq məzara da zinətdir insan.**

VƏZİR MİRZƏ ŞƏFİ
**Yenə göylərdədir şair xəyalın?**

VAQİF
**Əzəldən hüdudu yoxdur kamalın...**

Vəzir perqamentdən – Vaqifin əlyazmasındandan oixuyur...

VƏZİR MİRZƏ ŞƏFİ
Kür qırağının əcəbkar seyrangahı var,
Yaşılbaş sonası heyf ki, yoxdur...
/Vaqifə/
**Gərək fars dilində yazsın sənətkar.**

VAQİF
**Farsın Hafizi var, Firdövsisi var,**
**Nə çoxdur onlarda şair sənətkar.**
**Azəri yurdunun oğluyam mən də,**
**Az-az uydururam yeri gələndə.**

QACAR
**Yaxşı gəl əl götür bu inadından,**
**Bu qədər naşükür olmasın insan!**

VAQİF
**Aldada bilməmiş dünyanın varı**
**Bir məslək eşqilə yaşayanları!**
**Mən ellər bağında azad bir quşam,**
**Mənsəbə, şöhrətə satılmamışam!...**

VƏZİR MİRZƏ ŞƏFİ
**Yaxşı da... Çarıqlı kiçik bir ölkə,**
**Böyük Firdovsilər yaratdı bəlkə?...**

VAQİF
**Dayan! Bu bağçanın hər bir budağı**
**Üstündə min çiçək, min gül bitirmiş.**
**Sizin güldüyünüz çoban torpağı**
**Nizamilər, Füzulilər yetirmiş!**

VƏZİR MİRZƏ ŞƏFİ
İndi də çoxları farsca demirmi
Fikrini, zikrini, dərd-sərlərini?
Şairlər ustadı, şeyx Nizami
Farsça yazmırdımı əsərlərini?

VAQİF
Nizami əliylə sınanan qələm
Elə farscada da yaratdı aləm.
Əzəldən türkcədə vardı Nizami
Sözün də, şeyrin də oydu nizamı.
Türklüyü nəzərə alınmayırdı,
Türk kimi saya da salınmayırdı.
Farsca danışırdı türk xaqanları.
Türkcədə çıxırdı sanki canları,
Hər “təzə gəlinə çəkəndə zəhmət”,
“Farsın qələmiylə” vururdu “zinət”.
Əgər öz dilində danışmırsa şah,

Xalqı həqiqətdən olarmı agah?
“Türk dili yaraşmır şah nəslimizə,
Türk dili əskiklik gətirir bizə”
Deyən xaqanlardan gileylənirdi.
Onun bundan başqa yox idi dərdi.
O dərdlə yaşayır Nizami yenə,
Yer üzü baş əyir əsərlərinə.
**Günəşi örtsə də qara buludlar,**
**Yenə Günəş adlı bir qüdrəti var.**

Təlxək ağsaçlı qoca simasinda /maska/ gəlir...

TƏLXƏK
Hökmdar, **hakimin hökmü, hünəri**
**Onun vaicdanilə qardaş olmalı.**
**Bizə qamayacaq dünyanın malı...**

Vaqifi göstərərək
**Şairdir,.. qəlbi var, şirin sözü var.**
**Böyük bir ölkənin onda gözü var.**
**O ölsə,.. dağlar da dil deyib ağlar.**
**Əfv edin, yaxşılıq qalar yadigar.**

QACAR
**Dinin dümənidir, o ölsün gərək!**

TƏLXƏK
**Xeyr! O, Vaqifdir, eşqə glərək,**
**Bəzən qamçılayır zəmanəsini.**
**Allah da çox sevir şeirin səsini.**

QACAR
**Allah da çox sevir? Allaha yalvar!**
**Onun məndən də çox ədaləti var.**

**Əgər** istəyirsə, **qoy sağ saxlasın.**
**Rəhm edib ona da bir gün ağlasın.**

TƏLXƏK
**Siz hökmdasınız...**

QACAR
**Yaxşı,** onda mən
**Artıq əl çəkirəm ölüm fikrindən.**
**Ancaq... kəsəcəyəm yazan əlini.**
**Bir də həcv deyən acı dilini.**
Vaqifə tərəvf çevrilir
**Razısan?**

VAQİF
**Razıyam, böyük hökmdar!..**
**Mərhəmət sahibi olur ağalar.**
**Mən az görməmişəm bu sarayları,**
**Burda göyə çıxan ahü vayları...**
**Görmüşəm şahların vəfasını mən,**
**Xanların zülmünü, cəfasını mən.**
**Görmüşəm zamanın min rüzgarını,**
**Dustaq anaların göz yaşlarını.**
**Nifrət! Qan çanağı taclara nifrət!**
**Var olsun azadlıq, bir də məhəbbət...**

QACAR
/maskanı üzündən çıxarır/
Şair, azadlıqdan dəm vurma əbəs.
Rusun ayağına niyə getdin bəs?
Aparın, aparın onu zindana,
O düşmən kəsilib Azərbaycana!

VƏZİR MİRZƏ ŞƏFİ
Şahım, icazə ver, o məlunu mən
Bənd-bənd doğratdırım, tamaşa et sən.

QACAR
Vəzir! Bu gün, axı, cümə günüdür,
Göydə mələklərin toy-düyünüdür.
Dırnaq da kəsmirəm cümə günü mən,
Mənim divanımı sabah görərsən.
Bir divan qurum ki, əzrayıl belə
Gördükcə canına düşsün vəlvələ.

Sadiq bəy və Səfərəli bəy daxil olub, baş əyirlər...

SƏFƏRƏLİ BƏY
Şahənşahi-İran, Qibleyi-aləm!
Ona Tərtərçayda yetişdik o dəm.
Yanında on mindən ziyadə atlı,
Atlar, necə atlar? Yeldən qanadlı.
Çox dava elədik İbrahim xanla,
Al-əlvan boyadıq düzləri qanla.
Sayca çox idilər, öhdələrindən
Hər nə elədimsə, gələmmədim mən.
Hey qırdıq, qırıldıq,.. axırda yenə
Üz tutub qaçdılar Car-Balakənə.

QACAR
Yalan söyləyirsən, ud səsini, ud!
Gah nala, gah mıxa vurma, namərbut!

Səfərəli bəyin qulağından tutaraq

Dava eyləyibsən, ya yox? Bilmirəm!
Kim sayca az olub, kim çox? Bilmirəm!

İbrahim xan hardan on min qoşunu
Alıb ki, qabağa verib döşünü?
İki-üç ildir ki, Qarabağ acdır,
Qüvvəyə möhtacdır, gücə möhtacdır.
Qolundan tutmasan, yatdığı yerdən
Ayağa durammaz, bilmirəmmi mən?
Dava eyləyibsən, ya yox? Düz danış!
Di çevril, qibləyə tutub üz, danış!

SƏFƏRƏLİ BƏY
Dediyim kimidir, Qibleyi-aləm!
Yalansa, dirənsin göylərə naləm!

QACAR
Söylədiyin yalan, dediyin yalan!
Kimdir bu yalanı hesaba alan?
İki yüz atlıyla qaçan bir xandan
Qorxub qaçıbsınız bu biri yandan.
Doğrusunu söylə, düzünü danış!
Mənim gümanımda olmur aldanış.
And olsun lələmin əziz qəbrinə,
Davam gətirməzsən mənim cəbrimə.
Kəsdirib ətini, çəkdirib şişə,
Sonra deyəcəyəm: – İşə bax, işə!
Ətini köz üstə yandıracağam,
Sənə dediyini dandıracağam.

SƏFƏRƏLİ BƏY
Ey qibleyi-aləm, sahib-ixtiyar,
Necə ərz etmişəm, elədir ki, var.
Üzüm yanınızda qara kəsövdür,
Nə növ demişəmsə elə o növdür

QACAR
Nə qədər qırılıb bizim qoşundan?

SƏFƏRƏLİ BƏY
Dedim ölməsinlər boşu-boşundan.
Onları salamat qaytarmışam mən.

QACAR
Zırrama! Aydındır! Yalançısan sən!
Kərzayı!Sən buna etmisən vərdiş!
Kimin qabağında edirsən gərdiş?

Səfərəli bəyin qulaqlarından yapışıb dartır...

Dedim, göz-qulaq ol İbrahim xandan!
Bu yandan aldığın düşdü o yandan?
Şahı eşitməyən qulaqlarla sən

Şaha necə qulluq eyləyəcəksən?
Get, de cəllada ki, kəssin onları,
Biz ki çox görmüşük belə sonları.
Mən Ağa Məhəmməd şah Qacar olam,
Bir xanın əlində lap naçar olam?
Mənim İran boyda səltənətim var,
Mənim əllərimdən xanmı qurtarar?
Yox, yox!.. Mən dözmərəm, dözmərəm buna,
Kiminsə əlimdən qurtulduğuna.
Eyb etməz, yenə də açılar sabah,
Sizin sinənizə dağ qoyaram, dağ!
Qız kimi qızarıb pörtənlələrə bax!
Doğrunun üstünü örtənlərə bax!
Görünür, günahı çoxdur bunların,
Sanki xəbərləri yoxdur bunların
Ağ-ağ yalanların işartısından,
Qacar gözlərinin qızartısından.

Sadiq xan gəlir

Sən baş sərkərdəmsən, Sadiq xan, mənim.
Niyə imkan verdin qaçsın düşmənim?
Bəs sənin sərkərdə qüdrətin hanı?
Tuta bilməmisən İbrahim xanı.
Əhli-əyalıyla: – deyirlər mənə –
Qaçaraq gedibdir Car-Balakənə.
Demişdim ki, ona göz ol, qulaq ol!
Daha deməmişdim: – Mal ol, ulaq ol!
Budur ki, sözümün canı, əsası
İndi kimdən alım mən bu qisası?
Hayfımı səndənmi alım deyirsən?
Yoxsa ki, müc olub qalım deyirsən?
Qoy hələ, qoy hələ açılsın sabah!
Nələr görəcəksən gözlərinlə, ax!
Hali olacaqsan onda nələrdən...
Minarə qurdurum mən kəllələrdən,
Gəzsin vicvicələr sənin canında,
Şəmkir minarəsi onun yanında
Oyuncaq olsun!
Vadilər, vahələr qan ilə dolsun!
Sən ki, bu işləri saldın dərinə,
Qoy axsın Qarqarda qan su yerinə.
Bir divan qurum ki, durub sabahdan
Xəbərdar olsunlar bu tacü taxtdan.
Olsam da dünyanın lap harasında,
İnsanlar Arazla Kür arasında
Aman diləyəcək qan qusa-qusa.
Görüb bu dəhşəti Həzrəti-Musa,
Allaha əl açıb deyəcək: – Ya Rəbb!
Fironun əfvinə özün ol səbəb.

Bir divan qurum ki, Teymurun belə
Sürmə sümükləri cünbüşə gələ.
Buxara, Səmərqənd titrəyə tir-tir.
Deyələr Teymur da Qacar deyildir.

Nəfəsini ağır-ağır alır...

Başlar kəsildikcə, axdıqca qanlar
Bağrıqan dağından qalxan amanlar
Göyləri saxlayan dirək olacaq.
Daşlar da yumşalıb kövrək olacaq.
Hüccac ibn Yusif qəbirdən qalxıb,
Sağına, soluna çevrilib baxıb
Deyəcək:-Afərin, Qacar, afərin!
Sən varsan, yox daha bir dərdim, sərim.
Off!.. Başım ağrıyır, lənətlər sizə!
Niyə edirsiniz zülümlər bizə?

Qacarın işarəsı ılə Sadiq xan, səfərəli bəy və Vəzir Mirzə Şəfi gedirlər... Qacar taxta söykənərək...

Bu xalqa şah olmaq necə çətindir!
Bu mənim öz yurdun, məmləkətindir.

Vəzir Mirzə Şəfi daxil olur...

VƏZİR MİRZƏ ŞƏFİ
Şahənşahi-İran, şah həzrətləri,
Sizi görmək üçün bayaqdan bəri
Durur Məhəmməd bəy Cavanşir orda,
Sanki qovururlar canını qorda.
Qardaşı oğludur İbrahim xanın,
Nədir məsləhəti hökmüfərmanın?

QACAR
Qoy gəlsin!

Məhəmməd bəy Batmanqılınc daxıl olur, baş əyir. Qacar ona qiqqətlə baxir, susur...

VƏZİR MİRZƏ ŞƏFİ
Şahənşah, Cavanşirdir bu.

QACAR
Bəli, düz deyirsən, pələng, şirdir bu!
Cəngavərdir bu!

Pənah xan nəvəsi əsil ərdir bu!
Bəri gəl, Qacarı yaxından tanı!
Babam Fətəli xan sənin atanı
Xan təyin etmişdi Qarabağ üzrə,
Həm Aran boyunca, həm də dağ üzrə.
Atan Mehrəli bəy onun oğultək
Hakimi-Qarabağ olaydı gərək.
Əmin İbrahim xan fitnə-fəsadla,
Min cürə hiyləylə, min cürə adla
Aldı xanlığını onun əlindən.
Xəcalət çəkmədi öz əməlindən.
Çünki çalışırdı buna səy ilə,
Ağası xan oğlu Əhməd bəy ilə
Bir olub, Şirvanda öldürtdü onu.
Bir olmur, min olur xainin donu.
Bunu bilirsənmi, Məhəmməd bəy, sən?

MƏHƏMMƏD BƏY
Şahənşah. Bunları bilmərəmmi mən?

QACAR
/onun sözünü kəsir/

Maşallah, bu saxa, bu boy-buxuna!
Yatsaydım, girməzdi, bəlkə, yuxuma.
Yoxdur bu cür sərbaz ordumda mənim,
Bunu görən kimi əsər düşmənim.
And olsun Ağamın ərvahına ki,
Müqəddəs ərlərin gürvahına ki,
Lütfəli bəy Zənd də kiçikdi bundan,
Bu daha böyükdür, yekədir ondan.
Amma ki, əmrimdən çıxdığı üçün
Onu tikə-tikə doğratdım o gün.
Oldu sağ tikəsi qulağı boyda.
Bundan danışdılar hüzndə, toyda.

MƏHƏMMƏD BƏY
Əlahəzrət, buna şahiddir Allah,
Əlimdən gələni etmişəm, vallah.
Şuşa qalasının təslimi üçün,
Üzü ağ durmuşam qarşında bu gün.

QACAR
Bilirəm, düşmənsən İbrahim xana,
Əminin əlindən gəlmisən cana.
Lap düz eləmisən, çünki bu ara

O, düşmən kəsilib müsəlmanlara.
Urusla-kafirlə xosunlaşaraq,
Qıcqırıb, fışqırıb, aşıb daşaraq
Mənlə kəllələşmək istəyirdi o.
Üstümə əsnəyib, çox gəyirdi o.
Yoxdur mənim aram əsla günahla,
Ancaq ki, vəziri Molla Pənahla

Eyni bir ağacdan asacam onu.
Belə olmalıdır xainin sonu.
Bəs necə bilmişdin, axı, sən məni?
Meydan səninkidir, indi mən səni
Hakimi-Qarabağ təyin edirəm.
Fikrini bilincə çıxıb gedirəm.
Sözün var?

MƏHƏMMƏD BƏY
Təşəkkür, böyük hökmdar!
Qat-qat artıq olsun iltifatınız,
Əzizdir, doğmadır bizə adınız.
Bir ayrı haldayam, bir ayrı cürəm...
Sizə yerdən göyə mütəşəkkürəm.

QACAR
Sabah danışarıq, mürəxxəs ol, get!

Əzan səsi eşidilir...

Namazın vaxtıdır, get, ibadət et!

Hamı gedir... Qacar taxtın arxasından canamazını götürüb yerə salır, namaz qılır...

Bismillahir rəhmanir rəhim Allah!
Düzəlmir dünya, vallah!
Asıram da, düzəlmir,
Kəsirəm də, düzəlmir.
Üstündə yarpaq kimi
Əsirəm də, düzəlmir.
Pisləri, nacinsləri
Pis günə qoydururam.
Yaman gözü yerindən

Çıxardıb oydururam.
Boyunlar vurdururam,
Dərilər soydururam,
Dünya yenə düzəlmir.
Gecəsi gündüzlərə
Dönə-dönə düzəlmir.
Düzəlmir dünya, vallah!
Hirsimdən ölürəm, bax!

Təxək gəlır, kənarda oturub namaz qılan Qacara baxır... Qacar namazını sona yetırir...

Təlxəyi görür...

Nədir, Təxək qardaşım!
Nədən ağarıb başın?
Çox mənalı baxırsan,
Ürəyimi yaxırsan...

TƏLXƏK
Ey şahənşah qardaşım,
Ağarmasınmı başım?
Dünyanın işlərini
Özünə dərd edirsən.
Sən məni pərt edirsən.
Bu boyda hirs-qıcıqla,
Kin-küdurət, acıqla
Yaşayırsan sən necə?
Elə hey cəng edirsən
Yerlə, göylə hər gecə.
Yazığın da gəlməyir
Heç özünə, qardaşım!
Ağarmasınmı başım?

QACAR
İrana. Turana da,
Dağa da, Arana da
Yazığım gəlir mənim.
Özgəyə, özümə də.
Könlümə, gözümə də,
Hökmümə, sözümə də
Yazığım gəlir mənim.
Neynim ki, xoşbəxtliyi
Bir olmaqda görürəm.
Bir olmağın naminə
Kafirin qarşısında
Ətdən divar hörürəm.
Neynim ki, görməyirlər
Bu tökülən qanları
Azərbaycan xanları.
Mənə özümdən özgə
Acıyan yox, yanan yox.
Deyirəm, eşidirəm,
Anlayan yox, qanan yox!
Saray dolu harınlar,..
Xaral kimi qarınlar
Sürünür torpaq üstə.
Mən isə titrəyirəm
Bir quru yarpaq üstə.

Torpaqlar əldən gedir.
Deyirlər: – Eldən gedir.
Görürsənmi, qardaşım.
Necə ağırdır daşım?
Qoy görsünlər, qabaqda
Qacar kimi qurd gedir.
Görməsinlər, yurd gedir.
Kafirə qul olmağa
Hazır olanları mən

Siləcəm Yer üzündən.
Mənim qan qardaşlarım
Üzümə dursalar da,
Kafirin təkidiylə
Azıb qudursalar da,
Peşiman olacaqlar.
Otlar kimi tapdanıb,
Saralıb solacaqlar.
Sən qəm yemə, qardaşım,
Ağırdır mənim daşım.
Mənə Qacar deyərlər.
Qacarın qabağından
Kafir qaçar deyərlər.
O ki, qaldı dediyin
Kin ilə küdurətə.
İnanma bu surətə.
Hirsim yuyuldu, qardaş!
Nifrətim gözümdə yaş...
Qorxma, heç kimin sabah
Burnu qanamayacaq.
Qorxmasaq, qorxutmasaq
İş görə bilmirik biz.
Qilinc müsəlmanıdır
Axı, bizim nəslimiz..
Sən bilirsən, qardaşım,
Nələr çəkibdir başım.
Səndən başqa dünyada
Dərddaşım yoxdur mənim.
Dərdim də çoxdur mənim,
Qəmim də çoxdur mənim.
Get, gecən xeyrə qalsın1
Mələklər də səninlə
Birgə yuxuya dalsın!

Gedirlər...

## ALTINCI ŞƏKİL

Məhəmməd bəyin evi...
Sadiq xan, Məhəmməd bəy və Səfərəli bəy...

SƏFƏRƏLİ BƏY
Ağalar, Qacardan halisiniz siz,
Onun qəzəbinə tuş gəlmişik biz.
Deyirəm cəsarət edib düzünü,
Görməkçün sabahkı günün üzünü.
Gəlmişəm, indidən ayıldım sizi,
Sabah dar ağacı gözləyir bizi.
Biganə qalmayaq taleyimizə,
Çıxılmaz tələlər qurulub bizə.

MƏHƏMMƏD BƏY
Görəsən bəs buna səbəb nədir, nə?

SADİQ BƏY
O hələ dünəndən mənim evimə,
Adam göndəribmiş axtarış ücün.

SƏFƏRƏLİ BƏY
Məktub ələ keçib elə həmən gün!

SADİQ BƏY
Daha bu işlərin axırı çatmış.

SƏFƏRƏLİ BƏY
Çoxdan tələdəsən, ay başı batmış!

MƏHƏMMƏD BƏY
Sizin sözünüzdən baş açmıram mən.
Kimin məktubudur, o məktub görən?

SƏFƏRƏLİ BƏY
Urus generalı Kotlyarovun!

MƏHƏMMƏD BƏY
O ki, sağ əlidir konsul Zubovun!

SADİQ BƏY
Onun yazdığıtək etməliyik biz,
Qacarın qətlinə getməliyik biz!

SƏFƏRƏLİ BƏY
/Məhəmməd bəyə/

Sız də and için ki, bizimləsiniz,
Dala durdu yoxdur, şərti kəsiniz!!!

MƏHƏMMƏD BƏY
Əqliniz hardadır, Səfərəli bəy,
Bu nə gic fikirdir, bu nə səfeh rəy?
O nə istəyirdi, ona da yetdi.
Məni Qarabağa xan təyin etdi.

SƏFƏRƏLİ BƏY
Sənimi? İnanma, ona inanma!
Xalata inanma, dona inanma!

SADİQ BƏY
İnanma, ay qohum şirin dillərə,
O xanlıq verərmi Cavanşirlərə?!
Qacar başdan başa qəzəbdir, kindir,
Onun qəzəbindən qaçmaq çətindir!

SƏFƏRƏLİ BƏY
Təkrar-təkrar dedi, vermədi ara,
Sabah qurduracaq iki minara.

Dedi ki, bizlərə kəsilib qənim.
Birində Sadiq bəy ilə mənim
Kəlləmiz olacaq.

MƏHƏMMƏD BƏY
O birində bəs?

SADİQ BƏY
Sənin, Məhəmməd bəy, çəhd etmə əbəs!
Atası qəbrinə and içibdir şah,
Sabah kim olacaq bizlərə pənah?
Şəksiz töküləcək qanımız bizim,

MƏHƏMMƏD BƏY
Axı, əlimizdən nə gəlir bizim?

SƏFƏRƏLİ BƏY
Bəy, bunlar işiniz deyildir sizin.

Hamımız birlikdı sağ qalaq deyə
Hazır olmalıyıq indi hər şeyə.
Bu gecə fürsətdir, münasib vaxtdır...
Xacə şah görsün ki, taxt necə taxtdır.

MƏHƏMMƏD BƏY
And olsun Allaha, Səfərəli bəy,
Doğrudur bu fikir. Doğrudur bu rəy.
Vaxt varkən düşünək özümüz haqda,
Kim bilir, nə vardır hələ qabaqda?

SƏFƏRƏLİ BƏY
Amma bir şərtim var, söz verin mənə,
Sonradan nə olsa, nə olsa da nə,
Nəbadə, nəbadə verib əllərə,
Gülünc etməyəsiz məni ellərə.

Bununçün gəlmişəm buraya elə,
Dilbir, əlbir olaq bu gündən belə.
And içib şərəfə, and içib şana,
Bir də kişi kimi söz verin mana.

Məhəmməd bəy, Sadiq xan bir-birlərinə baxırlar...

SADİQ BƏY
Bəli, söz veririk!

MƏHƏMMƏD BƏY
Söz veririk biz!

SƏFƏRƏLİ BƏY
Siz ki, verirsiniz söz, xudahafiz!
Bir gürcü, mazini, bir lor Qacarı
Gecə öldürəcək!

HƏR ÜÇÜ

Kömək ol, tanrı!

Gedirlər...

## YEDDİNCİ ŞƏKİL

-QACARİN QƏTLİ-

Gecədir... Qacarın Şuşada qaldığı saray... Qalanın qabağında keşikçi dayanmışdır. Bir nəfər üzündə qara maska, əlində xəncər peyda olur, keşikçiyə hücum edib onu öldürür və Qacarın yataq otağına daxil olur... Bir neçə andan sonra səhnə al-qırmızı rəngə boyanır... Qacar əlləri ilə boğazından tutaraq, boğazı, əlləri qan içində saraydan çıxır... Sağdan və soldan daha iki qara maskalı peyda olurlar... Üçüncü Qara maskalı saraydan, Qacarın ardınca çıxır...

QACAR
Namərdlər! Eviniz yıxılsın sizin!
Evini yıxdınız dövlətimizin!..

Üç maskalı hərəsı bir tərəfdən Qacara yaxınlaşırlar, onu xəncərlə vururlar...

Qacaq yerə yıxılır... Maskalar xəncərləri Qacarın meyidinin ətrafında yerə sancırlar və gedirlər...

Qacarın meyidi yerə sancılmış üç xəncərın arasında qalır... Təlxək qaçaraq gəlır... Bir müddət Qacara baxır, onun gözlərini qapayır...

TƏLXƏK
/fəryad çəkir/,

Ey şahənşah qardaşım
Ağarmasınmı başım?
Ağarmasınmı başim?

## SƏKKİZİNCİ ŞƏKİL

Şusada meydan... Məhəmməd bəy hündürlükdə...

MƏHƏMMƏD BƏY
Camaat, Allahın köməyi ilə
Qarabağ azaddır bu gündən belə!
Yurdumuz alındı düşmən əlindən,
Hər kəs pay alacaq öz əməlindən.
Qacar qətl etdirdi, gör, necə canlar!
Durdu gözlərinə tökdüyü qanlar.
Allah götürmədi zülmü, qəzanı...
Verdi öz əliylə ona cəzanı.
İndi başsız qalıb Qacar ordusu,

Qacarın ümidsiz, naçar ordusu
Hey qaçır, heyqaçır irana sarı.
Daha yumruq kimi bir olaq, barı!

Bir yerə cəm olsun dövlət-malımız,
Olsun öz yolumuz, öz amalımız...
Baxın, nələr etdi bizlərə İran...
Kəndlər tarımardır, şəhərlər viran...
Evllərdə çörək yox, qarınlar acdır,
Bu yerlər güclü bir ələ möhtacdır.
Quruyub analar döşlərində süd,
Bizlərə hökm edib kütün biri küt!
İnsan naləsindən göylər tutulur,
Namus unudulur, ar unudulur.
Düzünü deyim ki, olsa da hər kim,
İbrahimxəlil xan, mənim öz əmim
Qaçıb qarabağdan Car-Balakənə.
Yamanca yer edir bu işlr mənə.
Onun öz adı var, mənim öz adım...
Mən ki, Qarabağı başsız qoymadım.
Məni tanımayır Qarabağ bəyəm?
Pənah xan nəvəsi Məhəmməd bəyəm.
Hamı yaxşı bilir, mən elə mənəm.
Kim sizə düşmənsə, ona düşmənəm.
Bu vətən bizimdir. Bu torpaq – bizim!
Canımız, qanımız Qarabağ – bizim!
Bizim namusumuz, arımızdır o1
Bizim varlığımız, varımızdır o!
O bizim sevgimiz, heyrətimizdir!
Qəlbimiz, ruhumuz, qeyrətimizdir!
Onun sinəsində yara var, dağ var.
Gülləri sovrulan bir qara bağ var.
Onun dərdlərini ovutmaq üçün,
Ürək yanğısını soyutmaq üçün

Elə bu saatdan, elə bu gündən
Külli Qarabağın xanı mənəm, mən.
Babamın qoyduğu yolla gedirəm,
Mən xan olduğumu elan edirəm.
Kim ki, Qarabağı sevir ürəkdən,
Onu qardaş kimi sevəm gərək mən.
Unuda bilmərəm mən bu haləti,
Bərpa edəcəyəm haqq-ədaləti.
Dərsi veriləcək xainlərin də,
Yeri bilinəcək bidinlərin də.
Sizin qarşınızda and içirəm mən,
Xalq nicat tapacaq əməllərimdən.
Satqının böyüyü əmimdir mənim,
Çəkdikcə çəkəsi qəmimdir mənim.
Xalqı başsız qoyub qaçmaq olarmı?
Deyin, bu kələfi açmaq olarmı?
Onun cəzasını verəcək Allah,
Bir kiməzasızsə cəzasız qalmayır, vallah.
Amma əsil cani Molla Pənahdır.
Onu bağışlamaq böyük günahdır.
O, sadiq dostudur İbrahim xanın.
Mənə inanın!

(Əlindəki perqamenti başının üstünə qaldırır...)

Onsuz da o çoxdan yolunu azıb,
İndi də əmimə bir məktub yazıb.
Onu Qarabağa çağırır, baxın!
Dərindən düşünün, gəlin bir yaxın!
Onu təhrik edir qılınc çalmağa,
Qaynı Ümmə xandan qoşun almağa.
Hələ ruslardan daköməklik umur,
Di gəl ki, bizlərə gözünü yumur.
Vaqif sağ qalarsa, artar yamanlıq,

Olmaz Qarabağda əmin-amanlıq.
Bəsdir, bəsdir dözdük, dözdük bunlara!
Başı kəsilməsə onun bu ara,
Bir gün kəsiləcək başımız bizim.
Axı, az deyildir yaşımız bizim.
Oğlu Əli bəy də qoşulub ona,
Bu işi vax tında verməsək sona,
Gec olacaqdır.
Bizim zəhmətimiz heç olacaqdır.
O kimdir? Düşməndir, xaindir, bilin1
Onu qəlbinizdən bir yolluq silin!
Mən bir dərs verim ki, ona, oğluna,
Görüb eşidənlər mat qalsın buna.
Qoy hamı dərs alsın bərkdən, çətindən,
Xalqa xor baxanın aqibətindən.
Belə edəcəyəm mən, inşəallah!
Sizə söz verirəm burada, vallah!

## DOQQUZUNCU ŞƏKİL

-VAQİFİN QƏTLİ-

Səhnə dairəsinin üstündə iri kötük və iri cəllad baltası... Vaqif və Əli bəy zəncirdə...

VAQİF
**Günəş qürub edir... sönür kainat,**
**Əzəldən belədir vəfasız həyat...**
Günəşi göstərərək...
**O, mənim ömrümün timsalıdır, bax!**
**Sönən bir varlığın xəyalıdır, bax!**
**Mən də yaradıldım, mən də parladım,**
**Gözəllər dilindən düşmədi adım...**
**İndisə yelkənim toxundu daşa,**

**Bir insan ömrünü vurmadım başa.**
**Oğul! Alışıram, yanıram, aman,**
**Səni öldürürlər mənim ucumdan!**
**Qoy uçsun başıma qayalı dağlar!...**

ƏLİ BƏY
**Sənin günəş boyda bir vicdanın var,**
**Ata!**
**And olsun ki, bu kainata**
Xalq sənə sonradan ağlayacaqdır,
Daim xatirəni saxlayacaqdır.

VAQİF
**Ah, oğlum, of, mənim qəhrəman oğlum!**
**Bu qədər qəm yemə, qurbanın olum!**

ƏLİ BƏY
**Eh...ata, nə qoyub, nə axtarırsan,**
**Zülmün qabağında ağlarmı insan?**

VAQİF
**Mərhaba, mərhaba, qəhrəman oğlum!**
**Bir gəl öpüm səni, pəhləvan oğlum!**

**Oğlunu qucaqlayıb bərk-bərk öpür...**

**Gözümün işığı, canım, ciyərim,**
**Bu nəmli torpaqlar olsa da yerim,**
**Mənim də dərdim var, təki sən yaşa!**
Namərd vura bilməz ömrünü başa.
CƏLLAD
Kəlmeyi-şəhadət gətirin daha!
Çevrilsin diliniz lailəllaha!

VAQİF
**Nə qədər olsa da, qanın var, cəllad!**
**İnsanın canından şirindir övlad,**
**Məni qorxutmayır bu vaxtsız əcəl.**
**İnsaf et, qabaqca məni öldür gəl!**
**Gözlərim görməsin övlad qanını,**
**Uçurma könlümün xanimanını**...

Məhəmməd bəy gəlır...

MƏHƏMMƏD BƏY
**Şair, rənginizdə bir sarılıq var!**

VAQİF
**Qafil, gün batanda, rəngi saralar!**
Məhəmməd bəy gedir...

CƏLLAD
Bu fani aləmi artıq unudun,
İndi üzünüzü qibləyə tutun!

Cəllad Əli bəyi cəkib qətl yerinə aparır... Səhnə yavaş-yavaş qaranlıqlaşır... Çəllad baltasının səsi eşidılir... Vaqif fəryadla çığırır... Səhnəyə bir anlıq tam zülmət çökür... Sonra progektorun işığı altında təkçə Vaqif görünür...

VAQİF
/köynəyinin yaxasını çıraraq/

**Of... Sənin gözlərin kor olsun, cəllad!**
**Sənə demədimmi şirindir övlad!**
Dörd nəfər üzü maskalılar peyda olurlar və Vaqifi əhatə edirlər... Onların əllərində Vaqifin şeirləri, əlyazmaları vardır...

VAQİF
/nalə çəkir, hönkürə-hönkürə/

Mən cahan mülkündə, mütləq, doğru halət görmədim,
Hər nə gördüm, əyri gördüm, özgə babət görmədim.
Aşinalar ixtilatında sədaqət görmədim,
Biətü iqrarü imanü dəyanət görmədim,
Bivəfadan lacərəm təhsili-hacət görmədim.

BİRİNCİ MASKALI
/əlyazmadan oxuyur/

Xah sultan, xah dərvişü gəda bilittifaq,
Özlərin qılmış giriftari-qəmü dərdü fəraq,
Cifeyi-dünyayədir hər ehtiyacü iştiyaq,
Munca kim, etdim tamaşa, sözlərə asdım qulaq,
Kizbü böhtandan səvayı bir hekayət görmədim.

Əlyazmanı Vaqifin ağzına vurur... Vaqir digər maskanın ayaqlarına yıxılır...

İKİNCİ MASKALI
/əlyazmadan oxuyur/

Hər sədavü səs ki, dünyaya dolub əksər əqəl,
Cümlə məkrü alü fənnü fitnədir, cəngü cədəl,
Dirhəmü dinar üçündür hər şeyə yapışsa əl,
Müqtədilərdə itaət, müqtədalərdə əməl,
Bəndələrdə simü bəylərdə ədalət görmədim.

Əlyazmanı Vaqifin ağzına vurur... Vaqir digər maskanın ayaqlarına yıxılır...

ÜÇÜNCÜ MASKALI
/əlyazmadan oxuyur/
Xəlqi-aləm bir əcəb düstur tutmuş hər zaman,
Hansı qəmli könlü kim, sən edər olsan şadiman,
O sənə, əlbəttə ki, bədguluq eylər, bigüman,

Hər kəsə hər kəs ki, etsə yaxşılıq, olur yaman,
Bulmadım bir dost ki, ondan bir ədavət görmədim.

Əlyazmanı Vaqifin ağzına vurur... Vaqir digər maskanın ayaqlarına yıxılır...

DÖRDÜNCÜ MASKALI
/əlyazmadan oxuyur/

Alimü cahil, müridü mürşidü şagirdü pir,
Nəfsi-əmmarə əlində sərbəsər olmuş əsir,
Həqqi batil eyləmişlər, işlənir cürmi-kəbir,
Şeyxlər şəyyad, abidlər abusən qəmtərir,
Hiç kəsdə həqqə layiq bir ibadət görmədim.

VAQİF
Hər kişi hər şey ki, sevdi, onu behtər istədi,
Kimi təxti, kimi taci, kimi əfsər istədi.
Padşahlar dəmbədəm təsxiri-kişvər istədi,
Eşqə həm çox kimsə düşdü vəsli – dilbər istədi,
Heç birində aqibət, bir zövqü rahət görmədim.

Mən özüm çox kuzəkarı kimyagər eylədim,
Sikkələndirdim qübari-tirəni zər eylədim,
Qara daşı döndərib yaquti-əhmər eylədim,
Daneyi-xərmöhrəni dürrə bərabər eylədim,
Qədrü qiymət istəyib, qeyr əz xəsarət görmədim.

BİRİNCİ MASKALI
/əlyazmaları cıra-cıra/

Eyləyən viranə Cəmşidi-Cəmin eyvanını,
Yola salmış, bil ki, bəzmi-işrətin çəndanını,

Kim qalıbdır ki, onun qəm tökməyibdir qanını,
Dönə-dönə imtahan etdim fələk dövranını,
Onda mən bərəkslikdən özgə adət görmədim.

İKİNCİ MASKALI
/əlyazmaları cıra-cıra/
Gün kimi bir şəxsə gündə xeyr versən səd həzar,
Zərrəcə etməz ədayi-şükri-nemət aşikar,
Qalmayıbdır qeyrəti şərmü həya, namusü ar,
Dedilər ki, etibarü etiqad aləmdə var,
Ondan ötrü mən də çox gəzdim, nəhayət, görmədim.

ÜÇÜNCÜ MASKALI
/əlyazmaları cıra-cıra/
Müxtəsər kim, belə dünyadən gərək etmək həzər,
Ondan ötrü kim, deyildir öz yerində xeyrü şər.
Alilər xaki-məzəllətdə, dənilər mötəbər,
Sahibi-zərdə kərəm yoxdur, kərəm əhlində zər,
İşlənən işlərdə ehkamü ləyaqət görmədim.

DÖRDÜNCÜ MASKALI
/əlyazmaları cıra-cıra/
Dövlətü iqbalü malın axırın gördüm tamam,
Həşmətü cahü cəlalın axırın gördüm tamam,
Zülfü ruyü xəttü xalın axırın gördüm tamam,
Həmdəmi-sahibcəmalın axırın gördüm tamam,
Başədək bir hüsnü-surət, qəddü qamət görmədim.

Maskalar Vaqifin ətrafında dolanaraq çırdıqları əlyazmaları onun başı üzərinə atırlar ... Çırılmış şeirləri şairin başına səpələnir, səpələnir və birdən qar piltələrinə çevrilirlər... Bütün səhnə boyu piltə-piltə qar yağır...

VAQİF
Ya imam-əl-insü vəlcinnü şahənşahi-ümur,
Getdi din əldən, bu gündən böylə sən eylə zühur,
Qoyma kim, şeytani-məlun eyləyə imanə zur,
Şöleyi-hüsnünlə bəxş et tazədən dünyayə nur
Kim, şəriət məşəlində istiqamət görmədim.

Baş ağardı, ruzigarım oldu gün-gündən siyah,
Etmədim, səd heyf kim, bir mahi rüxsarə nigah,
Qədr bilməz həmdəm ilə eylədim ömrü təbah,
Vaqifə, ya rəbbəna, öz lütfünü eylə pənah,
Səndən özgə kimsədə lütfü inayət görmədim.

Cəllad Vaqifi edam yerinə aparır... Bütün səhnə boyu ilahi bir qar yağır... Səhnə dairəsi fırlanıb Vaqifi özü ilə aparır... Ayaqyalın, başıaçıq bir sərsəri insan görünür... Bu Təlxəkdir... Əllərini geniş açaraq, ilahi qar selində yuyunur Təlxək...

TƏLXƏK
Vaqifə, ya rəbbəna, öz lütfünü eylə pənah!
Səndən özgə kimsədə lütfü inayət görmədim!...
Səndən özgə kimsədə lütfü inayət görmədim!...

-SON-

***Qeydlər:***
***1. Qara şriftlərlə verilmiş mətnlər Səməd Vurğunun "Vaqif" pyesindən götürülmüşdür. Bax. Səməd Vurğun. Dram əsərləri və poemaları. Bakı, Azərnəşr, 1974.***
***2. Vidadinin sözləridir. Bax. Səməd Vurğun. Dram əsərləri və poemaları. Bakı, Azərnəşr, 1974. səh.86.***
***3. Vidadinin sözləridir. Bax. Səməd Vurğun. Dram əsərləri və poemaları. Bakı, Azərnəşr, 1974. səh.86.***
***4. Vidadinin sözləridir. Bax. Səməd Vurğun. Dram əsərləri və poemaları. Bakı, Azərnəşr, 1974. səh.87.***




*07 iyun 2016-cı il. Bakı, Azərbaycan Dövlət Musiqili Teatrı.*
*"Vaqif" belə alqışlandı.*
*Öndə: Rəsul İlməddinoğlu, Akəm Xaqan. Arxada:*
*Eldar Qurbanov, Abdulla Yusifli, Vaqif Aslan*




*26 mart 2016-cı il. "Vaqif" pyesinin premyerasından bir neçə gün sonra.*
*Soldan: Vaqif Aslan, rejissor Mərdan Feyzullayev,*
*jurnalist Murad Nəbibəyov və tamaşaçı Qüdrət Salamov.*
*Müvəffəqiyyət də insanı düşüncələrə dalmağa məcbur edir*

## Bu günün Vaqifi Şəkidən gəldi

Əminəm ki, iyunun 7-8-də Musiqili Teatrın səhnəsində Şəki teatrının S.Vurğunun "Vaqif" dramı əsasında hazırladığı tamaşanı seyr edənlər bu suala müsbət cavab verəcəklər: DƏYƏR!

...............Şəki teatrının Bakıda, Musiqili Dram Teatrının səhnəsində təqdim etdiyi tamaşa 1 saat 40 dəqiqə fasiləsiz oynanılır. Bir məqamı da vurğulamaq lazımdır ki, bu əsər təkcə baxmaq üçün deyil, həm də diqqətlə qulaq asmaq üçündür. Tamaşaya uğurlu əlavələr Səməd Vurğunun "Vaqif" dramında, o qədər də açıq duyulmayan, məharətlə gizlədilmiş mətləbləri bu günün prizmasından daha aydın qavramağa kömək edir.

Tamaşanın mətninə əlavə edilən nəsr hissələrini Mərdan Feyzullayev, nəzm parçalarını isə Vaqif Aslan yazıb. Maraqlıdır ki, Vaqif Aslanın nəzmi təkrarsız Səməd Vurğunun poeziyasını məna və kontekst baxımından tamamladığı üçün əsərə yamaq kimi görünmür.

## BİR MÜSAHİBƏ

### (İntiqam Yaşaroğlu ilə)

*"Ədəbiyyat və incəsənət portalı"nın "Ulduz" jurnalı ilə birgə layihəsi olan "Şənbə qonağı" söhbətləşməsində İntiqam Yaşaroğlunun Vaqif Aslanla müsahibəsi.*

**1-Salam Vaqif müəllim, 2021-ci il necə keçdi sizin üçün? 2022-ci ildən gözləntilər?**

Salam, əziz İntiqam. Sizinlə həmsöhbət olmaq, mənə görə, gəncliklə ahıllığın polemikası kimidir.

2021-ci il mənim üçün sevinc ili oldu: ona görə ki, hələ 2020-ci ilin 8 noyabrından etibarən erməni işğalı altında olan torpaqlarımızın əksər hissəsi azad edilmişdi.

2021-ci il mənim üçün qürur ili oldu: ona görə ki, İkinci Qarabağ müharibəsində əldə etdiyimiz qələbə havası ilə 2021-ci ilə keçdim.

29-31 avqust 2021-ci il tarixdə Respublika Prezidenti İlham Əliyevin və birinci vitse-prezident Mehriban xanım Əliyevanın iştirak etdiyi "Vaqif Poeziya Günləri" çərçivəsində Şuşada oldum. Oraya "Zəfər Yolu" ilə getdim.

"Anam, mən şəhid oldum", "Salam, Tanrıkut əsgər! Tanrıkut əsgər, salam", "Azıx mağarası" ("Ruhlarla söhbət" poemasından) kimi şeirlərim "Ədalət" ( №11 (5843) 30 yanvar 2021.Səh.14) qəzetində, Şuşada "Vaqif Poeziya Günləri"ndən təəssüratlarım isə "Gediş", "Ziyarətin qəbul olsun, Məhərrəm", "Şuşada əsən külək", "Əzizə xanım"! – Onlar kimlər idilər? – Ermənilər idilər" adlı şeirlərim nümunəsində "Ədəbiyyat qəzeti"ndə (Şənbə, №36 (5322), 11 sentyabr 2021-ci il. Səh.19), "Ədəbiyyat qəzeti"ndə çap edilən şeirlərim də daxil olmaq şərti ilə "Çağır, Fəxrəddin, çağır", "Şəkili İlham" şeirlərim "Şəki Bələdiyyəsi" qəzetində ((№ 09 (204). Sentyabr 2021. Səh.8-9) çap edilmişdir.

Sözügedən şeirlərim Bakı, "Nurlar" N/P Mərkəzində çox nəfis şəkildə nəşr edilən "Bütün yollar Şuşaya aparır" (Bax.Səh. 243-251) kitabına daxil edilmişdir. Xalq yazıçısı Elçin Əfəndiyevin "Ön söz"ü və Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin Şuşada M.P.Vaqifin türbəsi önündəki çıxışı ilə başlayan tarixi bir kitabda təmsil olunmaq qürurvericidir.

2021-ci ildə "Ədəbiyyat və zaman dilemması qarşısında" adlı kitabım ADPU Tədris-Metodiki Şurasının qərarı ilə dərs vəsaiti kimi nəşr edilmişdir.

2021-ci ildəki uğurlarımdan biri də budur ki, 1997-ci ildə işıq üzü görmüş "Ruhlarla söhbət" poemam özbək və Anadolu türkcəsində çap edilmişdir. Poemamın özbəkcəsini ünlü şair Gülzirə xanım Şaripova, Anadolu türkcəsini isə istedadlı şair Yusif Aslan həyata keçirmişdir. Türkdilli dövlətlərin siyasətinə dəstək fondu tərəfindən sifarişi və tərcüməsi reallaşdırılan bu hadisə məni sevindirir və qürurlandırır.

21yanvar 2022-ci ildə moderator.az İnformasiya Agentliyinin verdiyi xəbərə görə Təbrizdə "Xarı blbüllər" adlı şeirlər toplusu ərəb əlifbası ilə və 1000 tirajla çap olunmuşdur. Orada Güney və

Quzey Azərbaycanın 110-na yaxın şairinin Qarabağı vəsf edən şeirləri toplanmışdır. 604 səhifə həcmində olan bu topluda mənim şeirlərimə də yer verilmişdir.

2022-ci ildən gözləntilərimə gəlincə, onu deyə bilərəm ki, vətənimizlə bağlı qürurverici hadisələr baş versin və bizi daha da şərəfləndirsin.

**2-Vaqif müəllim, Şəkidən paytaxtın ədəbi mühiti necə görünür?**

Uzaqdan baxdıqca uca dağlar necə görünürsə, eləcə – parlaqlığı və qaranlıqları ilə.

Paytaxtda çox ünlü yazıçılar, şairlər, dramaturqlar, tənqidçilər, publisistlər və digərləri yaşayırlar. Paytaxt okean, onlar aysberqlər kimidirlər. Onlar ədəbi qaynarlıqlar içindədirlər. Əyalətdən baxanda paytaxt nəşriyyatlar, qəzet və jurnallar rəngarəngliyində bərq vuran ulduz kimi görünür: ədəbi ulduzları ilə səma təsiri bağışlayır. “Balıq dəryada böyüyər” məsəlinə “ və balina olar” sözlərini də əlavə etmək istərdim.

Bu halda paytaxt ədəbi mühiti cilvəli və cazibəli, iclaslarda, təqdimatlarda, “İmza günləri”ndə, yaxın və uzaq ölkələrə ezamiyyətlərdə və səyahətlərdə olmaq əyalətdə yaşayan ədibə bəxtəvərlik kimi görünür...

Amma bütün bunlarla bərabər “ədəbiyyatın ən qısqanc qadından da qısqanc olduğunu” nəzərə alsaq, onda paytaxtın ədəbi mühiti ədəbi qısqanclıqlar, ədəbi ehtizazlar və ehtiraslar səhnəsidir qənaətinə gəlmiş olarıq. Onda paytaxt ədəbi mühitinə yaxınlaşıb, özünü işə salmaq istəmirsən. Böhtandan və şərdən uzaq olmaq istəyi səni o mühitə yaxınlaşmağa qoymur.

Bu halda isə paytaxt ədəbi mühiti qorxunc və qəddar görünür.

**3-Haçansa düşünmüsünüzmü gərək Bakıda yaşayardım, daha qaynar ədəbi mühitdə yazıb yaradardım. Yoxsa elə Şəkidə yazıb-yaratmaq daha xoşdur Vaqif Aslana?**

*“Gərək Bakıda yaşayardım, daha qaynar ədəbi mühitdə yazıb yaradardım”* düşüncəsi ilə yaşadığım vaxtlarım da olmuşdur.

Kömürçü ailəsində doğulmağım, atamın qabarlı əllərinin halal qazancı ilə boya-başa çatmağım həmişə məni ana torpağa daha da yaxınlaşdırmışdır. Bir də ki:

Fərq etmir kim razı, kim narazıdır...
Necə var, elədir alın yazısı.
Ən incə yazıdan incə yazıdır...
Taleyin, iqbalın qalın yazısı.

Yarpaq yaşıldırsa, xəzəl sarıdır...
Yaşıllıq, sarılıq yarı-yarıdır.
Nə olsun toplayan, yığan arıdır...
Çiçəklə yazılıb balın yazısı.

Çaşanda günah yox, tale çaşdırır.
Təpədən qorxana dağlar aşdırır.
Qapqara olsa da, göz qamaşdırır
Al yanaq üstündə xalın yazısı.

Elə bilməyin ki, mən dərdə yadam...
Varmı bu dünyada dərdsiz bir adam?
Saniyə-saniyə yazılır, atam!
Əhvalın yazısı, halın yazısı.

Uyma, Cumayoğlu, məqama, yaşa!
Toxuma özünü qayaya, daşa!
Ayaqlara deyil, yazılıb başa
Papağın, örpəyin, şalın yazısı!

Ətə-qana dolduğum yerdə yazıb yaratmağı xöşbəxtlik sayıram. Axı, nəyim varsa, onu Yaradan mənə əmanət olaraq vermişdir.

**4-Şəkidə ədəbi mühit ürəyinizcədirmi? Çatışmayan, yaradıcı sferaya mənfi təsiri olan amillər varmı?**

Şəki qədim yerdir. Burada prototürkün anatomiyası və genetik yaddaş kodları qorunmaqdadır. Şəkilinin "gözünü yeyim" müra-

ciəti ilə "öz başını özün yeyəsən" ifadəsi arasında bir insan tipindən digər insan tipinə keçidin izləri, min illər boyunca formalaşan düşüncə və təfəkkür tərzimizin evolyasiyası vardır.

Bu günkü Şəki ədəbi mühitində paytaxt ədəbi mühitinin kiçildilmiş modelini görmək o qədər də çətin deyildir. Əlbəttə ki, Şəki ədəbi mühitində hamı Mirzə Fətəli, hamı Bəxtiyar Vahabzadə deyildir. Bu yaxın illərdə dünyasını dəyişənlərdən Şahid Məmmədkərimovun, Mayis Səlimin, Rəsul İlməddinoğlunun, hal – hazırda yaşamaqda olanlardan Musa Həşimovun, Qoca Xalidin, Akif Elşirin, Yusif Şükürlünün və başqalarının yaradıcılığı diqqəti cəlb edir.

Şəki ədəbi mühitində də usta bir plagiatlıq, üstünə təbəssüm qatı çəkilmiş paxıllıq və sair əlamətlər mövcuddur. Bu da zəmanənin bir çox səbəblərdən maddi istiqamətlərə meylli olmasından, bəzi qurumlara yarınmaq və barınmaq xislətindən irəli gəlir. Paytaxt mühiitində olduğu kimi əyalətlərdə də yaradıcı sferaya mənfi təsiri olan amillər vardır. Az qala, hamının bir-birini tanıdığı Şəkidə mənfi təsirə malik olan amillər üstünə gün düşən qar kimi tez-tələsik əriyib gedir.

**5-Ədəbiyyat aləmində dostlarınız çoxdurmu?**

"Dostum çoxdur" deməkdə çətinlik çəkirəm. Ona görə ki, dost çoxluğundan şikayət etmək günahdır. Bununla belə "Tanrım, məni dostlarımdan qoru, düşmənlərimlə özüm bacararam" məsəli də vardır. Dostların hamısı eyni olmur. Onların beş günlüyü də olur, on büş günlüyü də... Dostun ərköyünü isə lap qəribə olur.

Öydüm, yenə doymadılar dostlarım...
Söydüm, yenə doymadılar dostlarım.
Acığımdan kəndir aldım özümçün...
Qoymadılar, qoymadılar dostlarım.

Bəziləri çevrildilər, döndülər...
Yağı damıb qurtardıqca titrəyən
Çıraq kimi öləziyib söndülər.
Bəzi vaxtlar paltar kimi atılıb,

Bəzi vaxtlar geyildilər dostlarım.
Sürtüldülər, yeyildilər dostlarım.
Salam – kəlam yoxa çıxdı bir anda.
Sanki dostum deyildilər dostlarım.

Vaxtlı-vaxtsıx vaxtımı da aldılar.
Çəkib məni vaxtsızlığa saldılar.
Qarışqatək daraşdılar canıma...
Ac qurd kimi susadılar qanıma...

Doymadılar, doymadılar dostlarım.
Gedib aldım darağacı özümçün...
Deyəcəkdim axır ki, son sözümü.
Öz əlimlə asacaqdım özümü.

Qoymadılar, qoymadılar dostlarım.
Ölüm nəydi, axır mənə onu da
Qıymadılar, qıymadılar dostlarım.

Ədəbiyyat aləminə gəldikdə də ümumi mənzərə, demək olar ki, dəyişmir. Burada məzmun gözəlliyi özünü göstərir: polemika, mühakimə, bədii mübadilə, ifadə tərzi, yansaşma üstünlük təşkil edir.

Ədəbiyyat aləmindəki dostlarım sırasında Şöhlət Avşar, Tehran Əlişanoğlu, Ramiz Əskər, Azər Turan, Xəyal, Rza, Vaqif Qurbanov, Vaqif Yusifli, Barat Vüsal, Ramiz Qusarçaylı, Sərvaz Hüseynoğlu, Yusif Savalan, Zabil Pərviz, Əkbər Qoşalı, İntiqam Yaşar, Mahir Cavadlı,

Fəxrəddin Əsəd, İsmayıl İmanzadə, Ənvər Əhməd, İnqilab İsaq, Xəzangül, Gülnarə Məmmədli, Əjdər Ol, rəhmətlik Eldar Sibirel, Etibar Etibarlı, Qara Əhnədli və indicə adları dilimin ucunda olan neçələrinin xüsusi yeri vardır.

Cənubdan Şəhrək, Behnaz Xürrəm, Seyid Mahmud İbadi, Seyid Məhəmməd Çavuşian, Səttar Təbrizi, B’hruz Imani, ABŞ-dan Nasir Əlixani, Türkiyədən Yusif Aslan, Əhməd Qaytançı, Hasan Kallimci, Asim Yekələr, Şevki Dinçal, Özbəkistandan Gülzirə Şari-

pova, Moskvadan Cəfər Sadiq və başqaları mənim ədəbiyyat aləmindəki dostlarımdır.

**6-Həm də universitetdə müəllimsiniz, tələbələrdə ədəbiyyata maraq necədir?**

Tələbə işıqlı sabah deməkdir. Mən gələcək dahiləri onların simasında görürəm. Bəli, gənclik həmişə istedadlıdır. Tələbələrimə həsr etdiyim şeirimdə aşağıdakı notlar vardır:

Dörd dəfə dünyanın qışından çıxıb,
Dörd dəfə birlikdə yaz yaşamışıq.
Bizləri hər dəfə vaxtsızlıq sıxıb,
Hər dəfə yazları az yaşamışıq.

Dayandım xitabət kürsüsündə mən,
Məni dinlədiniz partalarda siz.
İndi bildinizmi nə üçün, nədən
Siz mənim döyünən ürəyimsiniz.

Sizə Bilqamısdan söz açanda mən,
Yaman yaşayırdım haqqı, düzlüyü.
Nur kimi yağırdı gözlərinizdən
Öləri olanın ölümsüzlüyü.

Ey Bamsı Beyrəklər, Salur Qazanlar!
O – Burla xatundur, bu – Banu Çicək.
Dastan söyləyənlər, yazı yazanlar
Söyləyiblər doğru, yazıblar gerçək.

Gördüm, baxışınız təzədir, tərdir,
Mən də yaddaşımın tozunu sildim.
Sandım ki, oğlanlar Füzulilərdir,
Qızlar da Şirindən şirindir, bildim.

Haçan söhbət açdım Yusif Vəzirdən,
Yaş olub yanaqda gilələndiniz.
Sanki qaldırdınız Cavidi yerdən,
Müşfiqlə birlikdə güllələndiniz.

Çox mətni oxuyub gözlərinizdən,
Sizə mühazirə söyləmişəm mən.

Sizin üzünüzdə yanan işıqlar,
Bu rənglər, naxışlar, bu yaraşıqlar
titrədib məni.
İçimdə oxunan dəli nəğməni
Şəhriyar diliylə demişəm sizə.
Bəxtiyar diliylə demişəm sizə.

Məmməd Araz deyib Arazlaşmışam,
Gəncləşib sizinlə tarazlaşmışam.

O qədər öymüşəm Dədə Qorqudu
Danışa-danışa Qanturalıdan.
Min dəfə demişəm yaşamaq budu!
Tutsan, sevgini tut, tutma xalıdan.

Gözümü yandırıb qəlbimin odu,
Misal gətirmişəm Aşıq Alıdan.
Demişəm boş şeydir əlli də, yüz də,
Yoxsa səadətin şöləsi üzdə.

Sizsiniz ən böyük dövlətim, varım,
Mənim əzizlərim, tələbələrim.
Siz mənim bugünkü fəxrim,vüqarım,
Siz mənim sabahkı qələbələrim.

Dörd dəfə dünyanın qışından çıxıb,
Dörd dəfə birlikdə yaz yaşamışıq.
Hər dəfə bizləri vaxtsızlıq sıxıb,
Hər dəfə yazları az yaşamışıq.

Əgər söhbət tələbələrdə ədəbiyyata maraqdan gedirsə, burada təkcə "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" fakültəsində təhsil alanlar deyil, digər ixtisaslara yiyələnmək istəyənlər də iştirak edirlər. Bunu müxtəlif ixtisaslardan gələn ədiblərimizin simasında daha da aydın görmək olar: N.Vəzirov, Ə.Haqverdiyev, Y.V.Çəmənzəminli, Məmməd Araz, Vaqif Cəbrayılzadə və başqaları...

**7-AYB-nin Şəki bölməsinin sədrisiniz, nə kimi işlər görürsünüz, nə kimi planlar var?**

AYB Şəki bölməsi müstəqillik illərinin bəhrəsidir. Onun fəaliyyət göstərə bilməsi üçün İ.Nakam adına Şəki şəhər Mərkəzi kitabxanasında yazarlara bir otaq verilmişdi. Təxminən on il bundan əvvəl Mərkəzi kitabxananın bərpa məsələsi ortaya çıxdı. Kitabxana bərpa edləndən sonra isə biz otaqsız qaldıq. Bunun üstündən illər keçsə də, baş verən hadisə bütün əlaqədar instansiyalara məlum olsa da, nəticə olmadı ki, olmadı....

AYB Şəki bölməsi ictimai əsaslarladır. Hər bir rayonda bölmə yaradılana qədər şimal-qərb bölgəsi üzrə fəaliyyətdə olmuşdur. Yaradıcı insanları ədəbi dərnək vasitəsi ilə birləşdirmişdir. 2006-cı ildə müstəqillik illərimizdə Şəki ədəbi mühitini əks etdirən "Söz, söz, söz" adlə ilk almanaxı çap etdirmişdir. Bir çox ədibin ilk kitabı bu dövrdə işıq üzü görmüşdür.

Gələcək planlardan danışarkən onu deyə bilərəm ki, pərakəndəliyi aradan qaldırmaq zəruridir. Gələcəyə ümidlə baxıram. Yerləşməyimiz və səmərəli fəaliyyət göstərməyimiz üçün paytaxtın bizə kömək əlini uzatması vacibdir.

**8-Ədəbi cameəni hansı ədəbi orqanlar vasitəsi ilə izləyirsiniz?**

Hansısa bir yerə yığışdıqda "Ədəbiyyat qəzeti"ndə, "Azərbaycan" jurnalında dərc edilən yazıların müzakirəsi bizi daha çox məşğul edir. "Ədalət" qəzetində gedən elmi,bədii və publisistik yazıları da bunlara əlavə edirəm. Yenicə işıq üzü görən bədii əsərlərə də baxışlar bir üstəlik. Eyni zamanda yerli müəlliflərin əsərlərinə də diqqət yetiririk.

Şəkidə "Şəki", "Şəki Bələdiyyəsi", "Şəki region", "Şəki təhsili" kimi qəzetlər çap edilir. Yerli yazarların yaradıcılığı "Şəki Bələdiyyəsi" və "Şəki region" qəzetlərində daha çox öz əksini tapır. Bu orqanlarda elmi-publisistik məqalələrə də geniş yer verilir.

**9-Paytaxt ədəbi qurumlarından, gözləntiləriniz, bölgəyə nə kimi dəstəyi vacib hesab edirsiniz?**

Paytaxt ədəbi qurumları bölgələrə, bir çox hallarda, dinləyici auditoriyası kimi baxır. Mən çox istərdim ki, paytaxt ədəbi qurumları bölgəni ən yeni nəşrlərlə təmin etsin. AYB-nin bölmələri arasındakı əlaqələrin gücləndirilməsi üçün ilk növbədə müstəqillik illərində yaranan bölmələrə diqqət yetirsin. Müstəqillik illərində yaranan bölmələrin ictimai əsaslarla fəaliyyəti maddi-texniki imkanların olmaması üzündən bölgənin ədbi inkişafı ilə uzlaşmır. Paytaxt ədəbi qurumları məhz bu məsələdə əlaqədar təşkilatlar qarşısında məsələ qaldırıb, həllinə dəstək verməlidir. Bu məsələ həll olunarsa, bölmələrarası əlaqələr daha da genişlənər.

**10-Gənclərdən yaradıcılığını izlediyiniz imzalar varmı?**

Hansı gəncin yaradıcılığında plagiatlıqdan uzaq, məddahlıqdan kənar elementlər varsa, onlara xüsusi rəğbətim vardır. Onu da deyim ki, əsərdə yüksək bədii səviyyə olduğu halda belə, ədəbi sürtüklük ikrah hissi doğurur. Şüarçılıq, hay-küyçülük əsəri gözdən salır. Məqsədli yazılan əsərlər də uzunömürlü olmur. Ədəbiyyat tarixində buna aid yüzlərlə nümunə göstərmək olar.

"Gənclərdən yaradıcılığını izlediyiniz imzalar varmı" sualına cavab olaraq hazırki mərhələdə bizim milli qeyrət, ədəbi vicdan daşıyıcıları olan onlarla gənc yazıçı və şairimiz vardır. Mən onları həvəslə və qürur hissi ilə oxuyuram. Yaxından tanıdığım, yaradıcılığına bələd olduğum gənclərdən elə sizin özünüzün, Vasif Zöhraboğlunun, Tural Adışirinin, Zaur İlhamoğlunun və başqalarının uğurları məni çox sevindirir.

**– Təşəkkür edirəm, söhbət üçün.**

**– Təşəkkürlər.**

*25 yanvar 2022-ci il*

# ÖMRÜN ŞƏKİLLƏŞƏN ANLARI



*Atam Cumay kişi və anam Cəmilə xanım*



*Bu – mən (təx.1955), bu da – Nəzakir dayım (Xalam oğludur, böyük olduğu üçün dayı demişik)*



*Bu – oğlum Şahin, bu da – mən. 1983-cü il*





*Şagird də oldum* *Tələbə də oldum*



*Müəllim də oldum. Soldan: riyaziyyat müəllimi İbrahim Paşayev, Vaqif Aslan, tarix müəllimləri Şahid Yunusov və Vəlyəddin Ağayev*



*Evləndim də*



*Məkkə nənəm nəticəsi Şahin ilə. 1982-ci il*



*Anam nəvəsi Şahin və Yeganə ilə*



*9 Fevral 2009 Soldan: İlk sırada Tuncər nənəsi Təranə xanımın, Nəsrin mənim qucağımda, sonrakı sırada gəlinim Zülfiyyə xanım və oğlum Şahin bəy*



*Nəvələrim Nəsrinin, Tuncərin və Aylinin çevrəsində. 2012-ci il*



*Bu – Arzudur*



*Bu – Aylindir*



*06 iyun 2022-ci il. Şahinin ad günü.*
*Hamımız bir süfrə arxasında*




*Şəki, Kiş kəndi. Hüquqşünas və yazıçı dostum Adil Əsgərov Füzuli müəllimlə birlikdə İmamverdi Əbilovun "Xatirələrin ay işığında" kitabını mənə təqdim edir.*





*Rəssam dostumuz Eynulla Kamilov (Sağdan birinci) Kiş kəndində*







*30 oktyabr 1997-ci il. Şəhriyar sarayı*




*17 may 2004-cü il. Azərbaycan Dövlət Musiqili Komeddiya Teatrı*







*17 iyun 2014-cü il. Azərbaycan Dövlət Dram Teatrı*

# AZƏRBAYCAN RESPUBLİKASI PREZİDENTİNİN TƏLTİFİ


AZƏRBAYCAN RESPUBLİKASI
YUBİLEY MEDALININ VƏSİQƏSİ
№ I-071
Azərbaycan Respublikası Prezidentinin
2019-cu il 27 may tarixli
1205 nömrəli Sərəncamı ilə

Aslanov
Vaqif
Cumay oğlu
"Azərbaycan Xalq Cümhuriyyətinin
100 illiyi (1918-2018)"
yubiley medalı
ilə təltif edilmişdir.
İLHAM ƏLİYEV
Azərbaycan Respublikasının Prezidenti



# AZƏRBAYCAN DÖVLƏT TƏRCÜMƏ MƏRKƏZİNİN TƏLTİFİ

*Qeyd: Mənim Jan Batist Şardənin "Səyahətnamə"sinin 1711-ci il Amsterdam nəşrindən (II və VI cildlər) etdiyim tərcümələr Azərbaycan tarixşünaslığında fransız dilindən edilən ilk orijinal tərcümə hesab edilir. Digər tərcümələrimi də nəzərə alaraq Azərbaycan Dövlət Tərcümə mərkəzi məni təltif etmişdir. Təltifimin təqdimatı sevimli Xalq yazıçımız Afaq Məsudqızı tərəfindən mənim xəstə vəziyyətimdə həyata keçirilmişdir*


AZƏRBAYCAN DÖVLƏT TƏCÜMƏ MƏRKƏZİ

Fəxri diplom

Vagif Aslan

(Soyadı, adı, atasının adı)

Tərcümə sənətinə verdiyi töhfələrə və xidmətlərinə görə təltif olunur.

«30» sentyabr 2020-ci il

İdarə Heyətinin sədri
A.Məsud



# AZƏRBAYCAN YAZIÇILAR BİRLYİNİNİ TƏLTİFİ





*AYB Mətbuat Xidmətinin katibi Xəyal Rza mənə Anarın imzası ilə AYB-nin Fəxri Fərmanını və "Müşfiq mükafatı"nı təqdim edir. 15 sentyabr 2020-ci il*



*B.Vahabzadənin ev-muzeyində. Ön sırada: Bakı 56 saylı tam orta məktəbin direktoru Hicran Qarabəyli (1957-2020), Vaqif Aslan, şeirsevər bir xanım, şair Musa Həşimov. Arxa sırada: şair Tural Adışirin, ev-muzeyin direktoru Elşən Zəkəriyyəbəyli, AYB Mətbuat Xidmətinin katibi Xəyal Rza və Elşad Məmmədli*



*11 iyun 2019-cu il. B.Vahabzadənin ev-muzeyi. "Şairlər günü" tədbirindən sonra. Ön sırada: Məhəmməd Nuri Parmaksız (Türkiyə elm və ədəbi əsər sahibləri birliyinin başqanı), Vaqif Aslan, Rafael Manafov (Şəki İH ərazi idarəetmə şöbəsinin rəhbəri) və Elşən Zəkəriyyəbəyli. Arxa sırada: Zaur İlhamoğlu (şair), Xəyal Rza (AYB Mikayıl Müşfiq Komissiyasının sədri, "Şairlər günü" layihəsinin rəhbəri, şair)*



*Tələbə dostum Əli Zeynalov ilə.*
*May, 1973-cü il*



*Kiş kənd orta məktəbində dərs deyərkən*



*Səməd Vurğunun "Vaqif" pyesinin motivləri əsasında qələmə alınmış "Vaqif" faciəsinin premyerasından sonra.*
*Şəkildə: Şəki Pedaqoji Kollecinin direktoru Rafiq Şükürov, ondan solda Rafiq müəllimin həyat yoldaşı Sevda Fərəliyeva, ondan da solda Pedaqoji Kollecin müəllimi Nəriman Səmədov. Rafiq Şükürovdan sağda faciənin müəllifi Vaqif Aslan, ondan da sağda tamaşanın rejissoru, Azərbayca Respublikasının əməkdar artisti Mərdan Feyzullayev*



*Soldan: Çingiz Ənvəroğlu, Xalq artisti Gülyanaq Məmmədova, bəstəkar Ruhəngiz Qasımova və mən*



*4 iyul 2020-ci il. Şəki, Kiş kəndi. Dostlar qonağımızdır. Soldan Rövşən müəllim, Abdulla Yusifli və mən*



*1 noyabr 2014-cü il. Şəki, yuxarı karvansaray.*
*Soldan: Vaqif Aslan, Murad Nəbibəyov, Rəis Rəsulzadə (M.Rəsulzadənin nəvəsi), Rəsul İlməddinoğlu, Qiya Paçxataşvili*



*2012-ci il.  Çingiz Nağıyev ilə Qəbələdə*



*Rövşən məllim, mən və İlham Əhmədiyyə oğlu. Oxud kəndinə gedən yol Ağqayanın üzərindən keçir. Solumuzda Şəkidən Kişə uzanan Dodu, arxada isə Kiş kəndinin bir hissəsi görünür*



*Şəki, may 2022-ci il. Soldan: "Şəki Bələdiyyəsi" qəzetinin baş redaktoru Murad Nəbibəyov, həkim-psixiatr və yazar Akif Elşir, sinif yoldaşım, arxitektor Etibar Nuru oğlu Məmmədov və mən*



*19 iyul 2015-ci il. Kiş kəndi.*
*Sağdan: Behnaz  Xürrəm Vaqif Aslanın və nəvəsi Nəsrinin qonağıdır*



*20 iyul 2015-ci il. Şəki Xan Sarayında.*
*Soldan: Rəsul İlməddinoğlu, Hüseyni Seyid Məhəmməd*
*və həyat yoldaşı şairə Benaz Xürrəm və mən*



*Bəstəkar-yazıçı Barat Əli oğlu Abdullayev.  Şəki, 2019-cu il*



*Rəssam dostum Vüqar Muradov ilə, Şəki, 2019-cu il*



*Təmraz Yaşar oğlu qonağımdır. O, mənə türkdilli dövlətlərin siyasətinə dəstək fondu (fondun prezidenti Nüsrət Musa oğlu Məmmədovdur) tərəfindən Bişkekdə çap edilən "Ruhlarla söhbət" kitabımın Anadolu və özbək ləhcəsindəki nüsxələrini gətirmişdir. O, qardaşı ilə gəlmişdi. Onlara kitab bağışladım*





*23 oktyabr 1997-ci il, Şəki 3 saylı tam orta məktəbində görüşdən sonra*



*24 aprel 2007-ci il. Oğuzda oxucularla görüş*
*Soldan: Nazim Hüseynli, Vaqif Aslan, Yusif Naxçıvanlı (Oğuz İcra Başçısının müavini), Gülnarə Əsgərzadə, Vaqif Kərimov, Şahid Məmmədkərimov*



*23 avqust 2004-cü il. Zaqatalada yazarlar arasında*
*Soldan: Bəxtiyar həkim, Abbas Əmbala, Vaqif Aslan,*
*Mustafa Camal, Həşim İsmayılov, İlham Səfərov*




*24 aprel 2010-cu il. Şəki Pedaqoji Kolleci. Soldan: Aparıcılar, kollecin direktoru Rafiq Şükürov, Millət vəkili Cavanşir Feyziyev, Vaqif Aslan, keçmiş millət vəkili Məcnun Şükürov, kollecin müəllimi, bəstəkar Rafiq Rəsulov xitabət kürsüsündə xatirələri ilə çıxış edir*




*08 iyun 2016-cı il.
Bakı,
Prof. Ədalət
Tahirzadə ilə*



*08 iyun 2016-cı il.
Bakı,
Filosof
Fərman İsmayılovla*



*30 aprel  2010-cu il. Təbəssümlərin işığında:*
*Soldan: Qardaşım Rasim Cumayoğlu, millət vəkili Cavanşir Feyziyev, mən və Akəm Xaqan*




*16 mart 2019-cu il. Balakənli yazarlar arasında*



*12 dekabr 2012-ci il. Şəki. M.F.Axundzadənin büstü önündə. Soldan: Axma Xəlilov, Səxavət Mustafayev (Axma onun qonağı kimi iştirak edir), Rəsul İlməddinoğlu, Yusif Hüseynov, Vaqif Aslan, Çingiz Nağıyev, Mübariz Məsimli, Rahim Lətifov*



*30 aprel 2010-cu il. Bakı, Atatürk Mərkəzində Soldan: Akademik Nizami Cəfərov, Vaqif Aslan, Məcnun Şükürov, Ülkər xanım Hüseynova*




*Türk şair Coşqun Qarabuludla görüş.*
*ADPU Şəki filialı. 11 oktyabr 2017-ci il*




*05 dekabr 2015-ci il. Şhaki Palace. Vaqif aslan – 65 tədbiri.*
*Soldan 1-ci sırada: Rafiq Rasulov, İkram Abdullayev,*
*Gülyanaq Məmmədova, Sevil İsmayılova, Zərinə Cavadova,*
*İlqar Fəhmi, Əjdər Ol*



*AYB katibi İlqar Fəhmi Vaqif Aslanı AYB adından təbrik edərkən, 05 dekabr 2015-ci il. Shaki Palace*



*30 aprel 2010-cu il. AzərTac. Bakı Atatürk Mərkəzində Vaqif Aslanın 4 cildlik seçilmiş əsərlərinin 2-ci cildinin təqdimatı olmuşdur. Soldan 1-ci sırada Qafar Əliyev, Vaqif Aslan, Məcnun Şükürov, Nüsrət Məmmədov (ayaq üstə). Soldan 2-ci sırada Gülzar Namazova ("Qoşa Ulduz" jurnalının təsisçisi vəbaş redaktoru), Cabbar müəllim (BDU), Çəkməçi Əli (Əli Davud oğlu Əhmədov), Akif Salamoğlu, Akəm Xaqan və s.*




*İyul 1999-cu il.Soldan: Bədrəddin Süleymanov, B.Vahabzadə, Teymur Abuzər (Xəlilov), Rəsul İlməddinoğlu, Vaqif Aslan.*



*B.Vahabzadə bu halında da qonağa qarşı diqqətli idi. Adanalı Ahmet Kaytançı böyük şairin əlini öpüb onu ziyarət etməyə gəlmişdi*



*16 avqust 2015-ci il. Şəki. B.Vahabzadənin anım günü.
Solda: Vaqif Aslan professor Qüdrət Əbdüssalamzadə ilə
söhbət edərkən*




*16 avqust 2021-ci il. Soldan:DR.Prof. Allahverdi Məmmədli,
Vaqif Aslan, vəkil İkram Abdullayev və həyat yoldaşı,
Allahverdi müəllimin həyat yoldaşı, İkram Abdullayevin qızları*




*18 sentyabr 2005-ci il. Şəki. Bəstəkar Şəfiqə Axundova (21.01.1924, Nuxa – 26.07.2013, Bakı) ilə görüş*



*Urmiya Universitetinin məscidi önündə, 8 may 2011-ci il*




*29 oktyabr 2011-ci il. "Su sonası" şadlıq evində.*
*Neyrocərrah Aydın və Çingiz Ənvəroğulları ilə*



*Mingəşevir, Şair Əbülfət Həsənoğlu ilə*




*10 fevral 2015-ci il. Şəki, Çələbi xan restoranının həyəti*



*Həyat yoldaşımla Qubustanda*



*5 may 1997-ci il. Oxud kəndi. Ata Əhmədiyyə və oğul Mikayıl Cəbrayılovların məzarları önündə. Ailənin ortancıl oğlu Cavanşir Cəbrayılovla birlikdə*



*Qaxda Zəyzidli dostlar arasında. Soldan: Rasim İslam, Qax Uludağ istirahət vı turizm mərkəzinin direktoru Zabit Əhmədov, Vaqif Aslan, iş adamı Fərhad Nurəddinov, yazıçı Rəsul İlməddinoğlu*



*Elxan Musayev, Yasin İlyasov, Elmar Rəsulov, mən və Mustafa Yunusov. Kiş məbədi, 1985-ci il*



*Soldan: Nəvə Aslan, baba Vaqif, nənə Təranə*
*05 iyul 2020-ci il. Kiş kəndi*



*05 may 2009-cu il. Şəki. Bəstəkarımız Ruhangiz Qasımova ilə*



*Eynallının zirvəsində. Təbrizdən axşamüstü düşən işıqlarda hər tərəf gün kimidir. Solumda Dr.Prof Rafiq Rəsulov, sağımda Seyid Məhəmməd Çavuşian*



*Kəndovanda. Soldan: Vaqif Aslan, Səmra Rasulova, Rafiq Rasulov*



*Dr.prof.Allahverdi Məmmədli Kiş məbədində*



*Avqust 2017-ci il. Lerikli dostlar qonağımızdır.*
*Görkəmli jurnalist və el ağsaqqalı Həmzə Vəliməmmədovun kürəkəni, qızı və nəvəsi*



*Urmiya Universitetinin məscidi önündə, 8 may 2011-ci il.
Soldan: Urmiyalı tələbə Fatimə Cəlilpur, Vaqif Aslan,
Asif Rüstəmli,Türkiyədən olan 2 nəfər, "Xalq" qəzetinin müxbiri,
Nüşabə Araslı, Leyli Əliyeva*



*Şəki, 09 mart  2019-cu il. Soldan: Murad Nəbibəyov. Vaqif Aslan,
Aqil Abbas, Cəlil Cavanşir, Vüsal Oğuz, Natiq Şirinzadə*



*29 avqust 2001-ci il, Şəki, Calğalı bulaq. Rəhman və Məmməd Şıxəliyevlər kimi rəssamlar arasında*



*05 iyun 2004-cü il, Gənc və böyük dostum Səxavət Mustafayevlə*



*23 fevral 2022-ci il. Aktrisa. bəstəkar, şair Elza Seyidcahan qonağımızdır*



*Tələbələrim*



*Şəki, 09  mart 2019-cu il. Aqil Abbasla*



*Seyid Çavuşiyan və Könü Xasıyeva ilə*



*07 iyun 2015-ci il. Molla Cumanın Aran Layısqıda qaldığı evin qarşısında*



*Dekabr 2016-cı il. AzTV-nin "Ovqat"ından sonra*



*ADPU Şəki filialı 20 sentyabr 2019-cu il. Seyran Səxavətlə (ortada ağ kostyumda) görüşdən sonra. Seyran Səxavətdən sağda el ağsaqqalı Hacı Huşəng və Vaqif Aslan tələbələr arasında*



*AzTV. "Körpü"verilişindən sonra. Məndən solda Sayman Aruz, Seyran Səxavət, Allahverdi Məmmədli, Mahir Qəribov*



*Soldan: Vasif Əfəndiyev, Vaqif Aslan, Taxıl Məhsulları Naziri Kamil Seyid oğlu Məmmədov, Həmid Mikayılov, Hicran Səfərova*



*23 avqust 2007-ci il. Zaqatala. İslam Universitetinin bağçasında. Dos. Həşim İsmayılovla*



*02 sentyabr 2017-ci il. S.Rəhmanın ev-muzeyində:*
*Fikrət Qocanın qız nəvəsi gənc Fikrət Qoca Vaqif Aslan,*
*Fikrət Qoca və xanımı Raya xanım*



*Avqust 2021-ci il. Ziyalı iş adamı Dursun müəllim və*
*Dr. Prof. Mahir Rəsulov ilə*




*05 iyul 2022-ci il. Soldan: Murad Nəbibəyov (“Şəki Bələdiyyəsi” qəzetinin baş redaktoru), Tərlan Məmmədov (Şəki 2 saylı musiqi məktəbinin direktoru), Ağa Ramazan (şair), Çingiz Ənvəroğlu, qardaşım Kamal*



*Bakı, 17 mart 2021-ci il. Soldan: Dr.Prof. Vaqif Qurbanov, mən, şair İntiqam Yaşar, həkim Mirəli İslamov*



*Müəllim kimi də təltif olunmağın öz ləzzəti var. ADPU-nun rektoru Dr. Prof. Cəfər Cəfərov məni Fəxri Fərmanla təltif edir*



*Mikayıl Həmidov (soldan arxa fonda – Şəkinin tanınmış iş adamı) Fikrət Şirinbəyli (əslən şəkili, ABŞ vətəndaşı), Əşrəf Məmmədov (Şəki şəhər İcra Hakimiyyəti başçısı), Süsən xanım Şirinbəyli (Fikrət bəyin bacısı, Türkiyənin NATO-da olan təmsilçisi-kabinet müdiri), Aydın Əziz (arxa fonda – qara eynəkli), Gülər xanım (Aydın Əzizin həyat yoldaşı), Gülüstan Maqsudi (Şəki şəhər İcra Hakimiyyəti başçısının hümanitar məsələlər üzrə müavini) və Vaqif Aslan*



*21 avqust 2007-ci il. Şəki. Hərbçi dostum Kərim (arxa sırada – qara köynəkdə) və Bəxtiyar həkimlə (ön sırada – ağ mavi damalı köynəkdə)*



*05 avqust 2015-ci il. Şəki. Soldan: Vasif Əfəndiyev, Vaqif Aslan, taxılçılıq və iqtisadiyyat naziri Kamil Seyidoviç Məmmədov, Həmid Əliheydər oğlu Mikayılov, Hicran xanım Cəfərova*



*05 may 2022-ci il. Şəki 17 № li məktəbin kollektivi və direktoru Gülnarə xanımla (soldan 5-ci) birlikdə*



*Şuşa, 30 avqust 2021-ci il. Vaqif poeziya günlərində. Vaqif Aslan, Asim Yadigar (AYB Naxçıvan bölməsinin sədri), Əbülfət Mədətoğlu ("Ədalət" qəzeti baş redaktorunun müavini), Qafar Cəfərli (Lənkəran bölməsinin sədri)*



*Şuşada Vaqif  günləri 30 avqust 2021-ci il.*
*Soldan: 1.“Azərbaycan” jurnalının məsul katibi Vüsal Nuru*
*2. Vaqif Aslan, 3.AMEA-nın müxbir üzvü Tehran Əlişanoğlu,*
*4. AR Milli Məclisinin üzvü Əziz Ələkbərli,*
*5. DGTYB-ninMəsləhət Şurasının sədri Əkbər Qoşalı*



*Akademik Nizami Cəfərovla*



*AMEA-nın müxbir üzvü Tehran Əlişanoğlu ilə*
*Şuşada Vaqif günləri 31 avqust 2021-ci il*



*Şuşada Vaqif günləri.*
*30 avqust 2021-ci il*



*Vaqif Əlixanovla Cıdır Düzündə*



*"Ovqat" televerilişinin haqq-halal yaradıcısı*
*və aparıcısı Səyyarə xanım Səyyafla*



*14 mart 2022-ci il. "Ovqat"dan sonra*




*08 oktyabr 2013-cü il. Şəki, Kiş kəndi.*
*Yazıçı Nəriman Əbdülrəhmanlı qonağımızdır*



*26 iyun 2022-ci il. Şəki. Mahir Qarayev, Etimad Başkeçid, Vaqif Aslan, Nəriman Əbdülrəhmanlı*





*Şuşa, 14 iyul 2022-ci il. II Vaqif poeziya günləri Cıdır düzü.*
*Qafar Cəfərov, mən və Xalq yazıçısı Anar.*
*Barat Vüsal, Qafar Cəfərov və mən*



*15 iyul 2022-ci il. Şuşa, Güllü bağda, yeni mehmanxananın önündə.*
*Soldan: Elxan Yurdoğlu (Naxçıvanlı ədəbiyyatşünas və şair),*
*Vaqif Aslan, Qafar Cəfərli (AYB Lənkəran bölməsinin sədri),*
*Asim Yadigar (AYB Naxçıvan bölməsinin sədri),*
*Kənan Hacı. İnqilab İsaq*




*14 iyul 2022-ci il.Vaqif Aslan, Ramiz Qusarçaylı, Ağacəfər Həsənli, Kənan Hacı, İnqilab İsaq, Vaqif Yusifli, Asim Yadigar*



*13 iyul 2022-ci il. Şuşa, Təbiət də, insanlar da şüşə kimidir*



*Şuşa, 14 iyul 2022-ci il. İki bacı bir qardaş.*
*Xalq artistləri – Gülyaz və Gülyanaq Məmmədova bacıları ilə Şuşada*



*Şuşa, 14 iyul 2022-ci il. Gülnarə Məmmədli, Xəzangül,*
*Qafar Cəfərli və mən*



*Şəki, 22 iyul, Şəki. Heydər Əliyev Mərkəzi. Sevindik Nəsiboğlunun "Möhtəşəm zəfərin nişanəsi" kitabının təqdimatından sonra. Soldan: Asif Rüstəmli, Dilbər Yaqubova, şəhid anası, İradə Yusifli, Kəmalə İsmayılova, Sevindik Nəsiboğlu, şəhid anası İlkinbar Səmədova (Qax, Zərnə kəndi), şəhid anası Laləzar Nuhuyeva (Zaqatala, Qımır kəndi), şəhid anası, Vaqif Aslan*



*Şəki, 21 avqust 2022-ci il. Etibar Nuruyevin "Bioqarden" bağında.
Soldan Etibar Nuruyev, yazıçı-hüquqşünas
Adil Əsgərov, Vaqif Aslan, Adil müəllimin kürəkəni Vüqar həkim,
Vüqar həkimin oğlu Sadiq bəy, Sadiq bəyin anası Kəmalə xanım*



*Şəki, 19 avqust 2022-ci il. Qələrsən-görərsən qalası yanında.
Akif həkim, Murad Nəbibəyov, Vaqif Aslan, Elşad "Ovçular",
Şahin "Ləziz", Arzu Abdulhəmidov*

# VAQİF ASLANIN KİTABLARI






























